***Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 5 dekabr 2007-ci il tarixli 13 №-li iclasının qərarı ilə nəşr olunur.***

**Tərtibçilər və ön sözün müəllifləri: Paşa KƏRİMOV,**
**filologiya elmləri namizədi**

**Məhəmmədəli HÜSEYNİ**

**Redaktoru: Məmməd ADİLOV,**
**filologiya elmləri doktoru**

**Kompüter icraçısı: Nəzakət ARİFQIZI**

**Kompüter dizaynı: Suad ƏHMƏDOV**

**XVII əsr Azərbaycan lirikası (Antologiya). Bakı: Nurlan, 2008, 340 s.**

*Antologiyaya XVII əsrdə yaşamış Azərbaycan şairlərinin ana dilində yazdıqları lirik şeirlər daxil edilmişdir. Sadiq bəy Əfşar, Müsahib Gəncəvi, Məczub, Vəhid Qəzvini, Tərzi Əfşar, Mövci Əhəri, Mirzə Saleh Təbrizi, Məlik bəy Avcı, Vaiz Qəzvini, Mürtəzaqulu sultan Şamlu, Təsir Təbrizi kimi şairlərin şeirləri oxuculara ilk dəfə təqdim edilir.*

## ÖN SÖZ

XVII əsrdə əsasən ənənəvi növ və janrlar çərçivəsində mövcud olan Azərbaycan ədəbiyyatına yeni təmayüllərin gəlməsi dönməz xaratker almışdı. Xalqların milli özünüdərkində mühüm rol oynayan bu dövrün ədəbiyyatı get-gedə daha artıq dərəcədə zamanın ümummilli əhəmiyyətli ictimai və etik problemlərinin başa düşülməsi üçün vasitəyə çevrilirdi. Orta əsr tipli ədəbiyyat hakim mövqedə dursa da, ədəbiyyatın ictimai əhəmiyyəti nəzərə çapracaq dərəcədə artmağa başlamışdı.

XVII əsrin əvvəllərində Səfəvilər dövləti iqtisadi və hərbi-siyasi cəhətdən möhkəmlənməkdə idi. Xüsusilə I Şah Abbasın hakimiyyəti illərində (1587-1629) bu proses daha intensiv gedirdi. Onun daxili və xarici siyasəti güclü mərkəzləşdirilmiş dövlətin yaradılması məqsədini güdürdü. I Şah Abbasın hakimiyyəti illərində Azərbaycan Səfəvilər dövləti İran dövlətinə çevrilməyə başlamışdı. XVII əsrin əvvəllərinə qədər Azərbaycan torpaqlarının Osmanlı imperitorluğunun tərkibində qalması və xeyli zəifləməsi nəticəsində ölkədə aparıcı siyasi-iqtisadi rol tədricən İranın daxili vilayətlərinə keçdi. «1587-ci ildə Qəzvində taxta çıxan Şah Abbasın əsas vəzifəsi xarici işğallara məruz qalan və daxildən

parçalanan dövləti məhv olmaqdan xilas etmək idi» (1,s.250). 1598-ci ildə Şah Abbas Səfəvi dövlətin paytaxtını Qəzvindən İsfahana köçürdü. İsfahanda azərbaycanlıların məskunlaşması üçün xüsusi olaraq Abbasabad adlı bir məhəllə inşa edilmişdi. «Lakin paytaxtın köçürülməsi faktı sübut edirdi ki, Səfəvi dövlətinin paytaxtı artıq Azərbaycan ərazisi deyildir və azərbaycanlılar Səfəvi dövlətinin paytaxtında mühacirdirlər» (1,s.252). Digər tərəfdən, I Şah Abbasın hərbi islahatları da ümumilikdə qızılbaş tayfalarının nüfuzunu və rolunu azaltdı. Lakin bütün bunlara baxmayaraq, Səfəvi dövlətinin əsasını qoymuş qızılbaş tayfalarının ana dili olan türk dili Təbrizdə və Qəzvində olduğu kimi, yeni paytaxt İsfahanda da sarayın və qoşunun işlək dili olaraq qalırdı.

Görkəmli Azərbaycan alimi Turxan Gəncəyi «İsfahandakı Səfəvi sarayında türk dilinin mövqeyi» adlı məqaləsində bir sıra Avropa səyyahlarının – Petra della Vallenin, Adam Olearinin, Şevalye Jan Şardənin, Sansonun, Rafael dü Manın, Engelbert Kempferin əsərlərini, Şah Səfinin (1629-1642) Avstriya-Macarıstan imperatoru II Ferdinanda və Şah Sultan Hüseynin (1696-1722) Saksoniya hersoqu və Polşa kralı Avqusta məktubunu nümunə gətirərək Azərbaycan türkcəsinin Səfəvi sarayında yüksək mövqeyə malik olduğunu sübut edir. T.Gəncəyi 1639-cu ilin noyabrından 1638-ci ilin fevralına qədər İranda yaşamış alman səfiri Adam Olearinin belə bir məlumatından sitat gətirir: «Türk dili İsfahanda o qədər əhəmiyyətə malikdir ki, orada çox nadir hallarda farsca bir söz eşidirsən» (2,s.24).

1684-cü ildə İsveç səfirinin başçılıq etdiyi bir heyətlə İrana gələn, həmin heyətin katibi və həkimi olan alman Engelbert Kempferin yazdıqları isə həmin dövrdə sarayda, yuxarı təbəqənin nümayəndələri arasında fars dilinin üstünlük təşkil etməsi barədə fikirləri tamamilə alt-üst edir: «Sarayda işlənən türk dili daha çox hakim sülalənin ana dilidir, nəinki sadə camaatın. Bu dil saray vasitəsilə əyan-əşrəf ailələrində elə

geniş yayılmışdır ki, indi imtiyazlı təbəqədən olan hər hansı şəxsin onu bilməməsi utanc gətirən bir haldır (2,s.24).

Azərbaycan türkcəsinin bu dövrdə artıq digər türk dillərindən fərqləndiyini göstərən T.Gəncəyi haqlı olaraq yazır: «Bayat elindən olan Füzuli öz dilini «türkcə» deyə təqdim etmiş və Osmanlı şairlərini «büləğayi-Rum», Teymuri dövrü şairlərini isə «füsəhayi-tatar» adlandırmışdır. Sadiqi ilk dəfə olaraq «mütəkəllimini-qızılbaş» ifadəsini bu ikisinə əlavə etmişdir. «Qızılbaşca» Səfəvi dövründəki türkcəni göstərmək üçün işlədilən bir istilah idi və bu sülalənin süqutundan sonra siyasi və məzhəbi çalara malik olduğundan aradan qalxdı» (2,s.25).

Səfəvi şahları şeir və ədəbiyyatın hamisi olmuşlar. Bu şahların və şahzadələrin bəzisi ikidilli şair olmuş, türkcə və fasrca şeiri eyni dərəcədə himayə etmişlər. «Şah Abbas bir tərəfdən Səfaiyə göstəriş verirdi ki, cığatay şairi Heydərin «Məxzən» kitabını farscaya çevirsin, digər tərəfdən də Sadiqi-Kitabdara tapşırırdı ki, Mövləvinin «Məsnəvi»sini türkcəyə tərcümə etsin» (2,s.25).

XVII əsrdə Azərbaycan ədəbiyyatı çox geniş bir coğrafiyada inkişaf edirdi. Bu dövrdə Şimali və Cənubi Azərbaycanda, İranın bir çox vilayətlərində, Şərqi Anadoluda, İraqda və Osmanlı imperatorluğunun digər bölgələrində, Hindistanda, Orta Asiyada və s. yerlərdə fəaliyyət göstərən Azərbaycan şairlərinin adlarını çəkmək olar. Onlar əsərlərini əsasən Azərbaycan türkcəsində (Məhəmməd Fuad Köprülüzadə, İsmayıl Hikmət və b. Tədqiqatçıların təbiri ilə desək, azəri türkcəsində) və farsca yazırdılar. Tədqiqatçıların göstərdiyi kimi, XVII əsrdə «Ərəb və fars ədəbiyyatları özlərinin «Beynəlxalq» xarakterini itirərək müvafiq milli vilayətlərin ədəbiyyatlarına çevrilirlər, türkdilli ədəbiyyatların isə xüsusi çəkisi artır» (3,s.384).

XVII əsrdə Füzulinin vətəni Bağdadda Azərbaycan dilində şeirlər yazan şairlər yaşamışlar. Görkəmli türk alimi İsmayıl Hikmət özünün

«Azərbaycan ədəbiyyatı tarixi» kitabında h.1020-ci ildə (1611-1612) vəfat etmiş Zehni Bağdadiyə (4,s.166-170) və onun müasiri olan, onunla təxminən eyni vaxtda vəfat etmiş Elmi təxəllüslü bağdadlı şairə (4,s.170-176) ayrıca məqalələr həsr etmişdir.

Mənbələr göstərir ki, nəzərdən keçirdiyimiz dövr şairlərin, alimlərin, sənətkarların xarici ölkələrə geniş miqyaslı mühacirəti ilə də əlamətdar olubdur. Ümumiyyətlə, XVII əsr Azərbaycan tarixində çox keşməkeşli bir dövr olmuşdur. Bu əsrdə baş verən arasıkəsilməz müharibələr (xüsusilə Osmanlı dövləti ilə) Azərbaycanın şəhər və kəndlərini dağıtmış, ölkənin iqtisadi inkişafını zəiflətmişdi. Belə bir vəziyyət mədəniyyət, ədəbiyyat sahəsində çalışan adamların həyatına təsir etməyə bilməzdi. Ölkədəki ictimai-siyasi gərginliyin bir səbəbi də Səfəvilərin hakim olduğu ərazidə şiəlik məzhəbindən bir ideologiya kimi istifadə edilməsi idi. I Şah İsmayılın ənənələrinə sadiq qalan I Şah Abbas sünniliyin tərəfdarı olan türklərin və özbəklərin əleyhinə şiəliyi himayə edir, İranın mərkəzləşdirilməsində şiəlikdən bir vasitə kimi istifadə edirdi (5,s.62).

XVII əsrdə Azərbaycanda yaranmış belə bir ictimai-siyasi vəziyyət dünyəvi yaradıcılığa üstünlük verən, mütərəqqi dünyagörüşlü sənətkarları qane edə bilməzdi. İctimai-ədəbi mühitdə yaranmış belə bir vəziyyətdə bir sıra Azərbaycan şairləri müxtəlif ölkələrə, ən çox da Hindistana gedirdilər. Bu kütləvi axının digər səbəbləri də vardı. Hindistandakı nisbi azadfikirlilik atmosferi ilə yanaşı, ölkəyə hakimlik edən böyük Moğol imperatoru Əkbər şah (1556-1605), onun xələfləri Cahangir (1605-1628) və Şahcahan (1628-1657) şeirə-sənətə hamilik edirdilər, şairlərə böyük ənamlar verirdilər.

Məhəmmədəli Tərbiyət «Danişməndani-Azərbaycan» əsərində XVII əsrdə yaşamış, Hindistana mühacirət etmiş şairlərdən Zamana, İbrahim Ordubadi, İsmayıl xan Təbrizi, Məhəmməd Hüseyn bəy Məlum, Məxmur, Mövlana Molla Əbdüləli Məhvi, Mübde Təbrizi, Rəhməti Təbrizi, Rəşid,

Saib Təbrizi, Sakit və başqaları haqqında maraqlı məlumatlar verir.

Bununla bərabər, qeyd etmək lazımdır ki, I Şah Abbasın hakimiyyətinin son dövrlərində Səfəvilər dövləti inkişafda idi. Onun həyata keçirdiyi tədbirlər nəticəsində ölkənin daxili həyatı, o cümlədən, beynəlxalq mövqeyi xeyli möhkəmlənmişdi. İqtisadi və mədəni həyatda çiçəklənmə müşahidə olunurdu. Ölkənin yeni paytaxtı İsfahan əsas ədəbi və mədəni mərkəzə çevrilirdi. I Şah Abbas öləndə (19 yanvar 1629-cu il) bütün Azərbaycan, Axalsıx daxil olmaqla Şərqi Gürcüstan və İraqi-Ərəb Səfəvilərin hakimiyyəti altında idi. «1639-cu il Səfəvi-Osmanlı sülhü XVIII əsrin ikinci rübünə kimi hər iki dövlət arasındakı münasibətləri nizama saldı, Azərbaycanda qismən sakitliyi bərqərar etdi, on illərlə boşalmış şəhərlərin bərpası, iqtisadiyyatın inkişafı üçün şərait yaratdı» (1, s.263). XVII əsrdə Təbriz, Ərdəbil, Şamaxı, Marağa, Gəncə, Ərəş, Xoy, Naxçıvan, Mərənd, Şəki, Urmiya Azərbaycanın iqtisadi və mədəni cəhətdən ən çox inkişaf etmiş şəhərləri idi.

Bütün bunlara baxmayaraq, XVII əsrin sonlarına yaxın Osmanlı imperatorluğu kimi, Səfəvi dövləti də ümumi böhran şəraitində idi. Bu dövr Azərbaycan, habelə bir sıra Yaxın və Orta Şərq ölkələri üçün durğunluqla səciyyəvi olmuşdur.

XVII əsrin Azəbaycan ədəbiyyatında (həmçinin Türkiyə ədəbiyyatında), xüsusilə də poeziyada folklora meylin güclənməsi, canlı xalq danışıq elementlərinin yazılı əsərlərə daha güclü nüfuz etməsi müşahidə olunur. Ümumiyyətlə, bu dövrdə bir sıra Qərb və Şərq xalqlarının şifahi ədəbiyyatları əhəmiyyətli dərəcədə inkişaf etməkdə idi. Tədqiqatçılar bu yüzillikdə Qərbdə və Şərqdə ədəbiyyatla folklor arasındakı qarşılıqlı əlaqə proseslərinin bir çox cəhətləri ilə oxşar olduğunu göstərmişlər (3,s.14).

XVII əsrdə Azərbaycan lirik poeziyasında Məsihi, Saib, Qövsi kimi klassik üslubda yazan şairlərlə bərabər Abbas Tufarqanlı, Sarı Aşıq kimi

qoşma, gəraylı, bayatı yazan aşıqlar da fəaliyyət göstərirdilər. «Koroğlu», «Əsli və Kərəm», «Aşıq Qərib», «Şah İsmayıl», «Abbas və Gülgəz», «Novruz» kimi dastanların da məhz bu dövrdə yaranması XVII əsrdə Azərbaycanda şifahi xalq ədəbiyyatının xüsusi bir vüsətlə inkişaf etdiyini sübut edir.

«Koroğlu» dastanı xalqın mübariz ruhunun ən yüksək təcəssümü, misilsiz igidlik və qəhrəmanlıq göstərən xalqın azadlıq hərəkatının, XVI əsrin sonu, XVII əsrin əvvəllərində alovlanan kəndli üsyanlarının bədii ifadəsi idi. Dastanlardakı qoşmalar əsasən mərdlik, cəsarət və mübarizədən bəhs edir, buradakı bədii ifadə vasitələri də qəhrəmanlıq, mərdlik və mübarizliyi nəzərə çarpdırır. Akademik Həmid Araslının göstərdiyi kimi, bununla bərabər, bu möhtəşəm abidə lirik şeir parçaları ilə də diqqətəlayiqdir: «...lakin dastanda elə qoşmalar da vardır ki, onlarda dərin vətən həsrəti, yoldaş məhəbbəti, bəzən də yalqızlıqdan şikayət motivləri hakimdir. Məhəbbət səhnələrində söylənən qoşmalar, sevgililər arasındakı umu-küsü, bəzən də ayrılıqdan, övladsızlıqdan şikayət edən qoşmalar öz məzmunu, incə ruhu ilə müharibə meydanlarında verilən qoşmalardan çox fərqlənir» (6,s.45).

«Aşıq Qərib» dastanı XVII əsrdə yaşamış Qərib təxəllüslü təbrizli şairin (aşığın) qoşmaları əsasında yaradılsa da, bu şeirlər ağızlarda dolaşdığından çox dəyişib, dastanın ümumi ahənginə uyğun bir şəkil almışdır.

Şifahi xalq ədəbiyyatı təsirində yaranan şeir məzmun və şəkli ilə qədim, orta əsrlər ədəbiyyatından köklü surətdə fərqlənirdi. Bu poeziyanın Azərbaycan xalq şeiri ilə səsləşməsi, ondan istifadə etməsi onun ən yaxşı cəhətlərindən idi. Bu şeirini vəzni heca vəzni idi. Bədii ifadələr canlı həyatdan alınır, təşbeh və istiarələr də bilavasitə həyat və məişətlə bağlı idi.

XVII əsrdə yetişən ən görkəmli aşıqlar Abbas Tufarqanlı və Sarı

Aşıq olmuşlar. Dövrünün mükəmməl təhsilini görmüş, klassik irsə yaxından bələd olmuş A.Tufarqanlı şifahi xalq ədəbiyyatının müxtəlif növlərini gözəl bilən bir sənətkar olmuşdur. XVII-XVIII əsrlərdən qalmış bir çox cünglərdə şairin aşıq şeiri üslubunda yazılmış qoşma, gəraylıları ilə birlikdə qəzəlləri, dini mövzuda yazılmış müxəmməsləri də saxlanılmışdır.

XVII əsrdə şifahi xalq şeiri təsirində əsər yazan sənətkarlar içərisində Sarı Aşıq özünün bayatıları ilə məşhurdur. Sarı Aşığın məhəbbət, həsrət, eşq yolunda fədakarlıq mövzusunda yazdığı bayatılar özünə xalqın yaddaşında möhkəm yer tutmuşdur.

Akademik H.Araslı «XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi» adlı əsərində şifahi xalq ədəbiyyatı formalarında yaradan el şairlərinə qəzəl və qəsidə müəllifləri ilə eyni səviyyədə sənətkar kimi yanaşmış, dəyərləndirərkən onlar arasında fərq qoymamışdır. Halbuki İ.Hikmət özünün 1928-ci ildə çapdan çıxmış «Azərbaycan ədəbiyyatı tarixi» kitabında el şairlərini ayrıca tədqiqata cəlb etməmişdir. Onun XX əsrin 20-30-cu illərində görkəmli ədəbiyyatşünas Salman Mümtazın fəaliyyətindən, alimin 1927, 1935-ci illərdə Sarı Aşığın kitabçalarını buraxmasından, yəqin ki, xəbəri olmalı idi.

M.F.Köprülü XVI-XVII əsrlərdə Azərbaycan və Türkiyə ədəbiyyatında özünə xalq məhəbbəti qazandırmış aşıq ədəbiyyatı, onun yaranma şəraiti barədə yazır ki, təriqətlərin çoxaldığı, təsəvvüfün xalq arasında daha geniş yayıldığı bir zamanda ozanlar təsəvvüf cərəyanına qoşulmağa başladılar. Xalqa Dədə Qorqud dastanlarından, digər oğuznamələrdən bəhs edən ozanlar öz yerlərini mütəsəvvif-şair mənasını ifadə edən aşıqlara verməyə başladılar (7,s.354). Aşıq ədəbiyyatı klassik ədəbiyyatdan, təkyə ədəbiyyatından, hətta xalq ədəbiyyatından tamamilə fərqlənir. Xalq ədəbiyyatının ənənələrindən güc alan, yüksək təbəqələrin də mənəvi ehtiyaclarını ödəyən bu ədəbiyyat

klassik və təkkə ədəbiyyatından da bəhrələnmişdir.

Filologiya elmləri doktoru, professor Məhərrəm Qasımlı aşıqlığın sənətkar statusunadək üç mərhələdən keçdiyini göstərir. Ona görə, üçüncü mərhələdə, XV-XVI əsrlərdə «aşiqlik» dini-ruhani vəzifə icraçılığından «musiqiçi-folklor sənətkarı» statusuna keçmişdir (8,s.286).

XVI əsrdən başlayaraq Azərbaycanda və Anadoluda geniş vüsət almış səfəvilik, qızılbaşlıq ideyalarını təbliğ edən poeziyadan danışa bilərik. Bu poeziya istər klassik, istərsə də şifahi ədəbiyyata məxsus formalardan istifadə etmişdir. Səfəvi təriqətinin ilk təbliğatçısı bu təriqətin banisi, Şah İsmayılın ulu babası Şeyx Səfiəddin Ərdəbili (1252-1334) olmuşdur. Lakin səfəvi ideyalarını təbliğ edən türkdilli qızılbaş şeiri məhz Xətaidən sonra formalaşır və özünün ardıcıllarını tapır.

Qızılbaş ədəbiyyatı (ifadəni ilk dəfə Fuad Köprülü işlətmişdir. Bax: 7,s.351), onun xüsusiyyətləri barədə danışarkən, əlbəttə ki, birinci növbədə bu ədəbiyyatın əsasını qoymuş Şah İsmayıl Xətainin yaradıcılığından danışmaq lazım gəlir. Səfəvilik ideyalarını, şiəliyi təbliğ edən, döyüşə gedən qızılbaş əsgərlərini «igid yektalar», düşməni Yəzid, Şümri-Mərvan adlandıran Xətai qızılbaş ədəbiyyatının klassik nümunələrini yaratmışdır. Şeirlərini geniş xalq kütlələrinə müraciətən yazan Şah İsmayıl sadə və aydın dildə, heca vəznində, xalq şeiri formalarında yazmağa xüsusi fikir verirdi. Şairin qızılbaşlığı təbliğ edən 11 hecalı şeirləri (bəktaşilərdə də olduğu kimi) nəfəs adlanırdı. Qızılbaş müridləri içərisindən çıxmış xalq şairləri, aşıqlar tərəfindən müxtəlif məclislərdə ifa olunan bu şeirlər təkcə Azərbaycanda deyil, Anadolu və İraqda da geniş yayılmışdı. Anadoluda yaşayıb qızılbaş ədəbiyyatını inkişaf etdirən şairlərdən Qul Himməti, Rümuzini, Vəli Babanı, xüsusilə də Pir Sultan Abdalı göstərmək olar.

Ş.İ.Xətaidən sonra qızılbaş şeiri ənənələrini davam etdirənlər içərisində istər klassik, istərsə də xalq şeiri formasında, hər iki formada

yazan sənətkarlar olmuşdur. Son zamanlar Xətai kimi sadə xalq dilində varsağılar yazan şairin nəvəsi İbrahim mirzə Cahinin (1540-1576) 27 şeiri aşkar edilmiş və onların surəti Tehranın Saray kitabxanasından AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutuna gətirilmişdir.

XVI əsrin ikinci yarısı – XVII əsrin əvvəlində yaşayan, Şah İsmayıl Xətainin ənənələrini davam etdirərək klassik şeir formaları ilə bərabər qoşma, gəraylı və bayatılar yaradan Məhəmməd Əmani əsərlərində qızılbaş olması ilə fəxr etdiyini bildirir:

Bu səadət, Əmaniya, bizə bəs,
Cəfəri məzhəbü qızılbaşuz (9,s.79).

Bir müddət Yəzd əmiri olmuş, sərkərdə kimi Azərbaycan torpaqlarının osmanlılardan azad edilməsi uğrunda döyüşlərdə iştirak etmiş şair I Şah Abbasın başçılığı ilə qazanılan qələbələri, Səfəvi xanədanını vəsf edən şeirlər yazmışdır. O, I Şah Abbasın h.1012-ci ildə (1603-1604) Təbrizin osmanlılardan geri alınmasına həsr etdiyi qəsidəsində yazır:

Çün Şah Səfinin çırağı yanmış əzəldən,
Rövşənlik ona ta dəmi-məşhər olacaqdır...
Təbriz fütuhatının əxbarı yetəndə,
İstanbulun əhli qanu müztər olacaqdır (9,s.239).

Bütün ömrü boyu bir əlində qılınc, bir əlində qələm tutaraq Səfəvi xanədanına, qızılbaşlıq ideyalarına sidq ürəklə xidmət edən şair, klassik və xalq şeiri formalarında yazdığı əsərlərində yorulmadan şiəliyi, qızılbaşlığı təbliğ etmişdir.

Əmani ədəbiyyat tariximizdə ilk dəfə olaraq ana dilində kiçik həcmli

mənzum hekayələr yaratmışdır. Şairin mövzusunu həyatdan, məişətdən götürdüyü mənzum hekayələri geniş oxucu kütləsinin başa düşəcəyi bir dildə yazılıbdır.

XVII əsr Azərbaycan lirik poeziyası Füzuli şeirinin qüvvətli təsiri altında inkişaf etmişdir. Füzuli sənəti dövrün görkəmli sənətkarları – Məsihi, Saib, Qövsi, Vəhid Qəzvini, Mürtəzaqulu xan Şamlu, Mirzə Saleh Təbrizi, Məlik bəy Avcı, Mürtəzaqulu Sultan Şamlu və bir çox başqaları üçün bədii sənətkarlıq məktəbi olmuşdur. XVII əsr Azərbaycan poeziyasında Füzuli ənənələrinin ən geniş yayıldığı, Füzuli ədəbi məktəbinin xeyli inkişaf etdiyi bir dövrdür.

Bu dövrdə Azərbaycan lirik poeziyasının inkişafına təsir göstərmiş böyük özbək şairi Əlişir Nəvainin (1441-1501) də adını çəkmək yerinə düşərdi. Nəvainin Azərbaycan şairi Qövsi yaradıcılığına təsiri barədə filologiya elmləri doktoru Cənnət Nağıyeva yazır: «Qövsi Təbrizinin əsərləri açıq-aydın göstərir ki, o, Nəvainin bir çox qəzəllərindən əsasən məzmun cəhətdən təsirlənmişdir. Onun «Qıldılar», «Kaş ki», «Qərəz», «Göz», «Bulunmaz imiş» rədifli və bir neçə başqa qəzəllərində bu təsir açıq-aşkar görünür. «Fəğan ki, bu dəhrdə bir aşina bulunmaz imiş», «Etdiyin cövrü mənə imdən qılaydın kaş ki» misraları Nəvai şeiri kimi səslənir. Qövsi hətta «Göz» rədifli qəzəlinin sonunda Nəvaidən aşağıdakı misranı verməklə bu təsiri özü təsdiqləyir:

Bu həman rəna qəzəldir ki, Nəvai söyləmiş:
«Sürməgün tünlərdə hicran şami tut bidar göz».

(10,s.90)

Nəvai Azərbaycan lirikasına xeyli dərəcədə Füzuli yaradıcılığı vasitəsi ilə təsir etmişdir. Məsələn, məlumdur ki, Füzuli «Görgəc» rədifli qəzəlini Nəvainin qəzəlinə cavab olaraq yazıbdır. Qövsinin həmin rədifli qəzəli isə artıq Füzuli qəzəlinə nəzirədir.

Yaradıcılığında Füzuli təsirinin müşahidə edildiyi XVII əsr

şairlərimizdən biri də Məsihidir. Tədqiqatçılar şairin əlimizdə olan yeganə anadilli əsəri – «Vərqa və Gülşa» poemasının Füzuli «Leyli və Məcnun»unun təsiri ilə yazıldığını göstərmişlər.

XVII əsr lirik poeziyamızın ən görkəmli nümayəndələrindən biri olan Əlican Qövsi Təbrizinin Füzuli poeziyasının bir məktəbə çevrilməsində rolu daha bariz qiymətləndirilməlidir. Belə ki, Qövsi əslində Füzuli məktəbini təsis etmiş və özündən sonra gələn Azərbaycan şairlərinə bir növ dədə Füzuli poeziyasından bəhrələnməyin sirlərini öyrətmişdir. H.Araslının dediyi kimi, «Qövsi irsi Füzuli ədəbi məktəbinin ən yaxşı davamı kimi ədəbiyyat tariximizə daxil olur» (6,s.169).

Füzuli qitələrindən birində fars dilində əruz vəzninin bütün tələblərinə, incəliklərinə uyğun gələn şeirlərin çox yazıldığını, türk dilində isə bu sahədə hələ çətinliklərin olduğunu yazır. Böyük şair burada ana dilində əruzun bütün tələblərinə cavab verə biləcək bir poeziya yaratmaq missiyasını öz üzərinə götürdüyünü elan edir:

Ol səbəbdən farsi ləfzilə çoxdur nəzm kim,
Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur.
Ləhceyi-türki qəbuli-nəzmi-tərkib etməyib,
Əksərən əlfazi namərbutü nahəmvar olur.
Məndə tovfiq olsa bu düşvarı asan eylərəm,
Novbahar olğac tikəndən bərgi-gül izhar olur.

(11,s.283)

Böyük ustadının ardınca Qövsi də türk dili qarşısındakı məsuliyyətini dərk edir, türkcə şeirləri ilə bütün dünyanı fəth edəcəyini bildirir:

Etmək üçün türk nəzmilə müsəxxər aləmi,
Tapdılar ərbabi-məni bilmənəm handan məni.

(12,s.365)

Faktiki olaraq bütün divanı boyunca biz Qövsinin böyük məmnuniyyətlə Füzuli kəlamından ilhamlandığını, onu özünə müdrik bir müəllim tutduğunu görürük. Füzuli təsiri ilə yazılmış qəzəllərinin əksəriyyətini Qövsi öz müəllimindən iqtibasla bitirir:

Bu haman rəna qəzəldir kim, Füzuli söyləmiş,
«Pənd çox verdim, eşitməz, arsızdır, arsız».

Yaxud:

Qövsi, bu ol qəzəli-nəğzi-Füzulidir kim,
«Necə ah eyləməyim, ah, yanıbdır cigərim».

Bu nümunələr bir daha Qövsinin öz ustadı Füzuli məktəbini, Füzuli dünyasını, Füzuli hissiyatını layiqincə davam etdirdiyini göstərir. Füzuli ilə bu ünsiyyət Əlican Qövsi Təbriziyə Füzuli sənətkarlağını davam etdirmək imtiyazı, Füzuli dilini və Füzuli qəzəlliyyatını sonrakı əsrlərə ötürmək səlahiyyəti vermişdir.

Tədqqatçılar göstərmişlər ki, Füzulinin Qövsiyə qüvvətli təsirini Qövsinin zəif, epiqonçu şair olması ilə izah etmək düzgün deyildir: «Şübhəsiz ki, Qövsi Füzulini təqlid etməmiş, əksinə, böyük şairin şeirlərindən klassik sənətin gözəl, mükəmməl nümunəsi kimi öyrənərək, öz yaradıcılıq simasını parlatmış, orijinal sənət inciləri yaratmışdır. Qösiyə görə Füzuli şeiri orta əsrlərin aynası idi, orada deyilməmiş söz qalmamışdır, hər iki sənətkarın şeirlərində müəyyən motivlərin səsləşməsi isə həyatla, ustad-şagird münasibətləri ilə izah oluna bilər» (13,s.336).

Ümumiyyələ, Qövsi qəzəllərindən bir çoxunun Füzuliyə nəzirə olduğunu qeyd edən müəlliflər eyni zamanda bir sıra məziyyətlərinə görə onların orijinal əsər olduğunu da göstərirlər.

Qövsi məhəbbət və gözəllik şairidir, onun lirikası sevgilisinə qarşı ən səmimi duyğularla doludur. Onun səmimiyyəti və saflığı bütün zamanlar üçün bütövlükdə Azərbaycan lirikasına xas olan ən səmimi hissləri özündə ehtiva edə bilmişdir. «Sevgilisinə yalvara bilmək qabiliyyəti» kimi bir xüsusiyyətin milli-ədəbi təfəkkürümüzdə həkk olunmasında Əlican Qövsi Təbrizinin də, şəksiz böyük rolu vardır. Qövsi sevgilisini vəsf etmir, ona mədhiyyə söyləmir. Qövsi şeiri ilə öz gözəlini sevir və öz gözəlinə sevə-sevə şeir yazır:

Məndə ey kaş ki, yüz can ola, qurbanın olum,
Hamı bir-bir sənə qurban ola, qurbanın olum.

Və ya:

Hanı ol bəxt rəsa kim, kakili-mişkin kimi,
Ya öpüm hərdən ayağın, ya dolanım başına.

Və ya:

Gər dersən, kimdir alan əldən inanın Qövsinin,
Sən, dolanım başına, sənsən, dolanım başına.

Qövsi bir şəxsiyyət kimi qüvvətli, humanist insanlara, dostluğa və mehribanlığa inanan şairdir:

Sorsan nədir muradın cami-cəhannümadan,
Mərdanə canfəşanlıq, məstanə mehribanlıq.

Qövsi poeziyasının əsas leytmotivlərindən biri ictimai-siyasi həyatla bağlı olub, vətənpərvərlik ideyalarını özündə ifadə etmişdir. Tədqiqatçılar göstərirlər ki, XVII əsrdə «vətənpərvərlik ideyaları... Qövsi Təbrizi sənətində formalaşdı, problemə çevrildi və bədii ifadəsini tapdı» (14,s.188).

Qövsi nə qədər vətəni və ana dili üçün həsrət çəksə də, birdəfəlik ölkənin paytaxtı İsfahanda məskən salıb yaşamalı olmuşdur. Lakin bütün ömrü boyu Təbriz ağrısı, vətən həsrəti onu tərk etməmişdir:

Təbriz cəzbəsi yaxamı tutmuş aparır,
Qövsi, əgərçi damənimi İsfahan tutur.

Tədricən bir əyalət şəhərinə çevrilməyə başlyan, müharibələr nəticəsində dəfələrlə tar-mar edilmiş Təbriz Azərbaycan xalqının hesabına zinətlənmiş, cənnətlə müqayisəyə girişən İsfahandan da üstündür, çünki Qövsinin könlü açılsa-açılsa, ancaq Təbrizdə açılar. İsfahan mühiti isə şairin qəlbini açmır:

Təbriz açar könlümü, Qövsi, gər açılsa,
Hərçənd ki, Firdovsi-Sifahanə yetişməz.

Ümumiyyətlə, Qövsi üçün Təbriz bütün şəhərlərdən daha önəmlidir. O belə hesab edir ki, ölkənin indiki paytaxtı İsfahan Kəbə deyib Təbrizin başına dolanmışdır:

Qövsi, gərəkdi Kəbə deyib iqtida qıla,
Təbriz qülləsinə Sifahan dedikləri.

Vətənpərvərlik motivləri XVII əsrdə yaşamış digər qüdrətli Azərbaycan şairi Saib Təbriziyə (1601-1677) də xasdır. Saib də bir sıra digər sənətkarlar kimi I Şah Abbasın əmri ilə vətəni Təbrizdən yeni paytaxt İsfahana köçürülmüşdü. Saib şeirlərində dəfələrlə Təbrizdən olduğunu və bununla fəxr etdiyini söyləmişdir:

Torpağındandırsa Sədi Şirazın,
Xaki-pakindəndir Saib Təbrizi.

və yaxud:

Gənc ikən, Saib, gözəl fikrin sənin,
Kişvəri-Təbrizi cənnətə qərq eylədi.

*(farscadan tərcümə)*

Saibin poeziya aləminə gəldiyi vaxtlarda farsdilli poeziyada poetik üslubun dəyişməsi prosesi gedirdi. Şeirlərinin əksəriyyətini farsca yazan şair yaradıcılığının ilk dövründən yenilikçiliyi ilə seçilməyə başladı. «Hind səbki» adlanan yeni üslubu XVI əsrin sonları – XVII əsrin əvvəllərində İrandan Hindistana köçmüş sənətkarlar yaratmışdılar. 6 il Hindistanda yaşamış Saib bu üslubun aparıcı nümayəndəsi idi, faktiki olaraq onun formalaşmasında əsas rol oynamışdı: «Bu üslubun yaradıcısı isə «Təbrizin pak torpağı»nda dünyaya göz açmış Azərbaycan şairi Saib Təbrizi idi» (15,s.106). Saib kalssik ədəbiyyatın potensial imkanlarını yenidən nəzərdən keçirmiş, ənənəvi obrazlara ona qədər məlum olmayan yeni baxımdan yanaşmışdır. O, ətraf mühitdə, real, maddi dünyada başqalarının görə bilmədiyi «qəribə gözəllik» axtarırdı: «Saib, doğrudan da, ətrafında baş verən hadisələrə, mövcud predmetlərə qəribə və qeyri-adi baxışı ilə fərqlənir, onlarda hamının gördüyü və qəbul

olunmuş mənaya əks olan məna görür. Ən adi şeylər belə şairdə müəyyən təəssürat oyadır. Hər hansı bir fikri, mahiyyəti ifadə edən işarəyə çevrilir. Sanki ətraf gerçəklik mənalar aləmidir. Hər şey nə isə ibrət verir, bizi nəyəsə çağırır və ya nədənsə çəkindirir: «Dişlərin tökülməsi oyun qurtararkən fiqurların yığılmasına bənzəyir, yəni həyat oyunu başa çatmaq üzrədir». «Saçların ağarması fələyin zülmündən uşaqlıqda əmilmiş südün üzə çıxmasıdır». «Torpaqdan yüksələn qəbir daşları bizi torpaq altına çağıran əllərdir» və s. (15,s.107).

Vəhdəti-vücud təliminin mürətəqqi ənənələrinə əsaslanan Saib «vosəte-məşrəbi» («geniş xarakterliyi»), dini, məzhəbi, etnik və sosial fərqlərə biganə olmağı təbliğ edirdi. Saib və «hind üslubu»nun digər nümayəndələri bütün müxtəlif konfliktlərin həlli yolu kimi humanist bir ideyanı – «solhe-koll»u («ümumi sülh») irəli sürürdü. Digər sənətkarların nümunəsində göstərəcəyik ki, heç də hamı bu ideyalarla həmfikir deyildi, dövrün ictimai həyatının digər sahələrində olduğu kimi, ədəbiyyatda da ideoloji mübarizə gedirdi. Bu mütərəqqi ideyanın əleyhdarları da var idi.

Şeirlərinin əksəriyyətini farsca yazan Saib Təbrizinin böyük bir ədəbi isi qalmışdır. Görkəmli Azərbaycan alimi Məhəmmədəli Tərbiyət «Danişməndani-Azərbaycan» əsərində Saibin 120 min beytlik divanını şəxsən gördüyünü qeyd edir. Sairin «Qəndəharnamə», «Mahmud və Ayaz» poemaları, 800 müəllifin əsərlərindən topladığı 25 min beytlik «Səfinə» adlı antologiyası da vardır.

Saibin Azərbaycan türkcəsində yazdığı qəzəllərində məna dərinliyi, ifadə gözəlliyi, dilin sadəliyi diqqəti cəlb edir. Tədqiqatçılar onun bu şeirlərində Azərbaycan xalq danışıq dilindən, Nəsimi və Füzuli kimi klassiklərin irsindən qidalandığını göstərmişlər. Saibin Füzuli qəzəllərinə yazdığı nəzirələr də məlumdur. Bu təsir barədə H.Araslı haqlı olaraq yazmışdır: «Saib Füzuliyə sadəcə bənzətmə yazmaqla kifayətlənmir, bəlkə bu qüvvətli ədəbi irsin yaşamağa layiq olan gözəl xüsusiyyətlərini

davam etdirir» (6,s.146)

Təxminən 1591-ci ildə dünyaya gəlmiş, «Zəfər» təxəllüsü ilə şeirlər yazan Mürtəzaqulu xan Şamlunun yaradıcılığında Füzuli və Nəvai ilə bərabər Şah İsmayıl Xətainin də yaradıcılığının təsiri aşkar görünür. Şairin müasiri Məhəmməd Tahir Nəsrabadi öz təzkirəsində məlumat verir ki, Mürtəzaqulu xan Şah Səfi zamanında (1629-1642) İrəvana yürüş vaxtı göstərdiyi cəsurluğa görə əvvəlcə eşikağasıbaşı, sonra divanbəyi vəzifəsinə təyin edilmiş, II Şah Abbas zamanında (1642-1666) qorçubaşı, Kerman vilayəti valisi vəzifəsinə yüksəlmişdi. Bir müddət vəzifəsindən azad edilmiş Zəfər sonra Şeyx Səfiəddin türbəsinə mütəvəlli (başçı, nəzarətçi) və Ərdəbil vəziri təyin edilir. Bu o dövr üçün çox böyük vəzifə idi, çünki Şah İsmayıl Xətainin, bütün Səfəvi hökmdarlarının ulu babası olan Şeyx Səfiəddin səfəviyyə təriqətinin banisi və əsas ideoloqu idi. Türkcə divanının dibaçəsində şair 1669-cu ildə, ahıl yaşlarında Azərbaycan türkcəsində divan tərtib etməsinin səbəbini izah edir: «...çün səfheyi-ruzigarda yadigar qalmaq üçün xatirə yetişdi ki, farsi əşarı qərib yüz bir beytə yetişmiş idi, bir neçə türki göftarı inşa oluna» (16,s.18).

Buradan belə bir nəticəyə gəlmək olar ki, yüz min beytə yaxın farsca şeiri olan (Nəsrabadi təzkirəsində onun farsca dörd min beyti olduğunu söyləyir) qocaman şair yaşının ixtiyar çağında vətən sevgisi, ana dilinə ehtiram nümayiş etdirərək türkcə divanını tərtib etmişdir.

Şeirlərindən Mütəzaqulu xanın şiəliyə, qızılbaşlığa, Şeyx Səfi dərgahına sadiq bir şəxs olduğunu görürük. O şeirlərində dəfələrlə Həzrəti-Əliyə böyük məhəbbətini izhar etmişdir:

Zəfər quldur ona candan, keçibdir xan ilə mandan,
Ayırma axır imandan Əli ibni-Əbi Talib.

Zəfərin qəzəllərində onun Şeyx Səfi dərgahına çox sadiq bir adam olduğunu görürük:

Ey Zəfər, istər isə dövləti-baqi tapmaq,
Şeyx Səfi dərgəhindən dərgəh tutma ariz.

Türkcə şeirlərində Mürtəzaqulu xan dövrün digər şairləri – Saib Təbrizi, Qövsi Təbrizi, Məlik bəy Ovci, Mirzə Saleh Təbrizi, Vəhid Qəzvini, Təsir Təbrizi və s. sənətkarlar kimi ən çox Füzulidən təsirlənmişdir. Zəfər şeirlərinin ahəngində, ifadələrində, sözlərində Füzuli təsirini görməmək mümkün deyil:

Ya Rəb, müdam inayətin et pişüva  mənə,
Zövqi-visalın eyləginən aşina mənə.
Könlüm evində səndən əgər qeyr var isə,
Qəhrində eyləgil sən o fikri bəla mənə.

Gecə-gündüz Füzulini mütaliə edən Zəfər elə bil ki, dünyaya ustadının gözləri ilə baxır və özündən asılı olmayaraq şeirlərinin çoxunu fizuliyanə yazır:

Can nəqdini fəda rəhi-cananə qılmışam,
Könlüm evini eşq ilə viranə qılmışam.
Məcnundan artı şöhrəti-eşqim bu xəlq ara,
Fərzanəyəm ki, özümi divanə qılmışam.

XVII əsr Azərbaycan poeziyasında yeni üslub, ifadə, deyim tərzlərinin yorulmaz axtarışları dövrü idi. Təxminən XVII əsrin əvvəllərində Urmiya yaxınlığındakı Tərzli adlı kənddə doğulmuş, Şah Səfi və II Şah Abbas dövrundə yaşamış Tərzi Əfşar XVII əsr lirikamızda orijinal üslubu ilə seçilən sənətkarlarımızdandır. Tərzinin şeirə gətirdiyi

yeniliklər mövzuya aid deyildi, sırf dil hadisəsi idi. Akademik Həmid Araslı bu barədə yazır: «O, şeirin məzmun məsələsini deyil, şəkli yeniliyi məsələsini irəli sürür və bu yeniliyi də ancaq fars sözlərinə Azərbaycan şəkilçiləri əlavə etmək yolu ilə, fars şəkilçilərini azərbaycansayağı işlətmək vasitəsilə, sözləri qəribə şəklə salmaqla yaratmaq istəyirdi. O bu tərzi yenilik adlandırır, heç kəsin belə şeirlər yazmadığını göstərir, özünü başqalarını təkrar etməyən bakir bir ədəbi məktəb başçısı hesab edirdi» (6,s.135).

Tədqiqatçı Məsiağa Məhəmmədi şairin adlardan belə fellər düzəltməsi, türk sözlərindən fars felləri yaratması barədə yazır: «Şair hətta yer adları üzərində də bu əməliyyatı aparır (Məsələn, «Təbrizidən», «Tehranidən», «Rəştidən», «Nəcəfidən» və s.). Maraqlıdır ki, eyni üsulla türk (Azərbaycan) özlərindən də fellər düzəldilir və geniş şəkildə istifadə olunur («kəsidən» - kəsmək, «minidən» - minmək, «içidən» - içmək, «qaçidən» - qaçmaq, «gəlidən» - gəlmək və s.» (15,s.116).

Tərzinin azərbaycanca şeirlərində də söz yaradıcılığını, adlardan feil düzəldilməsini müşahidə edirik. Şair II Şah Abbası Bağdadı osmanlılardan almağa təşviq etdiyi qəsidəsində yazır:

Pərvazlandı dil yenə bağdadlanmağa,
Ol bürçi-övliyayə qonub şadlanmağa.
Ol xaki-pak təki hanı bir sərzəmin dəxi,
Qəm paybəndini qırıb azadlanmağa...
Bağdadımız xərabdür, əmma ümid var,
Abbas əlilə əl verə abadlanmağa...

Tərzi ana dilində yazdığı şeirlərində əsasən eksperimentə yol verməmiş, mövcud poetik normalara əməl etmişdir:

Bir gül məni xarü zarü heyran etdi,
Könlümü həzin, didəmi giryan etdi.
Nərgisləri tək eylədi bimar məni,
Zülfü kimi halımı pərişan etdi.

XVII əsrdə yaşamış məşhur alim və şairlərdən olan Şərəfəddin Mirzə Məhəmməd Məczub Təbrizinin farsca bədii əsərləri öz zamanından etibarən elm aləminə məlum olmuşsa da, onun Azərbaycan türkcəsində bağladığı divan haqqında məşhur qaynaqların heç birində məlumat verilməmişdir. Son dövrlərdə bu şairin ana dilində yazdığı divanın Leyden universiteti kitabxanasından aşkar edilərək surətinin əldə edilməsini çox sevindirici və əlamətdar bir hadisə kimi qeyd etmək lazımdır.

Məczubun təvəllüd tarixi məlum deyildir. Onun divanının Britaniya muzeyində saxlanılan bir əlyazma nüsxəsinə əlavə olunmuş rübaidəki maddeyi-tarixdən məlum olur ki, şair 1682-ci ildə vəfat etmişdir.

Məczub bir dəfə 1652-ci ildə öz şeirlərindən on min beytdən çox toplayıb divan bağlamışdır. O, məşhur əsəri olan «Şahrahi-nicat» («Nicat yolu») məsnəvisini 1655-ci ildə qələmə almışdı. Bu əsər üç min beytdən ibarətdir. Məczub 1677-ci ildə yazıb bitirdiyi «Təyidat» («Təsdiq olunan fikirlər») adlı risaləsini Şah Süleyman Səfəviyə (1666-1694) ithaf edibdir. Tövhidə (Allahın birliyi), imaməti təsdiq edən hədislərə, həmçinin on iki imamın mədhinə həsr olunmuş bu əsər 314 bənddən, səkkiz min beytdən ibarətdir. Bunlardan əlavə şairin qəsidə, qəzəl, müxəmməs, tərcibənd, saqinamə və rübailərdən ibarət dörd min beytlik farsca divanı da vardır.

«Məczub» təsəvvüf terminidir. İran alimi Seyid Cəfər Səccadi «Estelahat və təbirate-erfani» kitabında (Tehran, 1379) bu sözü belə izah edir: «Məczub – cəzb olunmaq deməkdir. Sufi termini kimi o kəsə

deyilir ki, Allah onu özü üçün seçmiş və müqəddəs su ilə pak etmişdir. Bu cür şəxs əzab və zəhmətsiz yüksək mərtəbə və məqama çatar». XIX əsr şairlərindən kəbudərahəngli Hacı Məhəmməd Cəfər Qaragözlünün də təxəllüsü «Məczub» olmuşdur. Daha çox Məczubəli şah adı ilə məşhur ola bu sufi şair 1822-ci ildə Təbrizdə vəfat etmişdir. Məczub Təbrizinin farsca divanını İranda bir neçə dəfə Məczubəli Şah Qaragözlünün adına çap etmişlər.

Məczub Təbrizinin əlimizdə olan farsca və azərbaycanca divanları onun hər iki dildə mahir söz ustadı olduğunu sübut edir. Onun istər farsca, istərsə də ana dilində yazdığı qəzəlləri olduqca rəvan, emosional və təsirlidir. Şairin Təbrizə həsr etdiyi qəzəl onun öz doğma yurduna dərin sevgi və ehtiramını göstərir:

Bedeh saqi, şərabe-nabe-Təbriz,
Ke darəd feyze-digər abe-Təbriz.
(Saqi, Təbrizin saf şərabını ver,
Çünki Təbriz suyunun özgə təsiri var).

Məzcubun Təbrizin Sürxab məhəlləsi barədə türkcə yazdığı beytlərə gəldikdə isə, qeyd etməliyik ki, tarixi əhəmiyyət kəsb edən bu yerdəki qəbristanlıqda bir çox görkəmli alim və şairlərin məzarı yerləşir:

Qanlu başım yaş versə bir zaman seylabını,
Eylərəm rəşki-Bədəxşan Təbrizin Sürxabını.

Səndən öncə bax gör kimlər gedibdür, kim bilir,
Kimlərin qanı boyatmış Təbrizin Sürxabını.

Nəsrabadi üzərində h.1083-1090-cı illərdə (1672-1679) işlədiyi

məşhur təzkirəsində Saib Təbrizi kimi Məczubu da «vüsəte-məşrəbə» - «geniş xarakterə» malik bir şair kimi təqdim edir: «Təxəllüsü Məczub olan təbrizli Mirzə Məhəmməd yaxşı elm talibidir. Vüsəti-məşrəbdə mükəmməl və təsəvvüfdə zövqü sonsuzdur. Təbriz tələbələri hər gün onun dərs məclilərindən faydalanır» (17,s.275-276). Lakin təzkirə müəllifi bu fikrini heç bir faktla sübut etmir. Şairin azərbaycanca divanını nəzərdən keçirdikdə onun da Saib kimi dini, məzhəbi, etik, sosial fərqlərə biganə qaldığını, «geniş xarakterə» malik olduğunu görmürük. Saibdən fərqli olaraq, Məczub ifrat dərəcədə dinə, məzhəbə bağlıdır. Onun ən müxtəlif mövzularda yazdığı qəsidə və qəzəllərində belə dini təəssübkeşlik özünü qabarıq göstərir. Şairin ana dilindəki divanının təqribən üçdə birini şiə imamlarının mədhinə həsr olunmuş şeirlər təşkil edir. Nümunə gətirdiyimiz iki beytdə Məczub Saibin, «hind üslubu»nda yazan bir sıra digər müəlliflərin təbliğ etdikləri «solhe-koll» («ümumi sülh») ideyasına qarşı çıxır:

Sülhe-koll dəvası zindiqun əgər həqdür, neçün,
Hər kim inkar eylər, olur yerdənü başlar niza.

Sülhe-koll həqq olsa, işlətməzdi xəlqə zülfiqar,
Şiri-Yəzdan, şəhsuvari-din, şəhənşahi-şüca!

Məczubun təsəvvüfünə gəldikcə isə onun həmin dövrdəki hakim siyasi-dini ideologiya ilə səsləşdiyini qeyd etməliyik. XV əsrdən etibarən təsəvvüf məzmununu dəyişərək bir növ dini-siyasi cərəyana çevrilmişdi. Təsadufi deyil ki, Səfəvilərin hakimiyyəti illərində təsəvvüfün çoxəsrlik mütərəqqi ənənələrini davam etdirənlər təqiblərə məruz qalırdılar. M.Məhəmmədinin sözləri ilə desək, «Vosate-məşrəb» anlayışı ətrafında irəli sürülən ideyalar rəsmi ideologiyanı sarsıtdığı üçün onun tərəfdar-

larının təqib olunması da şübhəsizdir» (18,s.73). Bu fakt XVII əsr Azərbaycan poeziyasında mövcud olan ideoloji ziddiyyətlərin, ideoloji mübarizənin əyani sübutudur.

Dövrün görkəmli sənətkarlarından olan Mürtəzaqulu Sultan Şamlu Herat hakimi Həsən xanın oğludur. O tarixə həm də şikəstə xəttinin yaradıcısı kimi daxil olmuşdur. Əvvəlcə qorçubaşı, sonra Qumum hakimi vəzifələrinə təyin edilibdir. Saib Təbrizi ilə tanış olmuş, bir-birinin şeirlərinə nəzirələr yazmışlar. Şairin türkcə şeirləri Salman Mümtazın Əlyazmalar İnstitutunda saxlanan arxivindən götürülübdür. Bəzi tədiqatçılar onun h.1105-ci ildə (1693-1694) vəfat etdiyini göstərirlər.

XVII əsr Azərbaycan poeziyasının görkəmli nümayəndələrindən Mirzə Möhsün Təsir Təbrizi Şah Süleyman və Şah Sultan Hüseyn (1696-1722) Səfəvi dövrünün məşhur şəxsiyyətlərindən və dövlət adamlarından olmuşdur. Ulu babası I Şah Abbasın əmri ilə Təbrizdən İsfahana köçürülmüş, Təsir də 1655-ci ildə orada dünyaya gəlmişdir.

Mirzə Möhsün dövlətin maliyyə işləri sahəsində dürüstlüklə çalışmış, Yəzdin maliyyə vəziri vəzifəsinə təyin edilmişdir. Şairin ədəbi irsi barədə M.Tərbiyət «Danişməndani-Azərbaycan» əsərində yazır: «Təsirin külliyyatında bir çox qəsidə, qəzəl, qitə, rübai və yeddi məsnəvi vardır. Onun ən seçilmiş qəsidələri on dörd məsumun (Məhəmməd, Əli, Fatimə və 11 imam) tərifinə deyilmişdir. Qəzəlləri rəvan, maraqlı, ürəyəyatan, yeni məzmunlar və ifadələrlə doludur» (19, s.33) M.Tərbiyət Təsirin yeddi məsnəvisinin adını çəkir, onların mövzusu və vəzni barədə məlumat verir:

1. «Minhacül-merac» - əruzun mütəqarib bəhrində yazılmışdır və Məhəmməd peyğəmbərin merac gecəsinə aiddir.

2. «Meymənət» - «Xoşbəxtlik» - eyni bəhrdədir, gözəl xislətlər və xoş rəftar kəsb etmək məsələsinə həsr edilmişdir.

3. «Dəvətül-aşiqin» - «Xosrov və Şirin» bəhrindədir.

4. «Gülzari-səadət» - eyni bəhrdədir, İsfahanın Səadətabad binaları və bağlarının tərifinə yazılmışdır.

5. «Səmərətül-hicab» - «Yeddi gözəl» bəhrindədir.

6. «Cəhannüma» - «Sirlər xəzinəsi» bəhrindədir, İsfahanın Fərəhabad binaları və bağlarını tərifinə həsr edilib.

7. «Hüsni-ittifaq» - «Leyli və Məcnun» əsəri bəhrində yazılmış və Təft qəsəbəsi, onun suyu, havası, ağacları, meyvələri və gül-çiçəklərinin tərifinə həsr edilib (19, s.333-334). Prof. T.Gəncəyi şairin divanındakı türkcə qəzəllərdən başqa, türk dilindəki qəsidə, məsnəvi və digər şeirlərə əsaslanaraq bu qərara gəlir ki, Təsir adları çəkilən hökmdarların zamanında məliküş-şüəra vəzifəsini icra etmişdir (2,s.25).

XVII əsr Azərbaycan poeziyası əsasən orta əsrlər ədəbiyyatı xarakteri daşısa da, ondakı yeni meyllər, real tarixi hadisələrin təsviri, dilin sadələşməsi, canlı xalq danışıq dilinə yaxınlaşması aşkar nəzərə çarpır. Məsnəvi formasında yazılmış poemalar da dövrün ədəbiyyatında özünə yer almışdır. Belə əsərlərdən Sadiq bəy Əfşarın «Fəthnameyi-Abbas namdar», Fədainin «Bəxtiyarnamə», Məsihinin «Vərqa və Gülşa», Saib Təbrizinin «Qərdəharnamə» poemalarını, Əmaninin mənzum hekayələrini göstərmək olar. Türkcə iri janrlarda yazılmış əsərlərdə də Füzuli təsirini görməmək mümkün deyil.

Ədəbiyyatda keçid prosesi gedirdi. Bu proses özünü klassik poeziya ilə şifahi xalq ədəbiyyatının daha da yaxınlaşmasında, realizmə meylin artmasında təzahür etdirirdi. XVII əsr türkdilli Azərbaycan lirikasına dair son dövrlərdə əldə etdiyimiz yeni materiallar dövrün ədəbiyyatının şərh edilən xarakteristikasını bir daha təsdiq edir.

* * *

Tərtib etdiyimiz «XVII əsr Azərbaycan lirikası» antologiyasına yalnız türkdilli poeziya nümunələrimizi daxil etmişik. Toplu Fədainin

«Bəxtiyarnamə» poemasından parça ilə açılır. Akademik Həmid Araslı poemada cəlali hərəkatının xatırlandığını nəzərə alaraq əsəri XVII əsr ədəbiyyatımızın məhsulu saymışdır. Poemanın mövzusu bir sıra Yaxın Şərq xalqlarının ədəbiyyatında geniş yayılmışdı. Oxucunu səbrli olmağa, son peşimançılıqdan qurtarmaq üçün hər işi səbrlə görməyə çağıran bu əsərdə klassik poeziyanın, Füzulinin, xüsusilə də Xətai məsnəvilərinin təsiri özünü göstərir. Poemadan antologiyaya salınmış hissə tədqiqatçı Qulam Məmmədlinin nəşrindən (20) götürülübdür.

Görkəmli alim, şair, rəssam olan Sadiq bəy Əfşarın (1532-1612) külliyatına onun türkcə yazdığı üç əsəri daxil edilmişdir: «Məcməül-xəvas» təzkirəsi, divan və münşəat. Turxan Gəncəyinin göstərdiyi kimi, şeirləri, Sadiq bəyin cığataycanı, Azərbaycan və osmanlı türkcəsini çox gözəl bildiyini sübut edir. S.Əfşarın prof. T.Gəncəyi tərəfindən nəşrə hazırlnaraq 1971-ci ildə «Türkiyyat məcmuəsində» çap edilmiş şeirlərini (21, s.21-26) topluya daxil etdik.

Rəhməti Təbrizi XVI əsrin ikinci yarısı – XVII əsrin əvvəllərində yaşamış, 1616-cı ildə Hindistanın Akra şəhərində vəfat etmiş Azərbaycan şairidir. Şairin Azərbaycan türkcəsində şeirlərini filologiya elmləri namizədi Əkrəm Bağırovun «Rəhməti Təbrizi və onun divanı» kitabından (22) götürmüşük. Saib Təbrizinin əksər nəşrlərinə salınmış azərbaycanca 17 şeirinə şairin heç bir yerdə çap edilməmiş

Çıxdı ta mahtab seyraninə mişkin kəmənd,
Eyladi mahi-təmami halədin zünnarbənd-mətləli

qəzəlini əlavə etmişik. İstanbulun Nuri-Osmaniyyə kitabxanasında 3836-cı şifr altında saxlanan, 164 vərəqdən ibarət əlyazmanın 161a-164b vərəqlərində şairin bu şeir də daxil olmaqla türkcə qəzəlləri köçürülüb.

I Şah Abbasın türkcə şeirləri görkəmli ədəbiyyatşünas Salman Mümtazın arxivindən götürülmüşdür (s.v.423). II Şah Abbasın şeiri bizdən öncə Anarın tərtib etdiyi «Min beş yüz ilin oğuz şeiri» antologiyasının I kitabına salınmışdı (Bakı: Azərbaycan nəşriyyatı, 1999). Şeirlərindən nümunələr verilən «Zəfər» təxəllüslü Mürtəzaqulu xan Şamlunun türkcə əsərlərini görkəmli türk alimi İsmayıl Hikmət Ertaylanın 1965-ci ildə İstanbulda çap etdirdiyi fotofaksimile əsasında son zamanlarda nəşr etdirmişik (23).

Şeirləri antologiyaya daxil edilmiş İmadüddövlə Mirzə Məhəmməd Tahir Vəhid Qəzvini XVII əsrin görkəmli dövlət xadimi, şairi və tarixçisi olmuşdur. O, həmin əsrin əvvəlindən sonuna qədər yaşamış, beş Səfəvi şahının dövründə hökümət idarəsində çalışmış, mühasib və vaqeənəvis vəzifəsindən vəzirlik və sədri-əzəmliyə qədər yüksəlmişdir. Berlin Dövlət Kitabxanasının əlyazmalar xəzinəsində saxlanan abidələrimizdən biri də Vəhidin külliyyatıdır. 487 vərəqdən ibarət bu əlyazma divanının 30 vərəqini (1b-30a) şairin Azərbaycan türkcəsində şeirləri tutur. Həmin şeirlər 1842 beytdən ibarətdir. Ms.orient.fol.3314 şifri altında saxlanan divan 1707-ci ildə köçürülüb.

Tərzi Əfşarın II Şah Abbasa həsr etdiyi qəsidə, bir qitə və üç rübaisi şairin Azərbaycan alimi M.Təməddün tərəfindən tərtib edilib, Tehranda nəşr edilmiş divanından götürülüb (24).

XVII əsr Azərbaycan ədəbiyyatının klassiklərindən olan Uğurlu xan Müsahib Gəncəvi Səfəvi hökmdarlarından II Şah Abbas və Şah Süleymanın saraylarında yüksək mövqeyə malik olmuş, eşikağası, Qarabağın və Gəncəvinin bəylərbəyi vəzifələrini daşımışdır. Müsahib Gəncənin ədəbi irsindən bizə onun 6 min beytə yaxın farsca divanı məlumdur. AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu əsərin Məşhəd nüsxəsini 1995-ci ildə, Tiflis nüsxəsini 2001-ci ildə, Misrin Darül-Kutub kitabxanasında saxlanan nüsxəsini isə 2003-cü ildə əldə edib.

İnstitutun əməkdaşı Firəngiz Xəlilova şairin ədəbi irsinə həsr etdiyi elmi monoqrafiyanı tamamlamışdır. Müsahib Gəncəvinin farsca divanında rast gəlinən 4 azərbaycanca qəzəl də kitaba daxil edilib.

Haqqında danışdığımız Məczub Təbrizinin türkcə divanının Leyden kitabxanasında saxlanan nüsxəsini əldə etmişik. Hal-hazırda filologiya elmləri namizədi M.Məhəmmədi ilə birlikdə əsəri bütövlükdə nəşrə hazırlayırıq. Divandan bir sıra şeirlər topluya salınıbdır.

Son dövrlərə qədər Əlican Qövsi Təbrizinin türkcə divanının kiçik bir hissəsi H.Araslı tərəfindən çap edilərək geniş oxucu kütləsinə çatdırılmışdı. Son dövrlərdə şairin əsərlərinin Bakı, Tiflis, İstanbul, London, Təbriz və Məşhəd nüsxələri əsasında şairin divanı bütöv halda nəşr etdirilmişdir (25).

Son dövrlərdə Məşhədin Astane-Qüdse-Rəzəvi kitabxanasında Qövsinin farsca divanı da aşkar edilibdir (şifri: 5604). Q.Təbrizinin bu divan nüsxəsinin bəzi vərəqlərinin kənarlarında onun müasiri, şeyxlislam Mövci Əhərinin türkcə şeirlərinə rast gəldik ki, bunları da topluya daxil etdik.

XVII əsrdə yaşayıb-yaradan və Füzuli ədəbi məktəbini davam etdirən Mirzə Saleh Təbrizinin oxuculara təqdim etdiyimiz şeirləri İranın Məclis kitabxanasında saxlanılan əlyazmadan (şifri:1010) götürülmüşdür.

II Şah Abbas və Şah Süleymanın dövründə yaşayıb-yaradan Məlik bəy Avcının şeirlərini Berlin Dövlət Kitabxanasının əlyazmalar xəzinəsində saxlanılan «Gəncinə» məcmuəsindən götürmüşük. Ms.or.Fol. 209 şifri altında saxlanan, 1666-cı ildə köçürülmüş məcmuədə Nəvai, Xətai, Füzuli, Baqi kimi şairlərin əsərləri ilə bərabər, Məlik bəyin şeirlərinə də geniş yer verilmişdir. Şairin qəzəlləri «Divani-Məlik bəy» başlığı altında kitabın 245a-307a vərəqlərinə köçürülmüşdür. Məlik bəy Avcının şeirləri 1933-cü ildə İstanbulda görkəmli alim Əhməd Cəfəroğlu tərəfindən müasir Türkiyə əlifbası ilə çap edilibdir (26). Mərhum

Ə.Cəfəroğlunun əməyini təqdir etməklə bərabər, demək istərdik ki, burada yol verilmiş bir sıra səhvləri düzəltməyə, ümumiyyətlə, Məlik bəyin ədəbi irsini yenidən tədqiq və nəşr etməyə böyük ehtiyac var.

M.Avcının müasiri Mirzə Məhəmməd Rəfi Vaiz Qəzvininin Londonun Britaniya muzeyində mühafizə edilən divanının əlyazmasından şairin türkcə 9 qəzəlini prof. T.Gəncəyi 1971-ci ildə «Türk dili və ədəbiyyatı» dərgisində nəşr etdirmişdir. (27,s.186-192). Bundan başqa, V.Qəzvininin anadilli ədəbi irsinə dar daha 2 mənbə aşkar etmişik. Bunlardan biri Berlin Dövlət Kitabxanasında saxlanılır. Hər iki əlyazma 1680-cı ildə müxtəlif katiblər tərəfindən köçürülüb. 43 vərqdən ibarət olan Berlin nüsxəsi Vaiz Qəzvini əsərləri əsasında tərtib edilmiş müntəxəbatdır. Nəstəliq xətti ilə köçürülmüş bu nüsxənin 42a vərəqində şairin Azərbaycan türkcəsində 2 qəzəli, 4 rübaisi, 2 tərkibeyti vardır. Bunlar V.Qəzvininin artıq məlum olan 9 qəzəlindən fərqli şeirlərdir.

«Səfi» təxəllüsü ilə şeirlər yazan Azəbaycan şairi Səfiqulu bəy Şamlunun ana dilində şeirlərini oxuculara ilk dəfə Salman Mümtaz təqdim etmişdir. Şairin topluya daxil etdiyimiz şeirlərinin əksəriyyəti Tehranın Məlik və Universitet kitabxanalarından götürülərək Tehranda çıxan «Yeni yol» dərgisində (1982, №3) çap edilmişdir.

Təsir Təbrizinin ana dilində yazdığı şeirlərindən bir qismini ilk dəfə prof. T.Gəncəyi 1949-cı ildə Mədrəseyi-Ali-Sipəhsalar kitabxanasında saxlanan 283 nömrəli əlyazmadan götürərək elm aləminə təqdim edibdir (28, s.117-128).

XVII-XVIII əsrlərdə yaşamış Azərbaycan şairi Nəşə Təbrizinin türkcə şeirləri şairin divanının topqapı muzeyi kitabxanasında saxlanan nüsxəsindən (şifri:977) götürülübdür.

Ümidvarıq ki, bir sıra şairlərin şeirlərini ilk dəfə təqdim etdiyimiz bu antologiya oxucuların XVII əsr anadilli Azərbaycan lirikası barədə təsəvvüflərini genişləndirəcəkdir.

## Ə D Ə B İ Y Y A T


1. Azərbaycan tarixi, III cild. Bakı: Elm, 1999.

2. Gəncəyi Turxan. İsfahandakı səfəvi sarayında türk dilinin mövqeyi. «Bakı-Təbriz» jurnalı, №4,2006.

3. İstoriə vsemirnoy literaturı. T.IV.M: İzdatelğstvo «Nauka», 1987.

4. İsmayıl Hikmət. Azərbaycan ədəbiyyatı tarixi. II cild. Bakı, 1928.

5. İvanov M.S. Oçerk istorii İrana. M.,1952.

6. Araslı H. XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı: ADU nəşri, 1956.

7. Köprülü Fuad. Türk edebiyatında ilk mutasavvıflar. Ankara,1991.

8. Qasımlı Məhərrəm. Ozan-aşıq sənəti. Bakı: «Uğur» nəşriyyatı, 2007.

9. Əmani. Əsərləri. Bakı: Yazıçı, 1983.

10. Nağıyeva Cənnət. Azərbaycanda Nəvai. Bakı: «Tural-Ə» Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2001.

11. Məhəmməd Füzuli. Əsərləri. I cild. Bakı: Azərbaycan SSR EA nəşriyyatı, 1958.

12. Qövsi Təbrizi. Divan. Bakı: Nurlan, 2005.

13. Səfərli Ə., Yusifov X. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı. Bakı: ADU nəşri, 1982.

14. Cahani Qasım. Azərbaycan ədəbiyyatında Nizami ənənələri (XII-XVII). Bakı: «Elm» nəşriyyatı, 1979.

15. Məhəmmədi Məsiağa. Tədqiqlər və tərcümələr. Bakı: «Nafta-Press», 2004.

16. Mürtəzaqulu xan Şamlu. Divan. Bakı: Nurlan, 2006.

17. Təzkireye-Nəsrabadi. Moqəddeme və təshih. cild 1. Tehran: Əsatir, 1378.

18. Məhəmmədi Məsiağa. Saib Təbrizi və farsdilli poeziyada «hind üslubu». Bakı: Elm, 1994.
19. Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan. Bakı: Azərnəşr, 1987.
20. Fədai. Bəxtiyarnamə. Bakı: ADU nəşri, 1957.
21. Gandjei. T.Sadiki-i Afşarın türkçe şiirleri. Türkiyat mecmuası. c.XVI. İstanbul, 1971.
22. Bağırov Əkrəm. Rəhməti Təbrizi və onun divanı. Bakı: Nurlan, 2006.
23. Mürtəzaqulu xan Şamlu. Divan. Bakı: Nurlan, 2006.
24. Tərzi Əfşar. Divan. Tehran. 1338.
25. Qövsi Təbrizi. Divan. Bakı: Nurlan, 2005.
26. Caferoğlu A. XVII-inci asırda Azeri şairi Melik Bey Avcı. İstanbul: Bürhaneddin matbaası, 1933.
27. Gandjei T. Kazvinli Vaizin Türkçe şiirleri. Türk dili və edebiyatı dergisi, c.XIX, İstanbul, 1971.
28. Gencei Turhan. Tebrizli Tesirin Türkçe şiirleri. Türk dili ve edebiyatı dergisi, c.III, İstanbul, 1949.

## FƏDAİ

*Tədqiqatçıların dediyinə görə, XVI əsrin ikinci yarısı – XVII əsrin əvvəllərində yaşamış Fədai «Bəxtiyarnamə» poemasını 1588-ci ildən sonra yazmışdır. Yaxın Şərq ədəbiyyatında məşhur olan bu mövzuda ərəb, fars və türk dillərində əsərlər yazılmışdır. Əsəri ilk dəfə nəşr etdirən tədqiqatçı Qulam Məmmədli poemanın dilində Təbriz və Şirvan dialektlərinin əksini tapdığını qeyd edir. Akademik H.Araslı əsərdəki təsvir və ifadələrdə Xətai məsnəvilərinin təsirinin hiss edildiyini göstərmişdir.*

## BƏXTİYARIN SABİR SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey, bəxt yarın,
Münəzzeh eybidən namusü arın.
Eşitmişdim məgər bir dastani,
Oxurdu cəm içində qıssəxani.
Müəzzəm, mötəbər, məmurə bir kənd,
Var idi onda bir mərdi-xirədmənd.
Çox idi fikri, həm çox şükri, səbri,
Yox idi qeyri-taət, heç fikri.
Var idi bir bölük mali, davari.
Kim onunla keçərdi rüzgari.
Qulami-padşahi-əsri dövran,
Tələb eylər olardan mali-divan,
Əlinə almış ol hökmi-bərati,
Bəqayət döydü onda türkü, tati.
Hücum eylədi pəs onda rəiyyət,
Yetişdi ol igidə zəxmi zərbət.
Kişi ol yarələrdən öldü nagah,
Bu mənidən xəbərdar oldu çün şah.
Buyurdu etdilər ol kəndi qarət,
Yetişdi kəndə onda çox xəsarət.
Əlindən Sabirin həm getdi mali,
Dedi bir gün ona əhli-əyali:
 - Driğa nedəlim, mal oldu tarac,
Ki, qaldıq binəva, miskinü möhtac.
Sənin bu davada yoxdur günahın,
Ki qorxma, həqq-təaladır pənahın.

Yazıb bir ərzə get sən padşahə,
Həqiqət ərz qıl sən barigahə.
Sənin çün ona məlum ola halın
Ki, şayəd geri verə yenə malın.
Dedi Sabir ki, ey pakizə övrət!
Eşitmişəm, atam qılmış vəsiyyət.
Ki, ta kim, hər kəs uğrasa bəlayə,
Riza verməк gərək labüd qəzayə.
Ki, səbr ilə olur hər müşkül asan
Ki, təcil eyləməkdir feli-şeytan.
Edəlim biz dəxi səbrü təhəmmül,
Xuda raziqdir, ona qıl sən təvəkkül.
Tutalm yüzümüz qadir ilahə,
Kim ol versin xəbər ol padşahə.
Bizim dadımızı həqq ondan alsın.
Bizim tək dəxi o, biçarə qalsın.
Əlindən gedə yarəb, mülkü mali,
Gəda olsun, pərişan ola hali.
Olaydıq ol qədər dünyadə zində,
Onu görəydik biz belə gündə.
Gedəydi günümüzdən işbü qeyqu,
Eşitdi bu sözü bədxaş, bədgü.
Yetirdi bu sözü ol şəhriyarə .
Çü pünhan sözü qıldı aşikarə.
Ki, vardır bir kişi, adı Sabir nam,
Şaha çox söylədi nifrinü düşnam,
Buyurdu dərdəm, ol birəhmü qəddar
Ki, varsın bir neçə zalim, sitəmkar.
Qılıb çövru sitəm, yoxsul və möhtac,

Onu bu ölkədən qılsınlar ixrac.
Döyüb də sındırın əlin-ayağın,
Gətirsin belə həm oğul-uşağın.
Necə əmr eylədi ol bisəadət,
Fəqirə qıldılar zülmü siyasət.
Onun çün tirə oldu rüzgari,
O yerdə qalmadı səbrü qərari.
Gecə oldu onun çün ruzi rövşən,
Qovub çıxardılar ol məmləkətdən.
Ürəyi dopdolu qan, bağrı parə,
Çıxıban getdilər özgə diyarə.
Biləsincə iki oğlu, bir övrət,
Gedərlərdi çəkib rəncü məşəqqət.
Ayaq yalın, başı açıq, piyadə,
Dəxi möhnət nədir bundan ziyadə?
Bu hal ilə gedərkən ol diləfkar,
Kim uğradı ona bir neçə xunxar.
Olar ilə bilər yox mali dünya,
Kim oğrular edə talanü yəğma.
Təməh elədilər oğlanlarına,
Yetişdilər onların yanlarına.
İki tifli onlardan aldı onlar,
Yanıb həsrət oduna qaldı onlar,
Gedər onlar, bular qıldı nəzarə,
Ciyər firqətdən oldu parə-parə.
Ana başın açıb eylərdi şivən,
-Nedim, qanda varım, nə eyləyim mən?
Saçın yoldu, üzünə saldı dırnaq,
Başına sovururdu daş və torpaq.

Dedi Sabir: – Qəbul eylə nəsihət!
Həqqin təqdirinə səbr eylə, övrət!
Eşitdim ta necə səbr etdi Eyyub,
Ki, tapdı Yusifi səbriylə Yəqub.
Həqqə şükr eylə, dəxi olma qəmgin,
Ol övrət səbr tapdı, oldu təmkin.
Yeridilər olar biab, binan,
Diləfkarü həzin, iftanü xizan.
Dəxi heç görmədilər el və oymaq,
Yetişdilər qəzara gün batan çaq.
Müəzzəm şəhr, yaxşı bir məkanə,
Dedi Sabir ki, ey banuyi-xanə,
Bu dəm gün batdı, bivaxt oldu zinhar,
Bu şəhr içində əlbəttə əsəs var.
Sən əylən munda, mən şəhrə gedəyim,
Gətirib yeyəcək fikrin edəyim.
Sabah olcaq olayım şəhrə daxil
Ki, səbr ilə olur mətlub hasil.
Oradan getdi Sabir, qaldı övrət,
Yetişdi bir cavani-pak tələt.
Müsəlləh, ol cavan olmuş süvarə,
Yetişdi çün ona qıldı nəzarə.
Dedi: - Ey nazəninü sərvü bala!
Güləndamü səmən-sima, dilara!
Neşə yalquz burada əylənibsən?
Gəl indi şəhrə aparım səni mən!
Mən eyləyim sənə ikramü ezaz,
Sən eylə mənə qəmzə, işveyü naz.
Dedi övrət ona: pəs ey bəradər!

Rəva deyil, bir övrətə iki ər.
Yəqin bil, ey cavani-xub kirdar!
Deyiləm mən dəxi yalqız, ərim var.
Cavanü nazənin, xubi-çöhrə,
Damadəm gələr indi, getdi şəhrə.
Yeri, qardaş, yoluna, sən işin tut!
Məni necə ki, gördün, elə unut!
Bu yerdə yox məgər divani sorğu?
Qəzəbləndi, dedi ol tünd bədxu.
Mənimlə gəlməsən, ey paki-daman!
Sənin canındadır bu tiği-bürran.
Davasız qaldı ol biçarə övrət,
Əliylə torpaq üstdə yazdı bir xətt.
«Məni apardılar bu şəhrə, Sabir!
Əyan olsun sənə əhvali-zahir!»
Ol övrət natəvan, döz bu fəraqə,
Kişi götürdü onu getdi şəhrə.
Ol igidin anası yaxşı övrət,
Var idi bir zəifə, pak seyrət.
Sözü şəkkər, özü gülbərg xəndan.
Mürüvvətli, həyali, əhli-iman.
Fəqirü, binəvalər qəmküsari,
Mütii-əmr həqq taətgüzari.
Bu övrət gördü çün ol pakizadi,
Ətəyindən tutuban qıldı dadi:
- Gəl ey övrət, xudanın hörmətiçün,
Məhəmməd Mustəfanın izzətiçün.
Gəl ey ana, mənə qıl gəl, şəfaət,
Bu oğlandan mənə ol gəl himayət.

Mənə sən olmasan gər yarü yavər,
Tutaram ətəyindən ruzi-məhşər.
Bu oğlandan mənim ol sən pənahim.
Ki, səndən qeyri yox bir ümidgahim.
Xəbərdar ola Xatuni qiyamət,
Əlindən eylərəm ol gün şikayət.
Dedi Xatün: əgər vardır səlahin,
Edim onunla mən əğdü nigahin.
- Yəqin bil ey ana, sən xub-kirdar,
Ərim vardır, ərim vardır, ərim var.
Dedi övrət: sənə ərz eylədim mən,
İki dünyada sən mənim qızımsan.
Əlin verdi ona həm qıldı iqrar,
Çağırdı oğlunu xatuni-dindar.
Dedi: oğul, eşit, ol gəl xəbərdar!
Bu övət verdi mənə çünki iqrar.
Mənim oldu qızım, ol sənə xahər,
Təməh ondan götür, ey cani-madər.
Əmanət, əl-əmanət, əl-əmanət!
Utan həqdən buna qılma xəyanət.
Onun halindən ol məsturə övrət,
Olurdu gecə-gündüz vaxt, bivaxt,
Xəbər al inli qanda getdi Sabir?
Gör onun başına nə gəldi axır?
Gəlib əkmək alıb Sabir əlində,
Qayıtdı gördü övrət yox yerində.
Tökər hər dəm gözündən əşki-gülgun,
Sanasan Leylidən ayrıldı Məcnun.
Çəkər nalə deyərdi: ey fələk, dad!

Məni sən etmədin bir ləhzə dilşad,
Yıxıldı xanimanım, oldu tarac.
Gədalıq, ac-susuz, xəlqə möhtac,
Məni avarə eylədin vətəndən,
Həm üzüldü əlim göru kəfəndən,
Mənimlə eylədin sən məkrü hiylə,
Cida düşdük, qamu qovmü qəbilə.
Xaçan rəhm eylədin, məndən qayırdın,
Ciyər guşələrim məndən ayırdın.
Mənimlə belə qalmışdı bir həmdəm,
Nə gəldi başına, netdin onu həm?
Driğa xanda getdi, yari-qəmxar,
Onunçün gecə-gündüz ağlaram zar.
Sızıllaram, pərişan oldu halim,
Mənim, yarəb, əlimdən getdi malim.
Driğa neyləyim, biçarə qaldım,
Qəribü bikəsü avarə qaldım.
Gecə-gündüz gəzəydim mən cahani,
Nola ondan tapaydım mən nişani!
Qılırdı hər zaman ol zarü şivən,
Qaranqu getdi, çün sübh oldu rövşən.
Baxıb gördü ki, övrət torpaq üstə
Yazıbdır: key fəqiri dilşikəstə!
Məni apardılar bu şəhrə, ey yar!
Qırağa getməmişəm, ol xəbərdar!
Çü gördü belə yazmış ol nigari,
Gəlib bir guşədə tutdu qərari.
Qəzara padşahi-ol vilayət,
Bina qılmışdı bir ali imarət.

Buyurmuşdu ki, ol mərdi-sitəmkar
Ki, hər gün gəlsin onda xəlq besyar.
Hamu bimüzd, bikar işləsinlər,
Gecə-gündüz giriftar eyləsinlər.
Neçə kimsə müqərrər eylədi şah,
Kimi görsələr onlar xah-naxah.
Aparalar kim onda qıla bikar,
Kimin əlində ola zərrə dinar.
Verərdi rüşvət, özün qurtarırdı,
Kimin yox axçası, onda qalırdı.
Bu halə çün deyil Sabir xəbərdar,
Gəlib bu guşədə oturmuş ağlar.
Gəh övrət, gəh oğul, gəh dir: malım,
Yetişdilər ona bir neçə zalım.
Neçə ağac ilə onun başına,
Vurub apardılar palçıq işinə.
Sabah axşam olunca işlədərlər,
Gecə pəs onları məhbus edərlər.
Yox idi onlara bir ləhzə rahət,
Hədisi-Mustəfadır bir rəvayət.
Cahan küfr əhlinə olmuş gülüstan,
Vəli mömünlər üçün oldu zindan.
Cahan dopdolu xarü niştərdir,
Batır bağrına kim ki, rəhmgərdir.
Bəlavü möhnətü ənduhü qürbət,
İzafə oldu bu rəncü məşəqqət.
Onilə həm belə bir mərd miskin,
Var idi dilşikəstə, zarü qəmgin.
Gecə ağlar idi, zarü giryan,

Dedi Sabir: ona ki qılma əfqan.
Həqqə şükr eyləyib səbr eylə pişə,
Ki, bidadü sitəm qalmaz həmişə.
Görərsən bir gün, ey yari-yeganə,
Əsər yox zülmü zalimdən nişanə.
Bəsa hökmü, bəsa zalim, sitəmkar
Ki, zülmündən olur mənzilləri nar.
Bəsa kimsə ola çah ona zindan,
Çıxıb çahdan olan mənzili sultan,
Qəzara şah çün ol yerdə hazir,
Eşitdi hər nə söz söylədi Sabir.
Eşitsən bir xəbər xoş mötəbərdir.
Ki, həqq söz batilə oxdan bətərdir.
Ki, həqq söz ola həqqə şəhdü-şəkkər,
Gəlir nahəqə çün şəmşirü xəncər.
Qəzəbləndi, yaman tünd oldu, coşdu,
Sana kim o yanar odlara düşdü.
Buyurdu ol zaman ol bimürüvvət,
Ona eylədilər çox-çox siyasət.
Gətirdilər salıb bir çahə möhkəm,
Özü çağırdı dedi ona ol dəm:
- Burada səbr qıl ta çərxi-dövran,
Səni mundan çıxarıb edə sultan.
Quyuya salı onu ol sitəmkar,
Bu halə olmadı heç kim xəbərdar.
Qaranqu yerdə çahə düşdü Sabir,
Qılırdı səbr pünhan, şükr zahir.
Yüzün həqqə tutub qıldı ibadət,
Həmişə səbr, şükrü zikr, taət,

Vəlakin bir igid halindən agah,
Olub onu anardı gahü bigah.
Ona gahi salardı əndək əkmək,
Müyəssər olunca bir loğma əkmək.
Səbəb oldu ona, Allah kərimdir,
Vəli bilməzdi ol biçarə kimdir.
Quyu içrə həkimanə, qənaət.
Qılardı səbr, şükr, zikr, taət.
Var idi ol şaha bir yaxşı qardaş,
Hamu mömünlərə, miskinə yoldaş.
Qəzara, çünki yox təqdirə təbdil,
Məgər bundan irəli bir neçə il,
Niku ruyü, niku xuyü, kəm azar,
Hökumətdən, şəriətdən xəbərdar.
Rəiyyətpərvərü, miskin nəvazi
Rəiyyət, ləşkər ondan cümlə razi.
Xuda tərs, əhli-insaf, nikukar
Ki, kimsə görməmiş ondan azar.
Mudam ondan çəkərdi şah qorxu,
Canında var idi yüz fikr qeyqu,
Məbada ləşkər ona ola tabe,
Qılalar arada sultanı zaye.
Bu fikri eylədi çün ol hünərsiz,
Onu öldürdü xəlvətdə, xəbərsiz
Nihan eylədi ol torpağa pünhan,
Xəbərdar olmadı əşrafü əyan.
Görünməz oldu çün bir neçə müddət,
Təfəhhüs etdilər ərkani-dövlət.
Sözü sultan olardan çün eşitdi:

- Rəvanə eylədim, təhsilə getdi!
Xəlayiq eylədi bu gümani,
Tutubdur şah onu, saxlar nihani.
Bu əsnadə ki, zülm eylədi bidad,
Əlindən külli aləm eylədi dad.
Səbəbsiz eylədi çoxları tarac,
Rəiyyət oldu bir əkməyə möhtac,
Dedi bir-birinə ərkani-dövlət,
Qəsəm yad eyləyübən əhd beyət.
Gəlib cəm oldu, çün əşrəfü əyan,
Onu öldürmək üçün əhdü peyman.
Olub bizar ondan döndü ləşgər,
Rəiyyət, məmləkət ona sərasər.
Xəbərdar oldu çün əşrafü əyan.
Gecə qaçıb tutub rahi biyaban.
Nə sultan, kim ədalətdən bəridir,
Onun bədxahi həm öz ləşgəridir.
Gecə çün qaçdı ol, qurtardı cani,
Buraxdı taci-təxti, xanmiani.
Yığıldı, dedi çün əlavü ədna:
- Gərəkdir bizə bir sultani-dana.
Şücaü pəhlivan, həm özü adil,
Süxən təb, ola niku xəsail.
Var idi dedilər sultana qardaş,
Neçə müddətdir onu görməzəm faş.
Biri gəldi dedi: əndər zamani,
Bilirəm, qandadır ol  növcavani.
Kim onu eyləmişdi şah giriftar,
Siyəh çah içrə, mən oldum xəbərdar.

Bu sözdən çünki onlar oldu agah,
Dedilər: qandadır, göstər gəl ol çah?
Çü Sabir qalmış idi çah içində,
Həm ol gecə görər öz yuxusunda
Kim, onun üstünə gəldi peyəmbər,
Çirağı-din, şəfii-ruzi-məhşər,
Dedi: şah ol, daxi qəm çəkmə, Sabir,
Səninçün ruzi-hicran oldu axir.
Sabah olcaq səni təqdiri-Allah,
Bu iqlimə qılar bişəkk şəhənşah!
Onun əyninə geydirdi çü xələt,
Başına qoydu bir taci-dövlət.
Çü Sabir yuxunsundan oldu bidar,
Sevindi, həqqə qıldı şükri besyar.
Əkabirlər gəlib çahə rəvani,
Müşəxxəs eylədilər, ol cavani.
Çağırdılar kim: ney məhbusi-bəndi,
Ayağa dur, yapış, saldıq kəməndi!
Dedilər: şah sən ol iqbalü bəxtə,
Gəl indi Sabir əylən sən bu təxtə.
Yapışdı, çəkdilər ol nikbəxti,
Ona tapşırdılar ol tacü təxti.
Özün gül tək görüb, açıb qabağın.
Əkabirlər hamu öpdü ayağın.
Üzün tutdu hamı ol dəm xudayə,
Olub məşğul şah üçün duayə
Ki: yarəb bu cavandır, bu cavanbəxt,
Ola fərxəndə buna tacü həm təxt.
İlahi, günbəgün artsın kəmali,

Fələk yar olsun, olmasın zavali.
Bihəmdüllah kim ol zalim, sitəmgər,
Nikunbəxtü, cəfakarü bədəxtər.
Yox idi ədli çün biçarə oldu,
Əcəb bu ölkədən avarə oldu.
Əgər olmazdı ol bu yerdən ixrac,
Olurduq hamımız əkməyə möhtac.
Bihəmdüllah bizə oldu müyəssər,
Şəhi-adil, təbiət dadgüstər.
Çü Sabir təxtə çıxdı, oldu sultan,
Gədayə, binəvayə qıldı ehsan.
Rəiyyətpərvər oldu şahi-adil,
Duayi-xeyr özüçün qıldı hasil.
Xəzinə tökdü, ləşgərin qayırdı,
Ədalətdən, qılı qıldan ayırdı.
Həm etdi bir tərəfdən rəsmi-rəfət,
Duaçı oldu ləşgər, həm rəiyyət.
Vəzifə eylədi onlara təyin,
Nə yerdə var idi dərviş, miskin.
Rübatü mədrəsə, həm körpü bünyad,
Qılıb məscidləri məmurü abad.
Nikuxislət, təməhsiz, əhli-insaf,
Başına and içər  əyani-əşraf.
Nə yerdə var idi, bədfelü kirdar,
Hamısın bir tərəf qıldı nikunsar.
Qayırdı ruzi divan, hökmü mütləq,
Yeməzdi kimsənin malin bənahəq.
Cahanə düşdü onun yaxşı adı.
Qılır səbr eyləyən hasil muradi.

Burada qalsın işbü nəğli-köftar,
Qulaq as pəs eşit, bir qeyri əxbar.
Məgər ki, padşah ol cəhli nadan
Ki, Sabir malini etmişdi talan,
Çıxarmışdı onu ol məmləkətdən,
Nə gəldi başına gör ol cəhətdən.
Oturmuşdu məgər mülkündə eymən,
Onun üstünə gəldi ta ki düşmən.
Bərabər durdu ol bihəmiyyət.
Basıldı, çünki ondan döndü dövlət.
Hamı cəmiyyəti talanə getdi,
Götürüb hərəmin bir yana getdi.
Ərü övrət hər ikisi dil pərişan,
Biyabanda gəzər, biabü binan.
Gəzib hər yerdə sərgərdanu gümrah,
Yetişdi Sabirin şəhrinə ol şah.
Dedilər Sabirə ey ədligöstər!
Gəlibdir şəhrə bir örət və bir ər.
Pəs ondan edəlim əhvali-məlum,
Müqərrər edəlim biz ona mərsum.
Gətirdilər pəs ol dəm əhli-xidmət,
Olara qıldılar ezazü hörmət.
Tamam oldu, yetişdi, çünki vədə,
Gəlibən padşaha qıldı səcdə.
Özüyçün zahir oldu, hali-pünhan,
Buyurdu qullara ol dəmdə sultan.
Özündə, övrətində hər nə kim var,
Dürü, ləlü, cavahir, zərri-besyar.
Alubən əllərindən, acü möhtac,

Vilayətdən onları qıldı ixrac.
Bunu görüb vəzirü əhli-divan,
Bəqayət oldular xatir pərişan.
Dedilər padşah oldu sitəmgər,
Bəeyni bu dəxi oldu bərabər.
Çəkərsən hər nə fel etsən cəzasın
Ki, qoymaz, həqq sənə onun qisasın.
Buyurdu ol zaman çağırdılar car
Nə ölkədə kimin satlıq qulu var.
Gətirsinlər ki, sultan müştəridir,
Təqafül eyləyən tənbeh yeridir.
Olar ki, Sabirin oğlanlarını,
Aparmışdı onların canlarını.
Onlar həm oldular çün kim xəbərdar,
Gətirdilər oları həm bəbazar.
İki oğul tanıdı ol cigərxun,
Sanasan aqil ikən oldu məcnun.
Buyurdu oğruları sərt, möhkəm
Tutub bağladılar, həm əndər, on dəm.
Ağac altına saldılar olari.
Əlin-ayağın sındırdı vari.
Tökülmüş başdan-ayağa qızıl qan,
Duruban qaçdılar, iftanü xizan.
Yenə dedi vəzirü mirləşgər,
Nə heyf oldu ki, şah oldu sitəmgər.
Vəlakin qorxudan ərkani-dövlət,
Edə bilməz dəxi kimsə nəsihət.
Eşit indi nə etdi gör ol övrət,
Ona eylər idi xatün himayət.

Ona olmuşdu daim nigəhban,
Xəyanət etməyə ona ol oğlan.
Eşitmişdi ki, ol pakizə övrət,
Ki, gəlmiş padişahi baədalət.
Məgər bir gün bilib fürsət həm ol zən,
Çıxıb evindən eylər ahü şivən:
 - Müsləmanlar, mənə çox zülmü bidad,
Olubdur, hanı sultan, eylərəm dad!
Bu halə ol igid oldu xəbərdar,
Tutubdur yaxasından ol sitəmkar.
Deyər övrət: neçə il oldu yaran,
Məni qılmışdı evində pünhan.
Deyər kişi ki, sən məkr etmə, övrət!
Mənə sən eyləmə böhtanü töhmət.
Görün yaran ki, bu münkər olubdur.
Həvayi-eşqilə könlü dolubdur.
Onu mən döymüşəm, istər bu kinə,
Məni salıb gedə bir özgəsinə.
Bu halə çünki, agah oldu sultan.
Tələb qıldı oları etdi divan.
İrəli gəldi kişi, dedi: ey şah!
Bu xatun övrətimdir, ol gəl agah!
Məaş etməz mənimlə, bihəyadır,
Bu gerçəkdir ki, övrət bivəfadır.
Çağırdı onu sultan dedi: ey zən,
Onunla sən nöşün nasaz olubsan?
Dedi övrət ki: ey sultani-dərgah!
Deyil ərim mənim bu haşalillah!
Ərim olsaydı bu, qurban olardım,

Ərim görsəydim mən, heyran olardım.
Tamam hal-əhval olduğun zən,
Sərasər ərzi-halin qıldı rövşən.
Bürünmüş bərk ol məsturə məhbub,
Görünməz surəti kim tanıya xub.
Tanıdı övrəti sultan boyundan,
Sanasan tükləri çıxdı donundan.
Hərəm sarı buyurdu getdi övrət,
Kişiyə qıldılar zülmü siyasət.
Kişi məcruh olub qanına qəltan,
Buyurdu, etdilər məhbusi-zindan.
Bu halı gördü çün əşrafü əyan
Dedilər şahə: – Yoxdur səndə bir qan?
Veribdir zülmilə qardaşı badə,
Dəxi möhnət nədir bundan ziyadə?
Bu nə cövrü sitəm, bu nə fəqandır?
Məgər dövlət səninlə sərgirandır?
Bu nə bidaddır, bu nə siyasət?
Məgər döndü səninçün bəxtü dövlət.
Dedi: - Mən neyləmişəm, ey büzürgan!
Yetirdim kimsəyə azarü nöqsan?
Dedilər: - Hani miskinü məzlum,
Bu şəhrə gəldi ol biçarə məhrum.
Malın sən taladın, biçarə qıldın,
Qovub bu şəhridən avarə qıldın,
Sənin şəhrinə gəlmişdi mehman,
Gərək sən eyləyəydin lütfü ehsan.
İki qul həm gətirdilər bu şəhrə,
Yetirmədin olara xeyrü bəhrə.

Çəkib qulları sən aldın olardan,
Ayaq kəsdi xəlayiq bu diyardan.
Olara vermədin qiymət bir altun,
Oları eylədin aludeyi-xun.
Çəkərsən zülmülə biganə övrət,
Ərinə eylədin zülmü siyasət.
Nə zülm olur dəxi bundan ziyadə?
Heyf ki, yaxşı adın getdi badə?
Dedi sultan olara ki: cəmaat!
Qulaq asın, edim mən bir hekayət.
Deyirsiz kim, məgər biçarə övrət,
Ərinə eylədim zülmü siyasət.
Mənə həqq verdi fürsət xilafi,
Alıb malın ona qıldım təlafi.
Həm ol qullar dəxi, oğlanlarımdır,
Bədəndən ruhi şirin xanlarımdır.
Nə qılsan çəkdirər allah cəzasın,
Qiyamət gününə qoymaz qisasın.
Yenə övrət dəxi öz övrətimdir,
Yəqin hasil edin, Allah kərimdir.
Nə kim çəkmiş zi əvvəl ta bəaxır,
Hekayət eylədi ol dəmdə Sabir.
Sizə mən sirrimi çün eylədim faş,
Deyildim mən sizin sultanə qardaş.
Dözüb səbr eylədim, qaldım aradə,
Yetişdim səbr ucundan mən muradə.
Əgər görsə kəsi azarü nöqsan,
Əgər səbr eyləsə olmaz pəşiman.
Bəlayə səbr qıl, şükr et xudayə,

Səni bişək yetirər müddəayə.
Olur təcil edən şeytanə tabe,
Hamı işi olur əlbəttə zaye.
Sizindir məsləhət, yox ixtiyarım,
Keçər necə olarsa, ruzigarım,
Olar da bu sözü çün qıldı yəqin,
Dedilər: ayərin, səbrü və təhsin!
Sənə çün yar olubdur taleyü bəxt,
Sənə şayistədir, həm tac, həm təxt.
Çü dövlət verdi sənin tək əzizə,
İnayət eyləmiş Allah da bizə.
Bu dövlət getməsin sən tək əzizdən.
Ki, sayən olmasın kəm üstümüzdən.
Bu dövlət kim sənə görməz rəvadır,
Onun gözünə batsın mixi-məstur.
Qulamik biz hamu, sənsən xudavənd,
Fəda olsun yolunda malü fərzənd.
Bəli, hər padşah kim ola adil,
Duayi-xəlq olur ona həmayil.
Nə sultan kim, olursa, ədlü dadi,
Özündən sonra qalır yaxşı adi.
Vəli, hər padşah ola sitəmgər,
Rəiyyət edə nifrin ona ləşkər.
Çü Sabir oldu sultani-cahanbəxt,
Müsəlləm oldu ona tac, həm təxt.
Eşit gör netdi, ol mərdüdü gümrah
Ki, tutub Sabiri salmışdı dər çah.
Yığıb üstünə bir anidə ləşgər,
Gəlib Sabir ilən cəng etmək istər.

Bu həm qıldı qamu fikrin mühəyya,
Müqabil durdular, çün qopdu qovğa.
Çün ol bədbəxtdən dönmüşdü dövlət,
Həqq ol Sabirə yəqin verdi fürsət.
Tutub gətirdilər ol nabikari,
Basıldı ləşgəri ol dəmdə vari.
Qaçıb ləşgər, ələm oldu nikünsar.
Həzimət oldular, basıldı sərdar.
Gətirdilər onu əndər müqabil,
Dedi Sabir ona: ey mərdü qafil!
Mənə sən bil müqərrər eylədin çah,
Neşə, mən səbrilə oldum bu gün şah.
Yəqin bil ki, sənə yoxdur xilasi,
Qiyamətə kimin qalmış qisasi?
Pəs ol dəm Sabir onu saldı çahə,
Tərəhhüm etmədi ol rusiyahə.
Çəkib cövri-cəfa həddən ziyadə,
Olurdu orada ta can verdi badə.
Çü səbr eylədi Sabir çıxdı əz çah,
Qılubən səbr, şükr oldu şəhənşah.
Çü ol zülmə yetişdi, çahə düşdü,
Sözü ibrət olub, əfvahə düşdü.
Eşidən, dinləyən olmaz pərişan!
Ki, səbr ilə olur hər müşkül asan.
Bu nəğli Bəxtiyar edincə itmam,
Yenə gün batdı, oldu bəxti-axşam.
Yenə bənd eylədilər Bəxtiyari
Ki, dinlə necə ola rüzgari.

## SADİQ BƏY ƏFŞAR

*XVI əsrin ikinci yarısı – XVII əsrin əvvəllərində yaşamış görkəmli şair, miniatürçü rəssam, təzkirə müəllifi Sadiq bəy I Şah İsmayılın siyasət meydanına çıxdığı zamanlarda Şamdan öz arzusu ilə ona qatılmağa gəlib, İraq və Azərbaycanda yerləşən Xudabəndəlü boyuna mənsubdur. Sadiqi 1533-cü ildə Təbrizdə, Vercü məhəlləsi civarında dünyaya gəlmişdir. Təbriz, Qəzvin və İsfahandan başqa Yəzd, Gilan, Lahican, Ərəbkuh, Astrabad, Həmədan, Bağdad, Ətəbat (Nəcəf və Kərbəla) və Hələbdə yaşayıbdır. O, bir müddət Səfəvilərin dövlət kitabxanasının müdiri olmuş, Sadiqi Kitabdar kimi tanınmışdır. «Məcməül-xəvas»*

*təzkirəsinin, rəssamlıq sənəti haqqında «Qanunüs-süvər» əsərinin, şeirlər divanının, münşəatın (məktublar), «Fəthnameyi-Abbas namdar» poemasının və s. əsərlərin müəllifidir. Ə.Nəvaidən təsirlənən şairin bir sıra şeirlərində çığatay dili elementləri özünü göstərir.*

vV

Yana nə bərq idi kim, saldı eşq canımğa
Ki, tüşdi şəm kibi məğzi-üstüxanımğa.

Yana nə seyl idi kim, yıxdı səbr bünyadın,
Gətürdi rəxneyi-qəm mülkü xanü manımğa.

Yana nə şövq idi kim, kəsdi rişteyi-canım,
Buraxdı dami-bəla cismi-natəvanımğa.

Yana nə gülbüni-vəsl idi kim, şüküftə bolup,
Bahar verdi xəzan bərli bustanımğa.

Yana nə bərq idi, ey Sadiqi ki, oldu əyan
Ki, etdi şölə füzun atəşi-nihanımğa.

* * *

Közə ol şəh yolıdın özge ğubari bolmasun,
Məndin özgə kimsege andın güzari bolmasun.

Gülşəni-kuyində kim, sərvi-qədi məvasıdur,
Hər tərəf əşkimdin özgə cuybari bolmasun.

Köyməsün könlüm evin bivəch, ya Rəb, hicr oti,
Təndə bərqi-vəsldin özgə şərari bolmasun.

Məndin özge bolmasın məhrəm hərimi-bəzmdə,
Tən nəmidin özge onda pərdədari bolmasun.

Müntəzir bol kim, gəlür qətlunğə dersən, ey rəfiq,
Hər nə bolsa-bolsun, əmma intizari bolmasun.

Dedi ki, bəzmində bolsun pərstigari Sadiqi,
Leyk meyli-işrətü busü kənari bolmasun.

* * *

Qalmağay erdi bu aləmdə məhəbbət kaş ki,
Tüşkey erdi dəhrdin rəsmi-müvəddət kaş ki,

Çün əlif tək vahid olmaqdır cihandin aqibət,
Tutmağay erdi kişi hiç kəslə ülfət kaş ki,

Bilməs ermişlər kişi qədrin vətən əbnası çün,
Tuğqay erdi damənimni xaki-qürbət kaş ki.
Dersən, ey naseh ki, məndin tut nəsihət, aqil ol,
Tutğay erdi bu könül məndin nəsihət kaş ki.

Sihhətim berdi iyabətdin peşimanlıq sana,
Bermegey erdi mana əyyam sihhat kaş ki.

Öldürür, ey Sadiqi, ol ay bu kün-danla səni,

Bergey erdi bir iki kün çərx möhlət kaş ki.

* * *

Ey əcəl, al canımı, aləmni ansız körməyin,
Canımı canansızü cismimni cansız körməyin.

Cilvə qılmas qaməti könlüm ara kur et közüm,
İstərəm bu bağnı sərvi-rəvansız körməyin.

Qoy yıxılsın səbr bünyadı, tökülsün cami-eyş,
Közümi seylabsız, bağrımnı qansız körməyin.

Keçdi ömrüm yarsız, ey çərxi-dun, tap al canım
Kim, həyat əyyamnı ol növcəvansız körməyin.

Gər xəyalı kəlməsə közdin qılay qəti-nəzər,
Sadiqi, hərgiz bu evni mehmansız körməyin.

* * *

Şöleyi-ğəmdin mənivü səbrimi örtədi ot,
Yoxü barım örtədi səndin yırak tepredi ot.

Közü könlüm vəh nəçük boldı xəyalın məskəni
Kim, erür bu mənzilin səqfi, suyü bunyadı ot.

Keldi gülgun səkritüp bir şuxu mən boldum əsir,
Barça el salim məni bəd rüzga uçardı ot.

Kop yanımdın həmnişin kim, şöləligdür ahi-gərm,
Qıl həzər Tanrı üçün, bilməm bilişni, yadı ot.

Sanma bitəsir ahım uçqunın, ey müddəi,
Bolma qafil kim ərür əlbəttə ot övladı ot.

Rəhm qıl həmdəmlərə, ey Sadiqi, köp çəkmə ah,
Köyməsün Məcnunivü yandırmasun Fərhadı ot.

* * *

Əlgidə al alma emes kim ata tutar,
Alıla aldı könlümi ol şuxi-gülüzar.

Cami-neşat tutsa birev şah bəzmidə,
Tan yoq əgər ki, qəm sipəhin qılsa tarü mar.

Yüz min neşat birlə qıvan, ey könül, sana,
Həm yardur müyəssərü həm busü həm kənar.

Ol türk imset elgidin er bir qədəh şərab,
Tuşsə əlinə can ivazın berməgə nə bar.

Səngi-həvadisi-qəm ilə yıxılır könül,
Saqi şərab sağarıdın qılmasa hisar.

Abbas şah bəzmində yeksan içər qədəh,
Çingiz birlə Sadiqi rindi-meykusar.

Bolsun bu padşahi-cahangirə dəmbədəm,
Dövlət mütivü bəxt rəfiqü zəmanə yar.

* * *

Dostlar, sərf eylərəm nəqdi-vəfa bir yar üçün
Kim,edər yüz min cəfa hər dəm bana əğyar üçün.

Ayrılığ zə′fi bilən bəs kim öldürmən dəmbədəm,
Tutdılar yüz min… matəm məni-bimar üçün.

Yox sana lütfivü var əğyara dersən, ey rəfiq,
Necə bir könlüm məlul olsun bu yoxü var üçün.

Müşkili-düşvari-eşqə etmə tədbir, ey həkim,
Eyləməz tədbir aşığ bu müşkili-düşvar üçün.

Bir qədəh mey birlə dün bəzminlə rəf oldı ğəmim,
Can fəda bolsun anın tək həmdəmi-qəmxar üçün.

Sadiqi, arzürdə istər hər zaman canan səni,
Guiya xəlq eylədi xaliq səni azar üçün.

* * *

Göz yaşım vermə nəmi-ahi-səhərgahlara,
Yanar əflak könüldən çəkilən ahlara.

Qoyma xali gözümi şəmi-rüxin əksindən,

Qoysalar eyb degül şəm nəzərgahlara.

Qeyr dutdu ətəgün saidini öpmək üçün,
Dövlət əl verməsə yeg himməti kutahlara.

Dərdi-dil xublara hacəti-izhar degül,
Ərzi-hal eyləmə sən səngi-dil agahlara.

Sadiqi, söyləmə zöhhada qədəh keyfini sən,
Rəhi-meyxanəni göstərmə bu gümrahlara.

* * *

Rəhm edib atmaz oxun yar ürəgim yarəsinə,
Bumudur xubların çarəsi biçarəsinə.

Tüşdülər bir-birinə didəvü dilləlin üçün,
Qan olar, girmək olurmu buların arəsinə.

Yandı bağrım, könül ayinəsini tutdı qübar,
Düşəli xalü xəti arizü rüxsarəsinə.

Girdbad eylədi dəvi məni-sərgəştə ilən,
Yetiməz hər kişi dəşt qəmin avarəsinə.

Dedilər sərvi-qədi cilvəgər oldı yarın,
Getdi göz seyli-sirişkim bilə nəzzarəsinə.

Tökülən damənimə qətreyi-əşkim gecələr,

Fələkin tə′nə edər sabitü səyyarəsinə.

Sadiqi, gər yürəgün qanın içər, ah etmə,
Könlüni vermiş idün qəmzeyi-xunxarəsinə.

* * *

Könlümin hər dəm girər ol mahsima qoynına,
Yeridür gər girsə xurşidin Məsiha qoynuna.

Sinəmi çak eyləyüp ol ay xəyalın bəklərin,
Öylə kim bəkləşdürür xaçını tərsa qoynuna.

Bağa girsəm bu sarıq rüxsarü gülgun əşk ilə,
Qönçənin istər girə gülbərgi-rəna qoynuna.

Gövhəri-əşkim cəhanı tutdı evladur bu kim,
Qoymaya şimdən geri lölöni dərya qoynuna.

Qeyr əgər əhbab ilə bəzmi-vüsala yol tapar,
Sadiqi alır xəyali-yarı tənha qoynuna.

* * *

Püstə nə deyü bəhsini eylər o dəhanun,
Ağzına bax ol ağzı açuq hiç mədanun.

Bir kərrə turub qibleyi-rüxsarına qarşu,
Həsrətdən açıq qaldı gözi qiblənümanun.

Gördi məni, ağlar yüzimə gül kibi güldi,
Seylabi-məhəbbət evini yıxdı xəyalun.

Hər didə gəlüb getməsi cana qatı xoşdur,
Ol qönçə dəhandan xəbəri varmı səbanun.

Yuz dura əgər ay ilə Yusif sana yetməz,
Məqdurmudur yetməsi xurşidə suhanun.

Ayru düşəli dərdü qəmü möhnətə düşdüm,
Hicran səbəbi oldı bu yüz türlü bəlanun.

Qurtulmadı vəsliylə daxi Sadiqi qəmdən,
Şimdən bəri yox çarəsi bu dərdə dəvanun.

* * *

Doldı gözüm qübari-səri-kuyi-yardan,
Gör, gör nələr yetişdi bana ruzgardan.

Eşq atəşinə yanma, yaxılma demək nədir,
Od macərasın istəmədi kimsə xardan.

Canandan ayrı tə′neyi-düşmən nədür bana,
Yox ictinabı kalbüdün səngsardan.

Düşdüm mühiti-eşqəvü qurtarmağa bəni,
Mövci-bəla araya çəkər bir kənardan.

Əğyarı mötəbər eləmək güc gəlir, nolur,
Gər tüşsə Sadiqi nəzəri-etibardan.

vV

**RƏHMƏTİ**

*Azərbaycan və fars dillərində gözəl şerlər yazmış bu şair haqqında ilk məlumatı öz dövrünün təzkirəçisi Təqi Əvhədi (1565-1620) «Ərəfat ül-aşiqin və ərəsat ül-arifin» adlı təzkirəsində (1613-1615-ci illərdə yazılıb) vermişdir. Bu məlumata əsasən şair nəsx və süls xətlərini gözəl yazmışdır. Təzkirəçi öz Hindistan səfərindən əvvəl (1605-ci ildən əvvəl)*

*onun 7-8 min beytlik bir divanını Şirazda gördüyünü qeyd edir. Şair XVI əsrin ortalarında Təbrizdə anadan olmuş, dövrünün qarışıq siyasi hadi-sələrinin, İran-Türkiyə müharibələrinin şahidi olmuşdur. Təzkirə yazılan illərdə Hindistana səfər etmiş şair bir neçə ildən sonra 1616-cı ildə orada, Aqra şəhərində vəfat etmişdir.*

*Şairin elm aləminə məlum olan «Divan»ının yeganə əlyazma nüsxəsi Azərbaycan MEA Əlyazmalar İnstitutunda saxlanılır. Əsasən fars dilində yazılmış qəzəl, qəsidə, rübai və qitələrdən ibarət olan bu nəfis əlyazmada şairin Azərbaycan dilində yazdığı şerlərindən iyirmi beş qəzəl və bir rübaisi verilmişdir.*

## Q Ə Z Ə L L Ə R

Bəzmi-vəslin məhrəmi gər verdi çoq həsrət mana,
Leyk hər bir həsrət oldu hicrdə rahət mana.

Göz yaşı gər durmasa, naseh, məni mən′ eyləmə,
Nemək olur, böylə təlim eyləmiş adət mana.

Mən biləm yar ilə, ey dil, ol mənimdir mən anın,
Gəl sən imdi çıq aradan, vermə çoq zəhmət mana.

Öldürüb hicran məni qurtardı qəmdən, ey əcəl,
Sən nə etdin kim, qoyarsan bu qədər minnət mana.

Rəhməti, fərhad ilən Məcnun aradan çıqdılar,
İmdi meydanda mənəm, döndərdi yüz söhbət mana.

* * *

Eşq məni aləmində bir əcəb memar imiş,
Hər yıxılmış xatirin təmirinə sərkar imiş.

Göstərir hər ləhzə yarın surətin yüz rənglə,
Eşq bir tərrahi-çabuk-dəsti-şirinkar imiş.

Ey könül, təqdiri təğyir eyləmək mümkün degil,
Sana qismət eşq odu, İbrahimə gülzar imiş.

Xosrovu Şirin necə məhv etdi, gör kim heç deməz,
Bisitun dağında bir Fərhad adlı var imiş.

Rişteyi-zülfün zahid tari-təsbih eylədi,
Tari-təsbihi-ibadət rişteyi-zünnar imiş.

Dudi-ahim nə yerə sığar, nə gögə, Rəhməti,
Yer ilə gög aşiqin başinə gircək dar imiş.

* * *

Gəzərəm bir muğ içün guşeyi-meyxanələri,
Görməyəcək uraram daşlara peymanələri.

Söylə məndən, dəxi Məcnun ilə Fərhadı unut,
Nə ögərsən bu qədər bir neçə divanələri.
Zöhd əhlinə qədəh dut, başin içün, saqi,
Aşina eyləyə gör lütf ilə biganqələri.

Əhli-təqva göricək, daneyi-xalın əlüdən
Buraxırlar yerə tez səbheyi-səddanələri.

Gər tarağ diş ilə, ey Rəhməti, ol zülfi aça,
Düşə od canına yeldən yana dəndanələri.

* * *

Tən eyləmək nə lazım Fərhadi-namuradə,
Heç kimsə bu cahanda yetişməmiş murədə.

Zahid əgər bənimlə oturmasa rəvadır,
Bir yerdə başə varmaz səccadə ilə badə.

İllər rizasıyçün zülfin dağıtma, ey yel
Dur, özgələr söziylən ömrüni vermə badə.

Kirpiklərin xədəngi sanma ki, zaye oldu,
Naziknihal olubdur hər biri bir yaradə.

Məcnunü şuri-Leyli, Fərhadü eşqi-Şirin,
Biçarə Rəhməti tək hər kimsə bir bəladə.

* * *

Ayəti-rəhmət kibi könlümə etdi rahlər,
Müshəf hüsnündə ol peyvəstə bismillahlər.

Yüzə gəldi gözlərim mərdümləri ta ağladum,
Qarə etdilər yüzümi yardən bədxahlər.

Gər kül olmuş təndə canu dil bulunsa niy əcəb,
Hind mülkündə çoq olur böylə atəşgahlər.

Tuba ilə sərvi qəddinə müşabih etməzəm,
Sana xanda yetişür hər qaməti-kutahlər.

Gül götürgəc vəsl xanını aradən, Rəhməti,
Bülbüli-şuridə sufilər kibi allahlər.

* * *

Güzarun düşsə, ey badi-səba, gər kuyi-dildarə,
Degil: «Əğyar ilə oturma, durma» arsız yarə.

Başından zülfünün sövdasın, ey zahid, çıqar mən tək,
Müsəlmansan, utangil öz-özündən, uyma zünnarə.

Ləb üzrə ənbərin xalı qara bağrımı qan etdi,
Nə iş gətirdi axir başıma gör ol yüzü qarə.

Murad olmaz müyəssər, ey könül, bihudə yalvarma
Ki, bən həm canə yetdim sən kibi yalvarə-yalvarə.

Onun yüzün görəndə deyibmişsən can verim, vergil!
Mübəddəl eyləmə, ey Rəhməti, iqrari inkarə.

* * *

Şölə urar canə hər dəm şəmi-ruxsarın sənin,
Yandurar axır mənim pərvanəmi narın sənin.

Ay yüzündən bürqə aç bir gəz utandır nasehi,
Deməsün daxi mana kim, bumıdır yarın sənin?

Başin içün zülfünqa ver bir nəsihət, ey sənəm,
Qorxuram imanıma qəsd edə zünnarın sənin.

Ey könül, yüz kərrə sürdilər səni ol qapundan,
Getmək istərsən yenə, heç yoqmıdur arın sənin.

Canü dil gedərsə getsün, səbri əldən qoymagil,
Səbrdir, ey Rəhməti, hər işdə pərkarın sənin.

* * *

Qan yaşım gözdən rəvan ol çeşmi-fəttan eylədi,
Göz görürkən gərdigüz mərdüm ara qan eylədi.

Gögə yetirdi rəqibin başını bilmən neçin,
Aşiqi-uftadeyi torpağa yeksan eylədi.

Bizə, yarəb, qüvvəti-rəftar neçin verмədi
Ol ki, bir qətrə suyi sərvi-xuraman eylədi.

Dönə-dönə qanlar içirdi manqa gərduni-dun,

Bir neçə gün kim, məni dünyadə mehman eylədi.

Rəhməti tək, ey sənəm, zünnari-zülfün çoxları,
Küfrə saldı, əvvəlü axır müsəlman eylədi.

* * *

Eyb olmaz, şərh qıl, ey gül, mana əhvalını,
Zəfəranə kim bədəl etdi üzari-alını.

Surəti-divar tək, əlqissə, heyran olmuşam,
Kim nə yüz ilən çəkər nəqqaş xoş timsalını.

Tilbə könlüm kim, sənin pəndin eşitməz, neyləyim?
Ey ləbi datlı, əbəs yerə aqıtma balını.

Qətlim içün çoq dəlili vardır ol xunxarənin,
Var, rəqib özün içün saqla bu istidlalını.

Yengi başdan bir qara kaküllü dilbər, Rəhməti,
Tirə etdi qarə bəxtim kibi mahü-salını.

* * *

Bu dari-fənada xanı bir yari-müvafiq,
İqrarına qaim ola, göftarına sadiq.

Julidə saç o baş qoyarmı başə, yarəb,
Hər baş olurmu ola bu əfsərə layiq?

Azürdə gər olsan, könül, ol qəmzədən inci,
Aşüftə olur xəstə təbib olmasa haziq.

Divanə könül etdi məni aləmə rüsvay,
Əlqissə, bir iş işləmədi əqlə müvafiq.

Ta Rəhməti ağzın sözüni dillərə saldı,
Həm sözün itirdi, həm özün əhli-dəqayiq.

* * *

Əhli-ələm çevrəmə Məcnun deyüb dolandılar,
Tifli-ahu çeşmimi görgəc əyan utandılar.

Səni də zikr etdilər əhli-məhəbbət, ey könül,
Deymə kim, Fərhad ilə Məcnunu ancaq andılar.

Bilməz idi kimsə kim, qan qaşın eylər, ya gözün,
Ləblərin bu babdə güftarə gəlgəc qandılar.

Bu nə dindür, bu nə ayindür ki, cadu gözlərin,
Aşiqi-biçarəyi öldürməmişkən dandılar.

Dəhr əsbabından ancaq var idi bir canü dil,
Rəhməti, onlar dəxi eşq atəşilə yandılar.

* * *

Bizə bağrı qan olmuş bir neçə biçarələr derlər,
Sizə qanlar içici bağrı daş xunxarələr derlər.

Nə lazımdır ki, bədnam olasız, bizdən kənar edün,
Sizə pakizə damanlar bizə xəmmarələr derlər.

Münəccimlər gözüm yaşın görəndə iztirab edib,
Neyçün qana dönüpdir yenə bu səyyarələr derlər.

Ağarmış başa rüsvalıq gətürdilər bu vəchilə,
Qara geymiş xətü xalına yüzi qarələr derlər.

Əcəb gündür gəl imdi, Rəhməti, beytül-həzəndən çıq,
Bu gün seyranə çıqmış bir-iki məhparələr derlər.

* * *

İtlər ilən sübhədək hər gecə fəryad eylərəm,
Xatiri-naşadimi bu növ ilə şad eyləyəm.

İtləri yadımğa ta düşcək qaranqu gecələr,
Yaxa yırtıb, baş açıb ölüncə fəryad eylərəm.

Dəsti-qeyrət zəxmi-mühlik urdi canə, ey könül,
Ölürəm qəmdən səni, qəm çəkmə, azad eylərəm.

Eşq yar olsa əgər aləm yıxılsa qəm yemən,
Yüz pozuxnu eşq ilə bir dəmdə abad eylərəm.

Kuhi-qəm görgəc gəlürsin xatirimğə, Rəhməti,
Bisitun görgən kibi Fərhadını yad eylərəm.

* * *

Necə aşiqdir çəkər bir dağ içün Fərhad ah,
Aşiqi-sadiq mənəm birdir yanımda kuhi-kah.

İki gözdür yüzünqi seyr etməyə açmış fələk,
Birinə qoymuş münəccim mehr ad, birinə mah.

Eşq məsti ol dilavərdür ki, gər yüz cürm edər,
Dəftəri əmalinə səbt eyləməzlər bir günah.

Kuyinə getgəc gözümdən tökülür qanlı sirişk,
Qorxuram kim, ləli-əşkim ola axir səngi-rah.

Qəbrim üzrə lalə neylər, mən fəna dəryasıyam,
Ol hübabımdır mənim, ey Rəhməti, biiştibah.

* * *

Bisitun dağını çapdım der, urar Fərhad laf,
Bilməmiş kim, aşiqin gözünə gəlməz kuhi-Qaf.

Çoq bənimlə münhərif oturma-durma, ey hərif,
Dutmaya nagəh, məzacın dağ, təriqi-inhiraf.

Daxili-hikmət degil nəfyi-mey etmək, əbsəm ol,

Aqil olan eylər öz cəhlinə hərgiz etiraf?

Nə yüz ilə daş urarsan mey xuminə, mühtəsib,
Sənin içün qarə yüzün kibi onun könlü saf.

Zahid abi-Kövsər istər, mən-şərabi-laləgün,
Var bizim ma-beynimizdə, Rəhməti, çoq ixtilaf.

* * *

Dəhr əsbabina, ey dil, çoq dəxi etmə həvəs,
Çün məhəbbətdən dəm urdun, qeyrdən peyvənd kəs!

Eşq məsti, ey könül, məzurdur, asudə ol,
Kim sanqa nə şəhnə eylər hökm, niy miri-əsəs.

Eşq gəlgəc canü-dil təndən fərar etdi, bəli,
Dözə bilməz yanar odun şöləsinə xarü xəc.

Məhmili ardınca, bilmən, könlüm əfsanı nədür,
Kusi-rihlətmi ola bu, yoxsa fəryadi-cərəs?

Dil pəri bu cismi-bicandan nə istər, Rəhməti,
Quş ki, pərvaz eylədi, bilmən nəyə yarar qəfəs?

* * *

Ey pəriru, ta sənə yüz çeşmi-giryanım dutar,
Aqə-aqə yer üzünü əşki-qəltanım dutar.

Qanlı yaş göz rövzənin dutdi varırkən kuyinə,
Qanda varsam qanı dolmuş kişi tək qanım dutar.

Canqa yetdim, bu könlünün əlkidən, fəryad kim,
Tilbə yanlıq nə sözüm dinlər, nə fərmanım dutar.

İstərəm əğyar rəşkidən çıxam bu bəzmdən,
Dəsti-qeyrət duricək çaki-giribanım dutar.

Əzmi-tofvi-kuyin etsəm Rəhməti tək gah-gah,
Getməmişkən bir qədər yüz xar damanım dutar.

* * *

İctinab et, ey könül, əbru kəmanımdan mənim,
Sözümi eşit, daxi təprənmə yanımdan mənim.

Mərhəba, badi-səba, canım sana olsun fəda,
Gəl ver imdi bir xəbər sərvi-rəvanımdan mənim.

Sanur idim var əğyar ilə məxfi ülfətin,
İncimə, başın içün, batil-gümanımdan mənim.

Basma qəbrim üzrə, ey düşmən, ayaq, əndişə et,
Zəhrlü peykan bitübdür üstüxanımdan mənim.

Rəhməti, gülgün hübab irməz sirişkim üzrə kim,
Lalələrdir səringün qaynaşdı qanımdan mənim.

* * *

Qanə döndi yürəgim sibi-zənəxdanın içün,
Vermənəm istəgümi aləmə öz canın içün.

Bas qədəm qəbrimə naz ilə, əzabım rəf et,
Yüzün üzrə yazılan ayəti-Rəhmanın içün.

Arizin bağidə bir quş oxur idi dün gün,
Ol bənim könlüm idi saxla gülüstanın içün.

Gələ gər yanimə, ey tilbə könül, qəm çəkmə,
Rəgi-can riştə edim çaki-giribanın içün.

Çün xəyalı qonaq oldu sənə ehmal etmə,
Cani qurban edə gör Rəhməti mehmanın içün.

* * *

Dudi-ahın, ey könül, göydə hüveydalanmasun,
Söylə öz həddini bilsin, çoq da babalanmasun.

Gördün ol sərvi-səhi qəddi, dur indi, ey səba,
Bağ ara sərvə xəbər ver çoq da yektalanmasun.

Zülfüni görgəc könül zünnar eylər arizu,
Qorxuram kim, şeyx Sənan kibi tərsalanmasun.

Ey könül, sən xanda, Məcnun xanda, bari əbsəm ol,
Hər kim öz yerini bilsin, pəşşə-ənqalanmasun.

* * *

Bənim yerim fəna bəhrivü Məcnun yeri sahildür,
Bana bənzətmə anı, ol bənim yanımda aqildür.

Yüzün görgəc ləbindən busə umsam incimə məndən,
Təsərrüfsüz tamaşa eyləmək eşq içrə müşküldür.

Giysun bağrımnı gər yüz parə etsə tan imas zira,
Fərağın şərbəti qayimməqam zəhri-qatildür.

Qara zülfini yad eylər dəma-dəm səbrsiz könlüm,
Cünuni ğalib olğan tilbədək zəncirə mayildür.

Könüllər naləsin, ey Rəhməti, eşitgəc ol ğafil,
Edür məxsuslərlə kim, bu  nə avazi-hayildür.

* * *

Arizin tək xansı bağın laleyi-sirabı var,
Lalə çoq, amma anun bir özgə abü tabı var.

Hicrdən çoq da məlul olma, könül, səbr eylə kim,
Bu qaranqu gecənin əlbəttə bir məhtabı var.

Bilməzəm yarəb, nə müshəfdir cəmalın səfhəsi

Kim, müənbər xəttü mişkin xalilə erabı var.

Gözlərimdən tökülür qan yaş yerə baran kibi,
Ehtiraz et, boylə yağışnın yaman seylabı var.

Anınçün başı yüksəkdir gögün, ey Rəhməti
Kim, onun daq sən kibi xurşidi-aləmtabı var.

* * *

Aşiqəm, aşiq nədür pəs bu sirişki-çöhrəgah,
Nəfyi isbat eyləmə, dəviyə mənidür günah.

Eşqə münkir düşmə, ey şeyxi-riyayi, əbsəm ol,
Eylə şəni-əmalını bu etiqat etdi təbah.

Seyl çeşmim rəhgüzarində deyüz bir qətrə su,
Sər-səri-ahım yanında Bisitun bir bərgi-gah.

Tən edərlər göz götürsəm bir zaman səndən, bəli,
Yüz səvab etsən degil mənzur illa bir günah.

Rəhməti, ol türreyi-tərrar başdan tirədür,
Ya sənin dudlikindən öylə olmuşdur siyah.

* * *

Çakəri-piri-muğanuz büti-tərsa sevərüz,
Biz məhəbbət quluyuz hər kim olursa sevərüz.

Daği-xunin yaxaru sineyi-çak üzrə müdam,
Bisitun dağı kibi laleyi-həmra sevərüz.

Kamımız, verməz isən ərzi-tələbdən bari,
Bizi mən etmə ki, izhari-təmənna sevərüz.

Gəlicək kuyində didar dəriğ etmə ki, biz,
Rindi-firqətzədəyüz, Turü təcəlla sevərüz.

Dəlqü təsbihü müsəlla nə deməkdür, zahid,
Munca yildür bütü zünnarü kəlisa sevərüz.

Ey könül, eşq ətəgin can əli birlə duta gör,
Qoy nə derlərsə desinlər, ruzi-ziba sevərüz.

Rəhməti, xum ətəgin dürdsifət dut, nə olur,
Qatı dağ eyb degil, sağəri-səhba sevərüz.

* * *

Zəri-xalis kibi kamil əyarü safü pakiz biz,
Əgər alçaq vəgər yüksək günəş tək tabnakiz biz.

Gözümüzdə əcəl xarı, əməl gülzarı həp birdir,
Kimsənə munu fəhm etməz, anın içün həlakiz biz.

Əgər damən çəkə bizdən səlamət əhli-cayizdir,
Səri-kuyi-məlamətdə yatan biqədr xakiz biz.

Həvəs tiri bizə kar eyləməz, dəm urma, ey naseh,
Könül, gözün açıb seyr et, əzəldən sinəçakiz biz.

Müazüllah, cünun zəncirini, ey eşq, ditrətmə
Ki, bu hayil sədadan Rəhməti tək tərsnakiz biz.

**R Ü B A İ**

Məclis içində Rəhməti mahi-siyam,
Meyxanəyə sübh baş çəkər, məscidə şam.
Ta zahidü rahib ola andan xoşnud,
Bir əlində təsbih, birisində cam.

vV

## MƏHƏMMƏD ƏMANİ

*Məhəmməd Əmani XVI əsrin ikinci yarısı, XVII əsrin əvvəllərində yaşayıb-yaratmış, görkəmli şair və sərkərdədir. 1536-cı ildə Bayburt mahalında dünyaya gəlib. Uzun ömür yaşamış, Yəzd vilayətinin hakimi olmuş, I Şah Abbasun hakimiyyəti illərində (1587-1629) dəfələrlə Səfəvilər dövlətinin ərazi bütövlüyü uğrunda döyüşlərdə iştirak etmişdir. Şeirlərində qürurla özünü qızılbaş adlandırıbdır.*

*Şairin Azərbaycan türkcəsində yazdığı şeirlər divanının yeganə nüsxəsi Londonun Britaniya muzeyində saxlanılır. Klassik şeir üslubunda yazdığı şeirlərdən başqa Əmani bir sıra xalq şeiri üslubunda yazdığı qoşma, gəraylı və bayatıların müəllifidir.*

## BAYATILAR

Bağça barın arzular,
Aşiq yarın arzular
Hər nə kim, dünyada var
Öz miqdarın arzular.
Məhəbbət meydanidə
Mənsur darın arzular.

* * *

Cananum tək can az var,
Aramızda min raz var.
Anda ərkü naz varsa,
Məndə əczü niyaz var.
Həzrət et, könül quşu,
Kəmində şahbaz var.

* * *

Yüzün göz rövşənidir,
Zülfün can cövşənidir.
Xəyalın ilən könlüm
Məhəbbət kövşənidir.

* * *

Yüzün gül xülasəsi,
Ləbin mül xülasəsi,
Ənbərfəşan kakilin
Tər sünbül xülasəsi.
Yazılmışda zatın
Cüzvü küll xülasəsi.

## GƏRAYLILAR

Eşq oduna yandı bağrım,
Yarəb, görəmmi didarın?
Dağdan ağır oldu ağrım,
Yarəb, görəmmi didarın?

Ey adı zikrül-lisanım,
Yadindin qut tapan canım,
Vaqifi-razi-nihanım,
Yarəb, görəmmi didarın?

Qaçıbdır gözlərdən xabım,

Gecə-gündüz yoxdur xabım,
Mətləbi-şeybü şəbabım,
Yarəb, görəmmi didarın?

Çünki bəzmindən irağəm,
Ölüyəm, noldu gər sağəm,
Qayətül-qayət müştağəm,
Yarəb, görəmmi didarın?

Əm etməkdən ötrü yarəm,
Daxi qalmadı mədarəm,
Səndən özgə yoxlur çarəm,
Yarəb, görəmmi didarın?

Tazədir hüsnün gülşəni,
Can bülbülü istər səni,
Fanidir şu dünya, fani,
Yarəb, görəmmi didarın?

Kilki-qəza rəqəm çaldı,
Məni səndən ayrı saldı,
Fələk intqamın aldı,
Yarəb, görəmmi didarın?

Hicri canıma kar edən,
Könlümü biqərar edən,
Bimarinə timar edən,
Yarəb, görəmmi didarın?

Əmaniyəm, sənin zarın,
Əzəlidin giriftarın,
Həddin ötdü intizarın,
Yarəb, görəmmi didarın?

* * *

Fələk rəğminə bir nəzər
Görsəm yüzün cananımın.
Qalmaz dərdü ğəmdin əsər,
Görsəm yüzün cananımın.

Həddin ötdü intizarı,
Qalmadı könlüm qərarı,
Canü dil olsun nisarı,
Görsəm yüzün cananımın.

Edipdür əndühi-hicran
Gərçi könlum pərişan,
Hər müşkülüm olur asan,
Görsəm yüzün cananımın.

Topu meyandin qapardum.
Yıxılanımı yapardum,
Könül istəgin tapardum,
Görsəm yüzün cananımın.

Dəvasız dərdin dəvasın,

Binəva könlüm nəvasın,
Tapam canım müddəasın,
Görsəm yüzün cananımın.

Dövləti-vəslinə fürsət
Tapubən məhv olsa firqət,
Əmani, çəkməzdim həsrət,
Görsəm yüzün cananımın.

* * *

Qəddü yüzün mənsux etdi
Qədrini sərv ilə gülün.
Verdi badə mişkin zülfün
Ətrin reyhanü sünbülün.
Ey sevgili sərvinazum,
Məhrəmi hər gizli razum,
Çarəsazum, dilnəvazum,
Sən gülsən, mənəm bülbülün.

Təbəssümlə qönçən açdun,
Xədan olub güllər saçdun,
Əql aparıb gözdən qaçdun.
Pərişan edib kakilün.

Bilmən nə cövhərsən, ey can,
Heyranındur mələk, insan,
Gərçi nihandansan nihan,
Aləmə düşmüş ğülğülün.

Hədsiz bitabı olmuşam,
Suzan kəbabı olmuşam,
Məstu xərabı olmuşam–
Ləli-ləbindən ol mülün.

Atəşin gül, cövrün çəküb,
Ğəm yeməgil, ey bülbül, köp,
Öylə saygil kim, köydürüp,
Gögər sarıdupdur külün.

Ta əsər var candan təndə,
Əmani qapında bəndə.
Mövcud etmiş çün həq səndə
Əslini cüzv ilə küllün.

* * *

Fürsət olicaq həm dəmdə
Ğənimətdür səfa sürmək.
Könül əylənməsə qəmdə,
Ğənimətdür səfa sürmək.

Suri-yarı həmraz edib,
Müğənnilər dəmsaz edib.
Mütrüblər həmavaz edib,
Ğənimətdür səfa sürmək.

Söhbət olqac əzmi-cəzmə,

Əcnəbini qoyma bəzmə,
Keyfiyyətsiz bir dəm gəzmə,
Ǧənimətdir səfa sürmək.

Yenə gəldi bahar fəsli
Eyş etməkdir anın əsli,
Müyəssərin olsa vəsli,
Ǧənimətdir səfa sürmək.

Dürüst olicağız yəqin,
Taparsan könül istəyin,
Seyr eylə məhəbbət bağin,
Ǧənimətdir səfa sürmək.

Eşq bimarının timarı,
Kam ilə görməkdir yarı,
Asan edər hər düşvarı,
Ǧənimətdir səfa sürmək.

Eşq oduna yanan sönməz,
Gedən günlər geri dönməz,
Ömrün quşu uşdu qonmaz,
Ǧənimətdir səfa sürmək.

Dünyanın yoxdu vəfası,
Zahir degil müddəası,
Hər bəqanın var fənası,
Ǧənimətdir səfa sürmək.

Varlığını saygil fani,
Məhəbbət məqamın tani,
Əhli-hal ilə, Əmani,
Ǧənimətdir səfa sürmək.

* * *

Hicran kar etdi canıma,
Bilmən nolacaqdır halım.
Dövran susadı qanıma,
Bilmən nolacaqdır halım.

Bari-qəm qəddim xəm etdi,
Səbrü aramım kəm etdi,
Xarü zari-aləm etdi,
Bilmən nolacaqdır halım.

Füzun cümunəm Məcnündan,
Seyli-müjganım Ceyhundan,
Əfǧanım ötdü gərdundan,
Bilmən nolacaqdır halım.

Halətim ibrət olubdur,
Rahətim möhnət olubdur,
Adətim riqqət olubdur,
Bilmən nolacaqdır halım.

Göz görmək istər cəmalın.

Könüldə daim xəyalın,
Müyəssər olmaz vüsalın,
Bilmən nolacaqdır halım.

Ayrılıq yulduzu batmaz,
Gecə vayimdən el yatmaz,
Sənsiz könül nəstə çatmaz,
Bilmən nolacaqdır halım.

Firqətindən, canım cani,
Ahum tar etdi cəhani,
Zarəm manəndi-Əmani,
Bilmən nolacaqdır halım.

* * *

Lütfi-pərvərdigarimdən
Könül istədügin tapdım.
Əsəri-ahü zarimdən
Könül istədügin tapdım.

Çəkdim gərçi dərdi-hicran,
Hədsiz edib ahü əfğan,
Mədəd olub feyzi-sübhan,
Könül istədügin tapdım.

Rəvan olurdu gözdən nəm,
Çəkər idim dərdü ələm.
Bihəmdilləh, rəf olub qəm,

Könül istədügin tapdım.

Mənəm, yarəb, səubətdən,
Yüz dürlü dərdü möhnətdən,
Qurtulub cəngi-firqətdən,
Könül istədügin tapdım.
Rəvan olğac qəddi-dalum,
Səmərlər verdi nihalum,
Müddəaca olub halum,
Könül istədügin tapdım.

Təqribsiz irir beğayər,
Etmək taledən şikayət,
Çün befeyzi-binəhayət,
Könül istədügin tapdım.

Tökülən gərçi dolmadı,
Düşmən deyən həm olmadı,
Məhəbbət gülü solmadı,
Könül istədügin tapdım.

Əmani, məqsədi-mühsəl,
Oldu həsbül-vəchi-əshəl,
Bu səadət yetər mücməl,
Könül istədügin tapdım.

* * *

Ahü əfğandır həmdəmim

Sevgili yarımdan ayrı.
Nəhayətsin oldu qəmim
Sevgili yarımdan ayrı.

Giriftarəm əcəb halə,
Sevdam yoxdur mülkü malə,
Ney dik bilmən qeyri-nalə,
Sevgili yarımdan ayrı.

Tabü təvanım qalmadı,
Bədəndə canım qalmadı,
Ahü fəğanım qalmadı
Sevgili yarımdan ayrı.

Nə yuxlaram, nə oyağam,
Nə sayruyam, nə xud sağam.
Ğəm zindanında dutsağam
Sevgili yarımdan ayrı.

Bisərü saman olmuşam,
Saralmış xəzan olmuşam,
İyəsiz filan olmuşam
Sevgili yarımdan ayrı.

Fələk, eylədün bildigin,
Canıma qoydun min dügün,
Zarlığdur işim dünü gün
Sevgili yarımdan ayrı.

Lal olmuş bülbülə döndüm,
Pərvanə dək yandım, söndüm,
Filməsəl, düz yurda qondum,
Sevgili yarımdan ayrı.

Yoxdur, Əmani, səri-mu,
Mehrim olsa gər yüz məhru,
Cənnət gülün eyləmən bu,
Sevgili yarımdan ayrı.

* * *

İxtiyarım əldən alan,
Şükrülillah, gördüm səni.
Məni hicr oduna salan,
Şükrülillah, gördüm səni.
Məşğul olub xəyalına,
Müştaq idim camalına,
Şərəf tapıb vüsalına,
Şükrülillah, gördüm səni.

Məlahət övcünün mahi,
Könül kişvərinin şahi,
Məhəbbət püştü pənahi,
Şükrülillah, gördüm səni.

Könül yetişdi kaminə,
Dan atdı möhnət şaminə.
Rüxsətdir hicr əyyaminə,

Şükrülillah, gördüm səni.

Bitaqət olub ğayətsiz,
Müştaq idim nəhayətsiz,
Təkəllifsüz, hekayətsiz,
Şükrülillah, gördüm səni.

Vəslin könül müddəasi,
Dəvasız dərdin dəvasi.
Mehrü məhəbbət cəfasi.
Şükrülillah, gördüm səni.

Sirdaşımız olan qardaş,
Könül istədigi yoldaş,
Fəda yoluna canü baş,
Şükrülillah, gördüm səni.

Göz, könül yüzün heyrani,
Sənsən canımın canani,
Rahəti-ruhi-Əmani,
Şükrülillah, gördüm səni.

## QOŞMA

Bahar olu, tazə güllər açıldı,
Sərvinazım, sallanubən seyr elə.
Şükufə övrağı hər yan saçıldı,
Sərvinazım, sallanubən seyr elə.

Can bəslənir etidali-həvadın,

Dərdli olan çəkməz minnət dəvadan,
Hər məqamda qulaq dolar nəvadan,
Sərvinazım, sallanubən seyr elə.

Müəssərdir əndəlibdən nalələr,
Saçmış incü səbzə üzrə lalələr,
Eşq odundan dağlar qoymuş lalələr,
Sərvinazım, sallanubən seyr elə.

Hər səhfəsin tərtib etmiş gülün ğeyb,
Öylə kim heç tapmaq olmaz anda eyb,
Ğənimətdür yetişməgəy vəqti-peyb,
Sərvinazım, sallanubən seyr elə.

Yaz fəslində səhər quşlar əlhani,
Mədhuş edər idrak edən insani,
Bitəkəllüf xürrəm olsun Əmani,
Sərvinazım, sallanubən seyr elə.

Ağzın sirrin qönçə güya eyləmiş,
Qəmzən sehrin nərgis peyda eyləmiş,
Laləni rüxsarın rüsva eyləmiş,
Sərvinazım, sallanubən seyr elə.

Xürrəm olmuş səbzələrdin hər vadi,
Əndəlibi nalan etmiş gül yadi,
Xəcil etgil ərər ilə şümşadi,
Sərvinazım, sallanubən seyr elə.

* * *

Yüz sürüb gedər olduq imamə,
Sidqi rəhbər edib, könül, əzm elə.
Yol verdi, məşvərət etdük kəlamə,
Sidqi rəhbər edib, könül, əzm elə.

Bu yol gedən qılmaz lafi-kəzafi,
Canu dildin olur sufiyi-safi,
Yetmiş həccdür İmam Riza təvafi,
Sidqi rəhbər edib, könül, əzm elə.

İnsü cinn ol həzrətin bitabidür,
Samini-zamin anın əlqabidür,
Kəbeyi-dil rövzəsinin babidür,
Sidqi rəhbər edib, könül, əzm elə.

Astanidürür mülki-aşiyan,
Anda zairlər taparlar tazə can,
Bu səadətdən bolub əhli-cinan,
Sidqi rəhbər edib, könül, əzm elə.

Ğübari-kuyinin çoxdur xəvasi,
Ona yetən tapar ğəmdin xilasi,
Zairi olan olur xaslər xasi,
Sidqi rəhbər edib, könül, əzm elə.

Əltafidin bir qətrədür dəryalər,
Rövzəsidə bina olur əmalər.

Dərgahində vardür yüz min şeydalər,
Sidqi rəhbər edib, könül, əzm elə.
İki aləmdə sərəfraz olmağa,
Təəllüqlərdin biniyaz olmağa,
Gecə-gündüz zikrə dəmsaz olmağa,
Sidqi rəhbər edib, könül, əzm elə.

Ümmid oldur ki, yüz dərgahə yetə,
Bu mənlik məhv olub can şahə yetə.
Şahına yetən nəfsin Allahə yetə,
Sidqi rəhbər edib, könül, əzm elə.

Möcüzünün yoxdur həddü payani,
İzhar etmək olmaz sirri-nihani,
Vəfa qılmaz çün heç kimə bu fani,
Sidqi rəhbər edib, könül, əzm elə.

İki saymaz həqqin birligin bilən,
Nəstə çatmaz mənlik dəvisin qilən,
Bilmək üçün şəni həqiqət ilən,
Sidqi rəhbər edib, könül, əzm elə.

İki aləm şahənşahıdur ol şah,
Yüzün ona dutana olur pənah,
Xövf imsə gər yer yüzün dutsa sipah,
Sidqi rəhbər edib, könül, əzm elə.

Vird eyləgil həqqin Quranı ilən,
Ziyarət şərtini bəyani ilən.

Əfvi-günah üçün Əmani ilən
Sidqi rəhbər edib, könül, əzm elə.

## MƏNZUM HEKAYƏ

Ravi nağıl etdi kim, iflas ara,
Bir kişi qalmışdı həzin daima.
Faqəvü fəqr əlgida zarü nizar,
Əhlü əyalidən olub şərmsar.
Ölimiğə razı olub hər zaman,
Başlar idi möhnətidən yüz fəğan.
Gərçi bəsi müflis idi, lakin ol,
Tame olub kimsəyə sunməsdi qol.
Eyləməyib söhbəti-xəlq ixtiyar,
Qanei-bir qürs idi leylü nəhar.
Zəfü riyazətdin olub bəs zəbun,
Tapmadı ol qürsünü həm neçə gün.
Nagəh edib xatirin ümmidvar,
Gəldi bedərgahi-şəhi-kamgar.
Ol ki, cəhan içrə olan çün cəhan,
Maziü müstəqbəli bilgən əyan,
Cədlərinin biri həbibi-cəlil,
Biri həm əqsamkəni-səlsəbil,
Həzrəti-Zəhra ana ümmi-əli,
Əmmi-təbari Həsən ibn Əli,
Şahi-şəhidan atası bigüman,
Madehi-Cibril əmin hər zaman,
Yəni ki, səccadi-əleyhissəlam,
Hamiyi-din, varisi-xeyrül-ənam.

Mömini-dərviş cəmalın görüb,
Səcdeyi-şükr etdi iraqdan durub.
Hacətə əl qaldıb etdi dua,
Mədhü sənadin sora ol binəva.
Əcz ilə biçarəliq izhar edib,
Didələrin əbri-göhərbar edib,
Dedi ki, ey sahibi-təxt ilə tac,
Bir sürük oğlum, uşağım bardur ac.
Cümləsi der: bizgə gərəkdür xörək,
Hiç cəhətdən tapaman bir çörək.
Ömür keçib, görməmişəm salü mah,
Şölə evim içrə yaxar bərqi-ah.
Qissəsidən ğüssələnib şahi-din,
Tökdü əqiq üstüğə dürri-səmin.
Boldü xəcil söyləgənindən fəqir,
Gördü çü riqqət edər ol binəzir.
Tərki-ədəbdür-dedi minbəd qal,
Yerni öpüb getdi ol aşüftəhal,
Yolda çü həmsayələr uğraşdılar,
Getməkü gəlməkni xəbərlaşdılar,
Dedi: Ğəmim şərhlərin ibtida
Çün elədim, halıma qıldı büka.
Çün görüb ol növ onı min özüm,
Öznü unutdum, daxi bilməy sözüm.
Nagəh o halət içidə bir füzul –
Kim, bardı xarici ol naqəbül.
Hiylədə iblisğə ustad idi,
Xatiri qeybət deməgə şad idi,
Dedi, bəsi laf edər imamınuz,

Büləcəb ol kim, berəməs kamınuz.
Çün nəzər etsə zər olur tirə xak,
Neyçün edər giryəni ol zati-pak?
Mömini-müflisğə ləinin sözü
Gəldi yaman, dedi, yaşarıb gözü:
 – Key siyəhüzlü səgi-pürkibrü kin,
Nəhsi-dəğəl, fasiqi-biəqlü din,
Söylədin ər büğzü həsəddən yaman,
Mahğə it əf-əfidən biziyan.
Möminin oldu çü imam yarici,
Boldu peşiman sözüdən xarici.
Yoldan edib övd bedərgahi-şah.
Barmadı öz eviğə ol mərdi-pah.
Yetgəc öpüb sidq ilə dərgahini,
Gördü əyan əncüməni-şahini.
Əmr ilə çün məclisara tapdı bar,
Qıldı həzin xatirin ümmidvar.
Etmədin izhar mübahislərin
Söylədi əshabğə şəh cümləsin.
Ta kim, ola kor ləinlər gözü,
Rəmzi-vilayət bilə həzrət özü.
Berdi zibədi-həmə göftü şinov
Mömini-müflisğə iki qürsi-cov.
Dedi ki, bu qürsləri həq-cələb
Vüsəti-rizqinğə qılıbdur səbəb.
Qürsləri aldı, fərəhnak olub,
Eviğə əzm eylədi, çalak olub.
Qürslər irdi çü bəsi xüşkü səxt,
Dedi: həman beh ki, qılam ləxt-ləxt.

Əl və tişi qürslər ilə sitiz
Qıldı bəsi, leyk qoparmadı çiz.
Yetdi çü bazarğə şare ara,
Gördü balıq satğuci bimacəra.
Mücibi-şər ilə edib şərti-əqd,
Bey qılır balığı bacinsü nəqd.
Yanığa barıb dedi: - Key pakdin,
Ya rəb, olurmu ki, bu qürsün birin
Lütfü tərəhhümlə bevəchi-Həsən,
Alğasənü bizgə balığ bergəsən?
Gördü ki, əcz ilə qılır iltica,
Qürsü alıb, balığı berdi ana.
Tapmuş idi mətni-əzim ol səmək,
Müşkül idi binəmək anı yemək.
Möhnətü rənc ilə yetib caniğə,
Gəldi fəqir tuz satanın yaniğə,
Söylədi bir qürsni həm sən alıb,
Ətəgimə gər bir avuc tuz salıb,
Göndərə bilsən məni evim sarı,
Şad olur oğlum-uşağum barı.
Həsbi-rizası bilə ol tuzsatan,
Evi sarı eylədi anı rəvan.
Eviğə gəltürdi bilareybü şək,
Mömini-dərviş səmək banəmək.
Pak edər ikən səməki gördü kim,
Çıxdı içidən iki dürri-yətim.
Gövhəri-nayab olar irdi bəs,
Qiymətini bilməs idi hiç kəs.
Ləl ilə yaqut rəvacı idi,

Hər biri yüz mülk xəracı idi.
Dürləri alğac ələ ol mərdi-rah
Səcdeyi-şükr etdi, dedi: Ya ilah.
Ali-əba hörməti üçün mana
Lütfi əta kim, elədin xəlq ara,
Min yil əgər şükr desəm mən həmin
Söyləyə bilmən daxi mindən birin.
Əndühi-iflasdin azad olub,
Öz-özü birlə der idi şad olub:
Mən kibi barmola muradın tapan,
Möhnəti rahəttə mübəddəl bolan?
Oğlu, qızı, övrəti sönüşdülər
Zümzümələr edibəni coşdülər.
Od və odun təbx üçün gəlturub,
Cümleyi-əsbabı mühəyya qılub,
Balığı pakizə yuyub biqüsur,
Büryan edib, asdılar, dərtənur.
Açmamış ikən o, tənurin başın,
Gördü ki, bir kişi dögər qapısın.
Dedi: nə istərsən, aya mərdi-hürr?
Söylədi kim, aç qapını, xeyrdür.
Qapı açıb bir-biri çün gördülər,
Əczü təvazö edibən durdular.
Dedi o, dərvişğə: Mərdi-əziz,
Qürslərindən yemək olmadı çiz.
Söylədilər balığ ilən tuz verən,
Bu iki qürsü ol əsri-mühən.
Qut eləsin həmrəhi-əhlü əyal,
Balığü tuzni ana qıldıq həlal.

Qürsləri aldı, bolub şadkam,
Xeyr-dua qıldı olarğa tamam.
Evə gəlib şərhini başdan əyağ,
Söylədi, fəhm eylədi oğul-uşaq.
Zövq sədasın buraxıb dərcəhan,
Söylədilər, cümlə bolub yekzəban:
Şükr həqin dərgəhibə kim, çenin
Eylədi mümtaz bizi barcədin.
Cümləsi balığ ətidin toydular,
Münkirinin gözlərini oydular.
Şamgəh irdi ki, birav nagəhan
Gəldi, dedi: Qürsləri, ey filan,
Şah buyurdu ki, gətirsin bilə,
İstəgini tapdı çün ol sidq ilə.
Dürlərü qüsrlərin alıb əligə,
Mədhü səna vird qılıb tiligə,
Rəmzi vilayətə sərəfraz olub,
Düşdü yola, sidq ilə dəmsaz olub.
Zövqü sürur ilə edib qəti-pah,
Gəldi fərəhnak bedərgahi-şah.
Tutdu ədəb şərti bilə bir zəman,
İndədilər məclisara nagəhan.
Qürslərü dürləri məcməara,
Zahir edib dedi: Əya rəhnüma,
Əvvəlü axırda bu iş tərhini
Çünki bilirsən, nə deyim şərhini.
Şah dedi kim, qürsləri ver geri.
Bardurur munda ərənlər siri.
Timək onu özgəgə düşvar irür,

Biri sühurü biri iftar irür.
Həq çü yetirdi nəsibin ğeybdən,
Cümlə işin xali irir eybdən.
Dürləri et vəchi-məaş özünə,
Rizq eşşigin açdı çü həq qüzünə,
Həqdin olur bəndəğə çün lütfi-xas,
Qəmdin edər bir səbəb ilən xilas.
Əmr sənindir, dedi, ya şahi-din,
Hər nə ki, hökm eyləsən oldur güzin.
Dürlər alıb, qürsləri tapşurub,
Qopdu evi sarı bəsi şad olub,
Gecə çü keçdivü səhər urdu dəm,
Getdi könül güzgüsidin rəngi-ğəm.
Nagəh uş ol hal içidə bigüman,
Yetdi qəzadan bir ağır karivan.
Mömünə çün lütfi-əbəd yar idi,
Taleyi imdadı bilən bar idi.
Qafilənin ortasidə bir kişi –
Kim, dürr alıb-satmaq irürdi işi,
Simü zəri vəznü ədəddin bürun,
Bəlkə nə kim, til degəy andan füzun.
Küçəvü bazarğə saldı nida,
Kimdə ki, bar ləlü düri-bibəha,
Gəltirib alsın əvəzin zərrü sim,
Həsbi-rizası bilə bivəhmü bim.
Berdi nişan xacəğə bir cövhəri –
Kim, filanındür iki gövhəri.
Qılmamış heç əsrdə ğəvvasi-əql,
Bəhri-təxəyyüldin olar təkni nəql.

Eşidib ol sözni cəvahirfüruş
Eylədi beyətiğə rəhn əqlü huş.
Dedi ki, ey müjdədəhi-bimisal,
Lölölərin sahibi ola mərdi-hal.
Nerdə isə dur gedəli tezrəgin,
Sərf edibən simü zərin barcəsin,
Dürlər alıb ğeyr ürəgin yaralı,
Dünyada bir ad qoyuban baralı.
Getdilər ol möminin evi sarı,
Xacə bilən əncümən əhli barı.
Bədi mülaqatü təvazö bəsi
Etib uş ol mömin ilən cümləsi.
Söylədilər: Gəlmişüz, ey möhtərəm,
Lölöyi-şəhvarlar üçün bu dəm.
Vüsəti-rizq olmuş olar çün sizə,
Hər nə ki, məqsud irir al ver bizə.
Müştərinin sözlərini istima
Etdi, dedi: - Bey üçün min niza
Eyləməyibdir, beribən biğərəz,
Hər nə mürüvvətdisə bergil əvəz.
Xacə dedi: - Mən daxi, ey pakdin,
Hər nə ki, bar cümlə tüfeyl eyləyin.
Hikməti-sidq əmridə haziq bolub,
Bir-birinin qövliğə sadiq bolub,
Əqdi-üxüvvət tutub əzcanibeyn
Eylədilər əhdi-könül fərzi-eyn.
Lölöləri mömini-paketiqad
Dərnəzəri-xaceyi-nikunəhad
Hazır edib, eylədi təklif çün,

Xacə həm etdi ki, nəfini bütün:
Aləmara sən kibi bir gerçək ər
Görəmədim, munca ki, qıldım güzər.
Bu ni sifət mehrü məhəbbətdürür,
Bu ni degən lütfü mürüvvətdürür.
Şadlığ əşkin axıdıb gözidən,
Tüşdü əyağığa, barıb gözidən,
Tapdı o halət içidə özgə hal
Xaceyi-fərrüruxi-şirinməğal.
Söylədi: - Xadimlər, olur tez rəvan,
Dünyəliğim hər nə ki, bardur zəman,
Gəltürünüz uşbu mənazil sarı,
Mömin əximğə hibə qıldım barı.
Mucibi-fərman ilə bimacəra,
Eylədilər hazır o məclisara.
Simü zəri-bihədü əcnasi-xas,
Hər biri bir yerdən olub ixtisas.
Əncümən əhli görüb andaq xisal,
Büləcəb işdir dedilər uşbu hal.
Leyk olar mənliği eyləb hiba,
Şahi-vilayətğə qılıb iqtida,
Gənci-həqiqətdən olub bəhrəvər,
Simü zərü lölöğə qılmab nəzər,
İkisinin könlü bilə bir bolub.
Bir-birini əyağığa baş qoyub
Söylədilər ta bola candan rəməq,
Şərt bu kim, bir nəfəs ayrılməyəq.
İkisi icabü qəbul eyləyib,
Nəfsi könül şahiğə qul eyləyib,

Bir-birinin həsbi-rizası bilə
Ömrünü sərf eylədilər sidq ilə.
Səyi-Əmani həm odur kim, qıla
Yari-vəfadarığa canın fəda.

## QƏZƏLLƏR

Bir təbəssüm birlə huşum aldı duş ol nuşləb,
Valehü şeydayi olsam ta əbəd irməs əcəb.

Canü dil qurban ona kim, bir nəzərdə fəhm edər
Müddəanı nüktədanlıq birlə bihüsni-tələb.

Bisəbəb irməs başımla gəlməgim pabus içün,
Astanınğa ğədəm basmaq irir tərki-ədəb.

Bu səadət ikki aləmə yetər min zarğə –
Kim, vəfa əhli səgi-kuyin qoyubdurlar ləqəb.
Aşiqi-dilxəstənin baliniğə canan qədəm
Bassa, sidq ilən nisar edər rəvanin bitəəb.

Kim ki, məsti-peyxumari-badeyi-vəhdət olur,
Mütləqa meyli iməs kim, şürb edə mai-inəb.

Ey Əmani, bir nəfəs aramım olmassa, nə tan,
Hicr bimarı olan bolmas dəmi bitabü təb.

* * *

Məni dövrani-fələk eylədi bimarü qərib,
Əcəbüm bar kim, ola dövəti-didar nəsib.

Könlümün dərdini bilmən nə mərəzdir, ya rəb –
Kim, əlacını anın tapmadı heç növ təbib.

Ey rəfiq, eyləmə rüsvalığımı mən ki, bar
Afəti-dinü dil ol qəmzeyi-pürməkrü fərib.

Eşq divanəliğin tərk edə bilmən hərgiz,
Boldu Məcnunğə cünun haləti çün zinətü zib.

Müşfiqa, sakini-beytül-həzənəm, peyvəstə,
Bidilü zarü həzin bolduğumu sanma əcib.

Hiç bab ilə könül, qəm yemək irməs hacət,
Səhl irür cümlə günəh bolsa əgər lütfi-həbib.

Müğtənim bilgil, Əmani, ğəmi-eşqi təğyir
Tapmadı, hər necə səy eylədi bidilğə ədib.

* * *

Sabitqədəm olsa aşiqi-zar,
Didarını görsədir ana yar.

Hicran qəmi aşiqə degil səb,
Gər tapsa vüsali-bəzmiğə bar.

Məşuq ilə aşiqin ədasın
Eşq eylədi aləm içrə izhar.

Ol kimsə bilir nədir təəşşüq,
Mənzuri-nəzərğə bar giriftar.

Ğayib olalı yüzü gözümğə,
Mehr ənvarı dolubdurur tar.

Ol aşiqə eşq irir müsəlləm,
Öz halətidin degil xəbərdar.

Ya rəb, qəmi-hicrdin, Əmani,
Barmola sənin kibi diləfgar?

* * *

Könül əfqan edib cananın istər,
Beğayət dərdi bar, dərmanın istər.

Gözün giryanlığı irməs əcəb kim,
Şüküftə qönçeyi-xəndanın istər.

Kəməndi-mürği-ruh üçün dili-zar
Şikənci-türreyi-piçanın istər.

Yürək qanı təəşşüq aləmindən
Səhami-ğəmzənin peykanın istər.
Zəmirim müttəsil can ərsəsidə

Səməndi-nazının cövlanın istər.

Güli-rənaya bax kim, bülbülünün
Həmişə naləvü əfğanın istər.

Zəvali-möhnəti-hicran görüb can
Vüsal əyyamının tüğyanın istər.

Xəyali-zülfidə əjdər kibi dil
Məhəbbət gəncinin viranın istər.

Təəllüqsüz iməs heç kim cahanda
Əmani nəzminin divanın istər.

* * *

Bu fənadə beş gün üçün başda yüz sevda nədür?
Çün degil baqi, xəyali-məskənü məva nədür?

Ey xoş ol şeyda ki, canan eşqinin sevdasidin
Etməmiş idrak kim, dünya bilən üqba nədür?

Əks-mirati-cəmalın hər nəfəs bir vəch ilə
Cilvəgər edər, günahi-aşiqi-şeyda nədür?

Öylə müstəğrəq bolubmin eşq istilasiğə —
Kim, könül məllahı bilməz sahilü dərya nədür?

Silki-əhli-eşqə sayılmaq dilərsən, ey könül,

Dərdə xürsənd ol, dəmadəm ahü vaveyla nədür?

Yox çü ümmidi-əsər nəşvü nümadən danlaqa,
Bülbüli-şeydayə, ey gül, munca istiğna nədür?
Qürb ümidi birlə canan kuyinin ətrafidə
Xakə yeksan ol, Əmani, özgə istida nədür?

* * *

Xoşvəqt bol, ey dil, yenə canan gələcəkdür,
Nabud olan cism eviğə can gələcəkdür.

Hicran ələmidin, könüla, olma pərişan,
Çün aqibət ol nadiri-dövran gələcəkdür.

Bitab irir zərrə sifət can quşu daim,
Ol zövqə ki, xurşidi-dirəxşan gələcəkdir.

Hicran gecəsi tirəliğidin yemənəm qəm,
Axır yanıma çün məhi-taban gələcəkdür.

Bu qönçə sifət könlümə qəmxarı irür səhl,
Xürrəm yenə çün ol güli-xəndan gələcəkdür.

Pünhan neçük olğay tələbim qeyridin, ey dil,
Rəğmiğə anın yar-nümayan gələcəkdür.

Rəhm eylə Əmaniğə, əcəl, alma rəvanın,
Çün yaniğə ol sərvi-xuraman gələcəkdür.

* * *

Yüz tuman möhnət ilən qalmışam, ey can, sənsiz,
Dünü gün könlüm edər naləvü əfqan sənsiz.

Tanriçün, ey qədi tuba, yüzü gül, zülfü səmən,
Yetə gör, göydü məni atəşi-hicran sənsiz.

Hicr vadisidə qəmxarləridən, ey gül,
Yurəgüm qönçəsifət boldu, tola qan sənsiz.

Könülə lalə tügün, didəğə gül boldu tikən,
Seyri-bağ etməsəm, ey sərvi-xuraman, sənsiz.

Ömr yüz möhnət ilən keçdi, vəli bilməsmin,
Aqibət necə bolam bidilü nalan sənsiz.

Şərh edər cənnəti vaiz, vəli bilməs anı kim,
Eyləməs meyl ana aşiqi-heyran sənsiz.

Etməsən rəhm Əmaniğə, anı hicr qəmi,
Varlığından yox edər, ey məhi-taban, sənsiz.

* * *

Ey səba, halımı qıl yarıma ərz,
Dilimin dərdini dildarıma ərz.

Çəkdigim möhnəti-hicran sitəmin
Edə gör qəmzəsi xunxarıma ərz.

Necə bir şərh qəmümni eləsin
Cani-nalan dili-əfgarıma ərz?

Bu məratibğə fələkdən yetdim
Halım iqbal edər idbarıma ərz.

Ey Əmani, mana bu fəxr yetər,
Edərəm sirrimi səttarıma ərz.

* * *

Bu fəsli-baharın yenə xoş çağına bax,
Bağ içrə şükufələrnin iqraqına bax.

Bir sərvqəddi-səmənü bir laləüzar,
Naz ilə xuramaq olıcaq sağına bax.

Ol şuxi-pəripeykəri-gülruxsarın
Divanə olan aşiqi-müştağına bax.

Mehrabi-könül eyniğə bolğan əzəlidən,
Göz ucidə əbrulərinin tağına bax.

Rəngin yürəgim qanı bilə etmişdür,
Ol şüxi-kamandar oxunun fağına bax.

Bəz əhlini məstü naşəkiba eyləgən,
Şol badə verən saqinin iqrağına bax.

Kəm eyləmədi mərhəmətni halimdən,
Xublar şəhnin, Əmani, işfağına bax.

* * *

Xoşhal bol, ey dil, yenə canənə irişdük,
Fərsudə bolan cism kibi canə irişdük.

Dərdü qəmi-hicranə dəxi tab yox irdi,
Əlminnətülillah ki, dərmanə irişdük.

Ol bülbülü-dey zülmünü görgən kibi nagəh
İmdadi-bahar ilə gülüstanə irişdük.

Ğəvvas oluban daldıq əgər bəhri-sirişkə,
Əcr olmadı zaye, düri-ğəltanə irişdük.

İstəklərimiz cümləsi mövcud olacaqdur,
Çün bəzmgəhi-işrətə rindanə irişdük.

Can nəqdini isar edəlim gəlgil, Əmani,
Şəmi-rüxi-cananə çü pərvanə irişdük.

* * *

Eynüm yüzünə olalı heyran,

Əqlim çaşub, olmuşam pərişan.

Lölö dişinə deмək xətadır,
Ləli-ləbinə həm abi-heyvan.

Ya rəb, gün irürmü, ya tolun ay
Yüzün ki, ziyasın eylər ehsan?

Qaşu gözü xəttü xal birlə
Qıldın dilü könlümü şitaban.

Lazım məni-tilbəğə bolupdur
Leyl ilə nəhar ahü əfğan.

Yoxdur çü mənim kibi diləfgar,
Yalğızca qalan əsirü nalan.

Bu haləğə xoşdiləm kim, irməs
Bitablığım yanında pünhan.

Yeksan elədi təəşşüqi-eşq
Yadınla könülğə vəslü hicran.

Gözümğə iki cahan görünməs
Gərmi-nəzərin olanda, ey can.

Oldu səni görgəli Əmani
Avarə miyani-küfrü iman.

* * *

Ey könül, çün heç kimə qılmaz vəfa axır cəhan,
Öylə san gördün mükərrər min bəhar ilən xəzan.

Arifə fərq eyləməz ömrün çoxü az olduğu,
Çün müyəssər bolmas insanğa həyati-cavidan.

Hatifi-lareybdin yetdi nida can guşiğə:
Məhmili-məqsud keçdi, yatma, ey qafil, oyan.

Çünki rəzzaq eyləmiş məqsum hər şey rizqini,
Minnəti-dunan neçün çəkmək gərək bəhrü-dü nan?!

Bir səri-mu eyləmək bolmaz bəyani-şükrünü,
Hər səri-mu bolsa şükrün etməgə yüz min zəban.

Ömr anın yadı bilə sərf et, sağın əğyardən,
İstəsən kim, ikki aləmdə bolasın kamran.

Ey Əmani, yardan bir ləhzə ğafil bolmagil –
Kim, ötər ömrü yetər səngi-əcəl, berməs aman.

* * *

Gəlgil, ey dərdi-dilə dərman edən.
Vəsli birlə müşkülüm asan edən.

Mən əsiri-zarni pərvanə dik
Nuri-rüxsarınğa sərgərdan edən.

Bəhri-qəmdə eşq ğəvvası üçün
Daneyi-əşkim düri-ğəltan edən.

Sünbülü nərgis bilə oldun, büta,
Canü dil aşüftəvü heyran edən.

Aqibət tapğay həyati-cavidan
Sidq ilə canın sana qurban edən.

Gülşəni-hüsniğə könlüm mürğini
Əndəlibi-valehi-nalan edən.

Dün gecə növhəm eşitgəc dedi kim:
Bu Əmanidir yenə əfğan edən.

* * *

Heç kişi aləmdə məhcür olmasun,
Dövləti-didardin dur olmasun.

Hər nə varid olsa şeyda aşiqə,
Səhl irir, tək hicrə rəncur olmasun.

Mehri-rüxsarindən özgə zərrəcə
Gözlərimğə, ey pəri, nur olmasun.

Sevdigi bidadidin aşiq fərəh
Tapmasa, aləmdə məsrur olmasun.

Mümkün irməs aşiqin rüsvalığın,
Desələr, aləmdə məşhur olmasın.
Qəsdi-azar eyləyibdir müddəi,
Yarəb, ol haliğə məqdur olmasın.

İştahayi-kamil olğac əks üçün,
Kasə bəs çiniyyi-fəğfür olmasın.

Qıl süluk öylə ki, bədi-rehlətin
Ğeyri-zikri-xeyr məzkur olmasın.

Ey Əmani, səy qıl, azürdədil
Səndən heç vəch bir mur olmasın.

* * *

Bu nə mətləb, dilistandur bu,
Bu nə aşub, əqlü candur bu.

Bu nə müjgan ki, tiri-pərrandur,
Bu nə əbru ki, çün kəmandur bu.

Bu nə məhruy, mehrtələtdür,
Bu nə dilcuy, nüqtədandur bu.

Bu nə ləli-ləbü nə mərcandır,

Bu nə göftar, dürfəşandır bu.

Bə nə xalü nə xətti-cadudur,
Bu nə nərgiz, nə sünbülandur bu.

Bu nə rəftaru qəddü qamətdür.
Bu nə nazik, nə mumiyandur bu.

Bu nə aşiq bolan Əmanidür,
Bu nə bitabü natəvandur bu.

* * *

Hər kişinin tinəti kim, əsldən pak olmasa,
Büləcəb irməs, əgər ol sahibidrak olmasa.

Möhnəti-dami-bəladin olmasın hərgiz xilas,
Mürği-dil, cananiğə gər seydi-fitrak olmasa.

İki aləmdə dəvasız dərdə, ya rəb, uğrasın,
Bu könül gər yar cövridən fərəhnak olmasa.

Qanevü xürsənd bolmas tamei-dun cifədin,
Ta kim, axır gözləri qəbr içrə pürxak olmasa.

Tan iməs, qəllaş bolsa himmət əhli dəhrara,
Mal cəm olmaz, əgər zimnidə imsak olmasa.

Bolsa taətdə hüzuri-qəlb hasil, səhl irür
Şanəvü təhtül-hənək, təsbihü misvak olmasa.

Ey Əmani, budü nabudin müsavi saygilən,
Köksü tiği-eşqdən hər aşiqin çak olmasa.

* * *

Cananə deyir qalmagilən canə bizimlə,
Bifaidədür söyləmək əfsanə bizimlə.

Xudrəyliğin qoymadı heç növ ilə əldən,
Çün rast degil bu dili-divanə bizimlə.

Həm mötəqidi-zahidü həm piri-müğanüz,
Yarəb, nə qılay məşrəbi-rindanə bizimlə?

Vəslini könül birlə təxəyyül edəriz, leyk
Mümkün degil ol şux ola həmxanə bizimlə.

Görgəc səgi-kuyini təməllüq əcəb irməs,
Çün hər tün edər tövri-mühibbanə bizimlə.

Dil kami bilə köyməgə ol şəm ğəmində,
Çalışmadı sübh olquca pərvanə bizimlə.

Mötad bolubdur, edəməz tərk, Əmani,
Fəttanlığı ol nərgisi-məstanə bizimlə.

* * *

İstəsən cananını, can istəmə,
Çəkgilən dərdini, dərman istəmə.

Dünyəvi üqbadən oldur çün murad,
Anı istə, küfrü iman istəmə.

Aşiqa, gər etiqadın eşqə bar,
Sadiq olgil, vəslü hicran istəmə.

Çün xoşəlhanlıq iməs bülbül müdam,
Xarə xürsənd ol, gülüstan istəmə.

Ey səba, dağıtma müşkin sünbülün,
Əhli-aləmin pərişan istəmə.

Ey Əmani, zərrəcə azari-dil
Nisbəti-heyvanü insan istəmə.

* * *

Fürsət olsa söylə, ey badi-səba, canana,
Sənsiz ol bidilü məhcur yetibdür canə.

Aqibət vadiyi-həsrətdə ğəmi-hicrandin,
Oldu sövdayi-könül şiftəvü divanə.

Rahətü möhnəti-aləm könülə yeksandur,
Vəsl əyyamı mübəddəl çün olu hicranə.

Eşq rüsvalığını tərk edə bilməz aşiq,
Haceha, pəndi unut, kutəh edib əfsanə.

Ey Əmani, nə həmin tilbə sən oldun, bolmuş
Eşq vadisidə divanə bəsi fərzanə.

* * *

Ah kim, arami-canım gəlmədi,
Ötdü ömrü dilistanım gəlmədi.

Edə bilmən heç kimə izhari-dərd,
Məhrəmi-razi-nihanım gəmədi.

Təlxkam olsam, əcəb yox, ey rəfiq,
Nuşləb möcüzlisanım gəlmədi.

Zəfdin nali-qələm boldu tənim,
Nazı çox nazikmiyanım gəlmədi.

Nə əcəb, eynimğə olsa tirə mehr,
Mahmənzər mehribanım gəlmədi.

Olsa bihiss, tan iməs, daim məşam,
Türrəsi ənbərfəşanım gəlmədi.
Guy dək bipavü sər olsam, ni tan,
Dilbəri-çapükinanım gəlmədi.

Sərvnazindin, nə süd, ey bağban,

Bağara nəxli-rəvanım gəlmədi.

Ey Əmani, canı bermək səhl idi,
Neyləyin kim, canqıyanım gəlmədi.

* * *

Yüzün məhtabə bənzər, bənzəməzmi?
Tənin simabə bənzər, bənzəməzmi?

Gözün qiblənüma olub həmişə,
Qaşın mehrabə bənzər, bənzəməzmi?

Dəhanın içrə dəndanın, nigara,
Düri-nayaba bənzər, bənzəməzmi?

Şəfayi-dərdi-hicr üçün könülğə
Ləbin innabə bənzər, bənzəməzmi?

Məhəbbətni ziyad etməgə zülfün
Xəmi-qüllabə bənzər, bənzəməzmi?

Əmani köksidə tırnağ nişani
Açüq əbvabə bənzər, bənzəməzmi?

* * *

Ol pəri qıldı yenə şeyda məni,
Aləm içrə eylədi rüsva məni.

Aləmi bardır giriftarı anın,
Ni giriftar eylədi tənha məni.

Zülfü sevdası başımğa tüşgəli,
Görməyipdür mənzilü məva məni.

Ah kim, bülbül sifət saldı yenə
Xari-hicrə ol güli-rəna məni.

Həmnişinim hər kim oldu hicr ara,
Seylim əşki birlə doldu daməni.

Ey quyaş, yetgil kim, ağzın firqəti
Zərrə yanlığ etdi napeyda məni.

Ey Əmani, arizuyi-qəddi-yar
Çəng nisbət etdi xəm bala məni.

## QƏSİDƏ

Yenə əyyami-növbahar oldu.
Bülbülün nəğməsi həzar oldu.

İbtidayi-bəhar ətri-dimağ
Müşki-bidü bənəfşəzar oldu.

Etidali-həva nəzakətidən
Cümlə əşcar pürsəmar oldu.

İntizari-bəhar bar irdi,
Şükr kim, rəfi-intizar oldu.

Lilləhilhəmd əbri-himmətdən,
Qətrələr səbzəğə nisar oldu.
Atəşin gül budaqidin tərəfeyn
Ğönçələr bərgi aşikar oldu.

Zeyli-əşcari-səbzəzar içrə
Cari hər sarı abşar oldu.

Rəşki-firdovs tazə güllərdin
Bağü rağ ilə kuhsar oldu.

Quşlar əlhanı hər səhərgəhdə
Cani-əfkarə ğəmküsar oldı.

Badeyi-vəhdətin şəmimin alan
Ta əbəd məsti-bixumar oldu.

Heçə dəğməz, könül, libasi-həyat,
Çün qamu xəlqə müstəar oldu.

Ahi-biixtiyar əgər çəksəm,
Əcəb irməs, çü tən nizar oldu.

Bolmağüm biqərar tan sayman,
Yarə bilütfliğ şüar oldu.

Naşəkib köngülnün aşubi
Bir səhiqədd gülüzar oldu.

Səbrü aram riştəsin yüzdü,
Yüzdə cədi çü tarumar oldu.

Tili mərcanü tişləri lölə,
Ləbləri ləli-abdar oldu.

Nəxli-ümmidimə səmər bergən
Qəddi-mövzuni ol nigar oldu.
Ğəmzəsi vəzini neçük qılğay,
Hər baxışmağı fitnəbar oldu.

İzi toziğə yüz yetürməgümə
Əcəbim bar ki, bəxt yar oldu.

Tutiya əşkbar eynümğə
Astanındəki ğubar oldu.

İkki aləm səadətin tapdı,
hər kim lütfi-kirdigar oldu.

Aşiqi-mübtəlayə tən sanma,
Ahü əfğan əgər şiar oldu.

Etdi təsxiri-əqlü huş çü eşq,
Səbrü aram hərzəkar oldu.

Əql məhv olsa səhl irür, çün kim,
Eşq bünyadı üstüvar oldu.

Hadisati-zəmanədən daim
Eşq aşiqlərə hüzar oldu.

Neylərüz izzəti cəhan içrə,
Xarlıq çünki iftixar oldu.

Şöhrəti-eşqinin sərəfrazı
İki aləmdə namdar oldu.

Şadmanlığni neylərüz, çü könül
Ğəmi-eşq ilə kamgar oldu.

Məskənət bar mühal insanğa
Vəzi-dövran çü bivüqar oldu.
Müddətül-ömr məskənü məluf
Valeh olğanğa kuyi-yar oldu.

Dəmbədəm intizari-məqdəmidin
Şeş cəhətğə gözüm çəhar oldu.

Baisi-tilbəliğ Əmaniğə
Şurişi-eşqü novbahar oldu.

**TƏRKİBBƏND**

Həddüm degil eyləmək təmənna,
Hüsni ciləvatini, fəəmma
Lütf eyləsə vahibül-ətaya,
Eynüm benihanü aşikara,
Mirati-xəyalidə təmaşa,
Əksini edə bevəchi-əla.
Məzur dutun ki, lafi-bica
Urmaqları eşq edər təğaza.
Sərmayeyi-dünya birlə üqba
Aşiqlərə sidqdür, nə ğövğa.
Qət eylə təəllüqi ki, məva
Lütf ola səmadə çün Məsiha.
Ta elmü əməl bərabər olmaz,
Bu atifələr müyəssər olmaz.

Heç kimsə işi cahanda itmam
Tapmas, əgər olsa xas əgər am.
Rəyincə dolanmaz isə əyyam,
Səbr ilə gözət nolur sərəncam.
Eşq atəşi görməgən beəqsam,
Gər göysə min il irür hənuz xam.
Tövfi-hərəmiğə bağla ehram,
Ey dil ki, tapaysin aqibət kam.
Yüz şükr ki, bir üzari gülfam,
Can mürğinə qurdu zülfdən dam.
İfham ola ğönçəsidin ibham,
Əyyam edə fitnə eynidin vam.
Aşiqlərə bizdən olsun elam,
Rüsvalığa təşti salduq əzbam.

Bu firqəyə təng imiş çü namus,
Saldıq anı künci-həbsə məyus.
Çün ömrə əsasi-üstüvari
Yox, eşqə köçürgilən mədari.
Gər tüşsə mənim sarı güzari
Canınumın, ola can nisari.
Daim çəkərəm bu intizari,
Cismim ola kuyinin ğübari.
Qəmdir könülün çü ğəmküsari,
Bilməz ki, nədir fərəh şüari.
Fəttan gözünün könül şikari
Ta olmadı, tapmadı qərari.
Eşq ilə gərək kim, iftixari
Fərq etməyə qürbü bödi-yari.
Ya rəb, bizə leyl ilə nəhari
Məstanə keçir, nə bixumari.

Kim məhv ola həstliğ məqami
Layəqəlü məst olağ müdami.
Divanəvü məstü laübali,
Gəzmək çü degil cahanda xali.
Qoygil, könüla, əbəs xəyali,
Tərk eylə həvayi-mülkü mali.
Bu bəzmdə sədr ilə nihali,
Yeksan sayü çəkməgil məlali.
Ol kimini sevgilən, misali,
Tapılmasa, olmaya zəvali.
Gər istəyə hicr, ya vüsali,

Ol qabilü qılma qilü qali.
Ərz etmək ona olamı hali.
Tapsaq, məsələn, əgər məcali?
Çox eyləmə, bağban, cidali.
Payəndə degil bağın nihali.

Çün sahibi beş gün eyləmək nəsb,
Bir yaxşı süluk eyləgil kəsb.
Peymanə dolanda, ey yeganə,
Baxmaz çü bəhar ilə xəzanə.
Mərdanə olan gərək cəhanə
Bel bağlamaya müxənnəsanə.
Öz halı bilə təvəkkülanə
Ğövğasidən eyləyə kəranə.
Bar minnəti möhnətin bu canə,
Müddətlər edibdür aşiyanə.
Ötgəc ğəmi-eşqdən fəsanə,
Ahum şərəri çəkər zəbanə.
Qan yaşumi eyləgəc rəvanə
Damanumə damə danə-danə.
Gər bolmasa nəğmeyi-çəğanə

Əfğanumi bitəkəllüfanə.
Pərvaz qılım betərfi-ahəng,
Biminnəti-mütrib əzdili-təng.
Başumğə çü düşdü eşqdin zil,
Əmrazə verür şəfayi-acil.
Hər zərrəğə olsa lütfi şamil,
Xurşid ziyasin edə hasil.

Kəsb eylədilər qamu əfazil
Üşşaq nəvasidən məsayil.
Cananumı görsəm ər müqabil,
Asan olur üqdəhayi-müşkil.
Mənzuri-nəzər olandin, ey dil,
Göz çəmxəliməğcə olma ğafil.
Sərmayeyi-eyş saya aqil,
Eşqin ğəmi könlün etsə mənzil.
Xoş dövlət irir ki, qılsa qatil
Məqtulləriğə bizni daxil.

Ta həşr günü olaq nümayan,
Bu mərtəbə birlə beynəl-əqran.
Cananə yolunda canfəşanlığ
Etgan yetə zövqi-zindəganlığ.
Bar eşqidə şərti-imtəhanlığ,
Cövrünü çək, eyləmə fəğanlıq.
Rusvalığa yox çü hiç danlığ,
Ni qaldı daxi degəy nihanlığ.
Əyyamidin umma mehribanlığ,
Bir neçə gün olma kamiranlığ.
Əfsusunu bizgə ərməğanlığ
Göndərdivü getdi novcəvanlığ.
Ol arizi görməgən zəmanlığ,
Xar oldu gözümğə gülüstanlığ.
Eşqi qəmi oldu çünki canlığ,
Şükrini əda etəy ni yanlığ.
Ya rəb, bu əsirü zar Əmani,
Avarəvü biqərar Əmani.

## RÜBAİLƏR

Sənsiz nəfəsi səbrü qərarım yoxdur,
Nəzzarədən özgə intizarım yoxdur.
Bitablığımda ixtiyarım yoxdur,
Təşrif gətir ki, ğəmküsarım yoxdur.

* * *

Əfsus ki, yar getdi, qaldum bikəs,
Məhcurü əsir mən kibi heç kim iməs.
Könlümdə irür həsrəti-yüz növ həvəs,
Cüz nalə iməs daim işim misli-cərəs.

* * *

Ni lütf idi nagəhan ki, bünyad etdün,
Bir namə bilə Əmanidən yad etdün.
Hicr içrə pozuq könülnü abad etdün,
Əlqissə ki, qəmdən anı azad etdün.

* * *

Görmək yüzini ki, bihəd irür həvəsim,
Heç növ ilə neylə iməs dəstrəsim.
Qorxum bu ki, nagəh əcəl alğay nəfəsim,
Həsrət bilə könlümdə qalay mültəməsim.

* * *

Dövran məni etgüncə cüda canandin,
Ey kaş, iraq salaydı cismim candin.
Görgən sitəmi dəli könül hicrandin,
Nə şərh edim, ötüpdürür imkandin.

* * *

Yüz şükr ki, gəldik, yenə kaşanəmizə,
Yetdik şərəfi-vüsali-cananəmizə,
Hərçənd qılırsa naz ol fərzanə,
Minnətlər irür bu dili-divanəmizə.

* * *

Hərçənd ki, yar bizni yad eyləmədi,
Qəmdən edibən xilas, şad eyləmədi,
Lakin nəfəsi xüfyəvü izhardə dil,
Bidadidə heç növ ilə dad eyləmədi.

* * *

Əlminnətülillah, yenə canan gəldi,
Hicranğə şikəstü vəslə tüğyan gəldi,
Dərdi-dili-nalanimə dərman gəldi,
Fərsudə bolan cism eviğə can gəldi.

vV

## ŞAH ABBAS KƏBİR
## (1570-1629)

*I Şah Abbasın (hakimiyyəti illəri: 1587-1629) türkcə şeirləri görkəmli ədəbiyyatşünas alim Salman Mümtazın şəxsi arxivindən götürülmüşdür. S.Mümtaz məlumat verir ki, I Şah Abbasın Azərbaycan türkcəsində şeirləri əruz və heca vəznlərində yazılmışdır. Şeirlərində Abbas və Şah Abbas təxəllüslərindən istifadə etmişdir.*

vV

Dərdi olanın həmişə dərman biləsincə,
Küfri olanın nə gəzər iman biləsincə.

Kafər olanın məskəni fin-nar səqərdir,
Mömin olanın cənnəti-rizan biləsincə.

Bülbüllər oxur şamü səhər bağ arasında,
Güllər açılır sünbülü reyhan biləsincə.

Hüsnün kitabı nuri-təcəlla yazulubdur,
Açdım, oxudum sureyi-Rəhman biləsincə.

Bağdadı alur, bil, o Şah Abbas Hüseyni,
Təvvafə gəlür ol Şəhi-mərdan biləsincə.

* * *

Dilbər, səninlə meylər içəlüm.
Bu dünya kimsəyə qalmaz, əfəndim.
Bu fani dünyada ləzzət çəkəlüm,
Bu dünya kimsəyə qalmaz, əfəndim.
Dünyanın, bil, adı fanidir, fani,
Beş gün qonaq saxlar ancaq insani,
Təxtindən endirmiş çox Süleymani,
Bu dünya kimsəyə qalmaz, əfəndim.

Bayquşlar məskəni çöldür əzəldən,
Bülbülün dilbəri güldür əzəldən,
Atalardan qalma yoldur əzəldən,

Bu dünya kimsəyə qalmaz, əfəndim.

Dünyanın bir adı quru qəfəsdir.
Ona könül bağlamaq tam əbəsdir,
Bu sözü söyləyən Şah Abbasdır,
Bu dünya kimsəyə qalmaz, əfəndim.

* * *

Ta badeyi-xoşgüvar var, ey saqi,
Bir dəm məni qoyma hüşyar, ey saqi.
Doldur, qədəhi ki, dövri dönmüş dövran
Nə badə qoyar, nə badəxor, ey saqi.

vV

## MƏSİHİ

*Şairin (1580-1656) təbrizli olan atası Şah Təhmasibin hakimiyyəti zamanı ailəsi ilə Qəzvinə, I Şah Abbasın dövründə isə İsfahana*

*köçmüşdür. Məsihi atasının sayəsində mükəmməl təhsil görmüş, tibb elminin bütün incəliklərinə yiyələnərək kamil bir həkim kimi yetişmişdir. İlk dövrlərdə şair I Şah Abbasa çox yaxın olsa da, sonradan onunla şah arasında narazılıq yaradılır. Təxminən 1611-1612-ci illərdə vətənini tərk edən Məsihi 1632-ci ilə qədər Hindistanda yaşamış, burada istedadlı həkim və şair kimi tanınmış, ölkənin bir sıra yerlərini gəzmişdir. Sonra o, Moğol imperatoru Şah Cahandan icazə alaraq Məşhədə gedir, oradan da vətənə qayıdır.*

*Məsihi əsərlərinin ümumi həcmi yüz min beytə yaxındır. Şairin əlimizdə olan anadilli əsəri «Vərqa və Gülşa» poemasıdır. Məsihinin əsərdə adlarını çəkiyi «Danəvü dam», «Zənburü əsəl» poemaları hələlik aşkar edilməmişdir.*

**«VƏRQA VƏ GÜLŞA» POEMASINDAN**
**Q Ə Z Ə L L Ə R**

Ah, kim firqət şərabi bağrımı qan eylədi,
Dil pərişan, sinə büryan, didə giryan eylədi.

Açmaz oldu qönçeyi-ümmidimi feyzi-səhər,
Gərçi min gül bağara hər sübh xəndan eylədi.

Bəxti varun, taleyi dun, rütbeyi-iqbali pəst,
Görmədi bir mən kimi ta çərx dövran eylədi.

Bavücud rəhmi yox, dün halımı gördü fələk,
Üzə dürrün dağudub, saçın pərişan eylədi.
Eylədi gözdin nihan, öznü o mahi-xərgəhi,
Eylə kim zürmətdə məva abi-heyvan eylədi.

Saldı hər saət ona min üqdeyi-şəkli-həyat,
Ey xoş ol kim hicr işin ölməklə asan eylədi.

Mən vüsal istər olub, hicran mənə ruzi-qəza,
Səddi-rahilə, Məsih, isbati-bürhan eylədi.

* * *

Ey fələk, netdim həmişə gözləyib azarımı,
Dil evin ğarət qılub pozdun rüxi-bazarımı.

Dəhr içində tiri-bidadə məni qıldun hədəf,
Zülm ilə bu dün ara əldən çıxardun yarımı.

Noldu cürməm əxtəri-bəxtim vəbalın gözləyib,
Lütf ilə qıldun təvana taleyi-əğyarımı.

Bünyeyi-iqbalıma bin qəhr ilə saldun şikəst,
Eylədün faiq durub iqbalıma idbarımı.

Dəsti-zülm ilə məni əğyarə qıldun zirdəst,
Vüsəti-mərdanəlikdə təng edüb həncarımı.

Paybusi-yarə yetsən qoyma əldin, zinhar,
Ey səba, lütf ilə dutgil daməni-dildarımı.

Qəm hücumunda Məsihi tək mənim halımnı gör,
Söyləgil əğyardan pünhan ona əsrarımı.

* * *

Əldən aldun, ey fələk, nəqdi-vüsali-yarımı,
Eylədün ümman sirişki-çeşmi-gövhərbarımı.

Ta göz açdım badə verdin xərməni-namusü nəng,
Bixəbər zülm atəşin yaxdı mətai-arımı.

Nola, ey bidadgər qılsan tərəhhüm halıma,
Qəmlovam bu dünara yetür mənə qəmxarımı.

Surəti-halımnı qılgil cümləgi cananə ərz,
Başın üçün, ey səba, görməkdə sən bazarımı.

Demə oldum bivəfa dur tazə qılgil imtəhan,
Aç vərəq bir-bir oxugil nüsxeyi-girdarımı.

Hiddəti-düşmən ənisü şiddəti-bəndim cəlis,
Ey bəgim, gəl üstümə görgil nədür azarımı.

Dutsan iqrarın əgər, təmkin verəm əğyarına,
Qoyman əldən çün Məsihi damənі-iqrarımı.

* * *

Mənəm ki, dərdə kan oldum sirişkim ləli-nabından,
Məhəbbət nəxlini sərsəbz qıldım didə abından.

Dəbistani-məlalətdə verür hər ləhzə ləb açsam,
Müəllim dərsi-novmidi mənə bəxtim kitabından.

Bizə ol müddəi bidad cövrin həddən aşurdi,
Əcəb ol səngdil vəhm eyləməz yarın əzabından.

Cəfa hərçənd edər zahir burub yüz himməti-xatir,
Əl üzməz qönçə dək ol bağbanın ictinabından.

Yetişmiş əhli-bəzmə dövrdən bin nəşeyi-rahət,
Xümari-dərdi-sər yetdi mənə dövran şərabından.

Nə qəm, talanə getdi cümlə malım şükrilillah kim,
Hesabın aldı qurtuldum qəmim yövmül-hesabından.

Degil layiq verəm dərdim, Məsihi, nisbət əğyarə,
Mənəm əvvəlki qəmfərsa cəhanın müntəxabından.

* * *

Mənəm ki, sinə çak etdim fəraqın iztirabından,
Yeritdim cuyi-xun ol rövzəyə heyvan hübabından.

Bir özgə sübhə tiksin əhli-aləm dideyi-ümmid,
Ki bu sübhi-səadət tirə oldu qəm səhabından.

Gördüm ol kimsə kim ayırdı mən biçarəni səndən,
Ki, ta sübhi-qiyamət durmasın ol cayi-xabından.

Qənimətdür əgərçi vəsl, yoqdur görməgim gəh-gəh,
Gedüb yandurma bir gəz atəşi-hicrin şəhabından.

Ola başında kimnin iştiyaqi-badeyi-səhba,
Nədür bais qayıtmaq təşnələb meyxanə babından.

Qənaət eyləmək bilmən nədəndür dərdi-hicranə,
Urub əl şişeyi-mey içməmək vəslət şərabından.

O gün oldum Məsihi tək cəfayi-eşqə rasix pey,
Açüb ta dərs oxudum səfheyi-hüsnün kitabından.

* * *

Hiç kim, ya rəb mənim tək didə pürxun olmasın,
Duzəqi-ümmid sınmış, qərqi-Ceyhun olmasın.

Rütbeyi-idbar ali, payeyi-iqbal pəst,
Şərtəsi kəm, taleyi dun, bəxti varun olmasın.

Xərməni-səyin yığub, silabə vermişlər kimi,
Hasili-ömri ziyanü mayə məğbun olmasın.

Bu siyəh bəxti-əzəl getdükcə oldu müstəmənd,
Kimsənin əhvalı əvvəldən digərgün olmasın

Kim təami-xuni-dil olsa, şərabi dərdü qəm,
Nigər içün, naseha, ol necə məhzun olmasın.

Görsən ər bu bağara, ey sərv, o gül rüxsarımı,

Söyləgil kim, bağban keydinə məftun olmasın.

Çün Məsihi, guşeyi-qəmdə bəla ərbabıyam,
Mülkəti-Cəm, təxti-Dara, gənci-Qarun olmasın.

* * *

Hiç kim, yarəb, mənə nisbət digərgun olmasın,
Dil pərişan, sinə büryan, didə pürxun olmasın.

Dəhri-pirin hiyləsindən hiç kafir mən kimi,
Paybəndi rişteyi-səd məkrü əfsun olmasın.

İstəmən dirlik əgər bilfərz olursa yarsız,
Höqqeyi-dildə vəfadən qeyri-məcun olmasın.

Cilveyi-qəddi nihali-bağ-ara ər olmasa,
Sayeyi-şümşadü najü sərvü mövzun olmasın.
Böylə qanuni-müxalif gər ola üşşaq ara,
Görəyim ol ləhzə qan olsun, bu qanun olmasın.

Çün cəfavü cövr çəkmək lazımıdur aşiqin?
Səhlidür qoy mən çəkim canană məhzun olmasın.

Dərdi-hicri fariğ etmiş cümlə qəmdin can evin,
Bu Məsihi necəsi ol dərdə məmnun olmasın.

* * *

Bu gün, ey dust, dil mürğini olmaq kəbab istər,
O məmur eyləyən məzrəni ömr ilə xərab istər.

Xümari-badeyi-əyyamdən bəs incimiş xatir,
Qoyub baş yerə ta sübhi-qiyamət didə xab istər.

Fəna istər özünə xatiri-naşadımız əmma,
Cəhan olduqca cananın məzacin kamyab istər.

Necə əncüm saya hicran düni bu çeşmi-xunbarım,
Olubdur dilgiran sübhi-əcəldin aftab istər.

Dili-ləbtəşnə dərya sahilindən təşnə ovd etsə,
Degil qəm sağərü peymanəvü cami-şərab istər.

Bu gün çün arzudə iddiamız sidqə şamildür,
Sözü rədd olmayıb pünhan duasın müstəcab istər.

Demən burdu Məsihi nişə rüx bu arzulərdin,
Degil qafil o aqil axirin hüsnülməab istər.

* * *

Bu xümmari-səbuhi-arzusindən şərab istər,
Dağıtmış noğli əflakə gəhi cami-şərab istər,

De ey göz nuri, könlümün süruri, ömrümün nəqdi,
Nədəndür bu ki, can cananə səndən ictinab istər.

Dutub can töhfəsin amadə idim rahi-təslimə,
Gəlür, əlbəttə, malın bir gün ol sahib rikab istər.

Çü almaz dust vəsl əyyami göznə bu mühəqqərni,
Bu məyusi-əvvəl min bəd can mülkin xərab istər.

Degil vəsl istəgim bu xatiri-naşad içün billah,
Budur qorxum ki, yarım yar yarından hesab istər.

Bu dirlikdən qərəz əxzi-mətai-vəsli-canandur.
Və gər nə xəstə dil yaleytəni künti-türab istər.

Degil eyb ər Məsihindən ləcacət görsə cananı,
O Rumi mənbəidən hinduyi-ləbtəşnə ab istər.

vV

**ZƏFƏR**

*«Zəfər» təxəllüsü ilə şeirlər yazmış Mürtəzaqulu xan Şamlu Şah Səfi və II Şah Abbasın hakimiyyəti dövründə yüksək dövlət vəzifələrində işləmiş, eşikağasıbaşı, divanbəyi, qorçubaşı, Kerman vilayəti valisi, Şeyx Səfiəddin türbəsinin mütəvəllisi olmuşdur. Şeirlərində Ə.Nəvai, Ş.İ.Xətai və M.Füzuli yaradıcılığının təsiri görülməkdədir. Təxminən 1591-ci ildə dünyaya gəlmiş şair farsca yüz min beytə yaxın həcmdə şeirlər yazmış, yaşının ixtiyar çağında, 1669-cu ildə Azərbaycan türkcəsində divanını tamamlamışdır.*

vV

Əlif qəddin görüb hərf içrə düşdü başə bir sevda,
Bey ayrıldı əlifdən, düşdü bu xəlq içrə min qovğa.

Məcazi eşqə düşdü bu təni-zarım, əlacım yox,
Əlimdən ixtiyarım aldı bir məhpareyi-tərsa.

Yüzi gül, saçı sünbül, dişləri dür, ləbləri meygun,
Qaşı yay, kiprigi ox, gözləridir nərgisi-şəhla.

Özi insan və leykin surəti huriyi-cənnətdir,
Şəmimindən onun zökam olubdur ənbəri-sara.

Məsihavar əlacın bir mərizi-eşq üçün saxla,
Zəfər çox dərd çəkdi, ta ki, dərman eylədi peyda.

* * *

Sane odur, ədəmdə ikən verdi can mənə,

Artırdı mülkü malü məhəllü məkan mənə.

Xaru zəlil etmədi bu xəlq ara məni,
Ömrüm çox etdi, verdi əcəldən aman mənə.

Ənam etdi bizə bu dünya gözəllərin,
Lütfilə verdi nitqü şüurü bəyan mənə.

Dil verdi, şükri-nemətini edəlüm müdam,
Min şükr feyzi-rəhməti oldu əyan mənə.

Şad ol, Zəfər, könüldə dəxi üqdə qalmadı,
İki cəhanda ömür verir cavidan mənə.

* * *

Dəryadır eşq, müttəsil olmuş hübab ona,
Güzgüdür, ol ki, cilvə verir aftab ona.

Yandırmayınca eşq ürəgi eyləməz kəbab,
Pərvanə şəm görgəcin olur kəbab ona.

Zahid həmişə sərzəniş eylərdi aşiqə,
Mən daxi doğru sözləri yazdım cəvab ona.

Bir neçə nüsxə istədi məndən rümuzi-eşq,
Kəsdim tənabi-ömrüni, verdim kitab ona.

Cənnət bağı dedkdiləri yarın vüsalıdır,

Ey bülhəvəs, yerin tanı, vermə əzab ona.

Tapmaz, Zəfər, bu yolda o kim, vasil olmadı,
Hər kim xumar çəkdirə, odur şərab ona.

* * *

Eşq sevdasını qismət eylədi gərdun mənə,
Yardan ayrı təkəllüfdür gərəkməz can mənə.

Xəlq ara Fərhad ilə Məcnundən artı şöhrətim,
Dərd çox çəkdim, əlac etməz dəxi dərman mənə.

Qəmdən öldüm, kimsəyə ərz etmədim əhvalimi,
Barilaha, qismət eylə bir nəfəs iman mənə.

Sən zəfər ver, qalmışam yalqız, pənahım kimsə yox,
Dünyəvü üqbadə səndən qeyr yox sultan mənə.

Dünyəvü üqbadə səndən qeyr yoxdur dadrəs,
Çün əzəl gündən veribsən mehr üzündən can mənə.

* * *

İlahi, başıma salmış həvayi-eşq bir sevda,
Ki, bu sevda ilən vardır cəhan mülkündə min qovğa.

Səni zahirdə tapmaq bəndəyə müşküldürür, yarəb,
Könüldə zahirin peyda irir etdi məni rüsva.

Səməndər tək məni eşq oduna saldı öz odumdan,
Mənim suzimni görgəc gülgə batdı bülbüli-şeyda.

Olub gül yüzinə mail beş-on gün çəkdi əfğanı,
Mənim tək olmadı daim sənin eşqində pabərca.

Əgər Məcnun yaxıb eşq atəşinə cismi-üryanın,
Gözü ayinəsinə əks saldı surəti-Leyla.

Əgər Fərhad Şirin eşqdə canın fəda qıldı,
Zəfər, göz yaşidin ləli-Bədəxşan oldu hər xara.
Və gər pərvanə yaxdı şəm oduna pərü balin,
Zəfər həm eylədi eşqin yolunda özünü rüsva.

* * *

Şükrlillah, ey gözəl, dərdin nəsib olmuş mənə,
Yetməsin bu çərxi-gərdundən yəman gözlər sənə.

Çatlasun bol göz, sənin saruyə istər kəc baxa,
Xaki-payindir sənin xahiş gözümə tutiyə.

Bir könül kim, səni sevdi, qıldı tərki-xanüman,
Aşiqə  canan vəfa eylər, nə bu dəhri-fəna.

Yüz min ildən sonra Məcnun ilən Leyli söylənir,
Xəlq arasında bu san məşhurdur ömri-bəqa.

Köhnə oldu dövrdə Fərhadü Şirin qissəsi,

Söylənür şimdi Zəfər eşqi bu günlər xəlq ara.

* * *

Yarəb, sənin bir adınadır nəqdi-can bəha,
Zatın qədimdir ki, ona yoxdur intəha.

Hər kim sənin yolunda fəna görmədi özün,
Yoxdur iki cəhanda onun ömrünə bəqa.

Sənsən verən bəşarəti-ümmidü bim bizə,
Etdin Kəlim əsasını xunxarə əjdəha.

Tapdı Rəsul mərhəmətinlə məqami-qürb,
Yasin oldu mənziləti, vəsfi Tavü Ha.

Yəqub əgərçi çəkdi isə möhnətü ələm,
Yusif cəmali verdi onun gözünə cəla.

Tapdı həyat adəmi-xaki ze ruhi-qüds,
Axırda xak oldu ona mənzili-bəqa.

Yarəb, sənin sözünə Zəfərdir ümidvar,
Ol bikəsi bu dami-küdurətdən et rəha.

* * *

Ey rəqibim, halımı bil könlüm əfğanın görüb,
Sormagil bu xəstə halın gözlərim qanın görüb.

Vəsldə gər xali-hündusin görüb yansam oda,
Mən′ etmə kim, yanarsan daği-hicranın görüb.

Sinəmi məcruh edibdir tiri-müjganı onun,
Rəhm edərsən halimə şol qanlı peykanın görüb.

Gözlərinin mərdümi etmiş könül seydinə qəsd,
Rəm edər ahu kimi şol xeyli-müjganın görüb.

Etmədi dərdimə dərman Xızrü İlyasü Məsih,
Ömri-cavid istədilər abi-heyvanın görüb.

Şəm tək suzi-nihan yaxdı Züleyxa canını,
Yusifin töhmət sözündən bəndi-zindanın görüb.

Bülbüli-şeyda nəvayi-eşq tutdu bağ ara,
Bir nəzər ta qönçənin gülbərgi-xəndanın görüb.

Dövrə saldı saqiyi-siminbədən göz sağərin,
Başə çəkdi badəni sibi-zənəxdanın görüb.
Bu Zəfər canın fəda qıldı onun gül yüzinə,
Valeh oldu gözləri çaki-giribanın görüb.

* * *

Mahi yüzin pərdəsi olmuş səhab,
Ay yüzünə yaxşı yaraşmaz niqab.

Gün gəlülən səndən edər kəsbi-nur,
Əksi-rüxün tələtidir mahtab.

Məst gözünün mərdümidir rahzən,
Mey içübən etdi cəhani xərab.

Xəncəri-xunrizini almış ələ,
Mənə der ver, mənə qanlu kəbab.

Gər cigərin var isə, qoy çıxarım,
Aşiq isən dinməgilən heç bab.

* * *

Valeh oldum, ey pəri, ol çeşmi-fəttanın görüb,
Məst oldum ta ləbi-ləli-dürəfşanın görüb.

Əqlimi tarac etdi türkütazi-mərdümin,
Odlara düşdü tənim sibi-zənəxdanın görüb.

Şəmi-ruyin görəli pərvanə tək yandım ona,
Su səpildi könlümə sərvi-xuramanın görüb,

Qılmış idi şərhə-şərhə sinəmi daği-fərağ,
Xatirim cəm oldu çün zülfi-pərişanın görüb.

Fariğ idim eşq əlindən, seyr edirdim aləmi,
Xəstə düşdüm ta kəməndi-zülfi-piçanın görüb.

Ta yüzün gördüm, rəfiqimdir Zəfər şamü səhər,
Qönçə tək açıldı könlüm ləli-xəndanın görüb.

* * *

Xəm oldu qamətim, hicran əlindən, ver şəfa, ya Rəb,
Vüsali-yardən qeyri mənə yoxdur dəva, ya Rəb.

Məcazi eşq ilən yoxdur işim zahid kimi daim,
Həqiqət nəşəsindən ver mənə cami-bəqa, ya Rəb.

Ayırma bəndəni məhşər günü saqiyi-kövsərdən,
Onun mehri iləndir könüldə zövqü səfa, ya Rəb.

Cəhanda çox hökumət eylədim, gördüm vəfası yox,
Çəkildim küncə, lütfün kəsməgil ta müntəha, ya Rəb.

Yetişdi ömr yetmiş dördə, gəldi mövsümi-piri,
Cəhanda görmədim heç kimsədən buyi-vəfa, ya Rəb.

Zəfər verdin mənə, düşmənlərimi, xarü zar etdin,
Behəmdüllah ki, səndən görmədim bir kəz cəfa, ya Rəb.

* * *

Eşqə düşdün, ey Zəfər, gəl rahəti-canı unut,
Yetmədin bəzmi-vüsalə, hicri-cananı unut.

Ərsə təng oldu xəzan, ömrə yoxdur etibar,

Püsteyi-xəndanivü sübi-zənəxdanı unut.

Dilbərin mehrabi-əbrusinə eylərdin nəmaz,
Ta pərişan olmadın, zülfi-pərişanı unut.

Tök gözün yaşın nədamətdən gecələr ta səhər,
Nəş′eyi-ləli-ləbü yaquti-rəmmanı unut.

Çün ayaq çəkdin bu dünyanın evindən, ey Zəfər,
Şövkəti-mülki-Süleymanivü sultanı unut.

* * *

Bahari-ömr keçdi, titrəşir cismim xəzan görgəc,
Ağardı muyi-sər qəmdən, cəsəd pozular tuman görgəc.

Tükəndi badeyi-işrət, dizimdə qalmadı qüvvət,
Mənə kar eylədi qürbət, gözüm ağlar cavan görgəc.

Rəvaru yaş tökməkdən kəsildi gözünün nuri,
Qəm aldı könlümün evin başımda rəngi-qan görgəc.

Gözümün qanlı yaşından nihalı pərvəriş tapdı,
Uzanır sərvi-rənanın qədi abi-rəvan görgəc.

Xəyalındır mənə mehman, könül təxtindədir sultan,
Səfərdə şad olur mehman şüküftə mizban görgəc.

Bu dünya malına verən könül üqbadə mürtəddir,

Satar imanını tüccar, malında ziyan görgəc.

Sarıldı boynuma  zülfün kəməndi əfi ilan tək,
Olur qorxaq kişi qafil yuxusunda ilan görgəc.

Könül sevdayi-eşqə düşəli qəmdən Zəfər tapdı,
Müqərrərdir ki, köhnə no olur yarın cavan görgəc.

* * *

Könlüm açılır sərvi-xuramanını görgəc,
Xoşhal oluram püsteyi-xəndanını görgəc.

Gün rəşk edər gül yüzini görsə səhərdə,
Məh parələnür navəki-müjganını görgəc.

Nəqqaş əgər çəksə qələm birlə cəmalın,
Titrər əli ol sibi-zənəxdanını görgəc.

Gər tab verə zülfi-pərişanını yüzdə,
Gün tirə olur çöhreyi-tabanını görgəc.

Duzəx qapısı bağlanıbən cənnət olur dəhr,
Qoynundakı sibü gülü reyhanını görgəc.

Fəth ilə Zəfər yar olur aşiqi-zarə,
Əsbablanır naz ilə samanını görgəc.

* * *

Qələm aldım ki, yazım əz qəmi-hicran kağız,
Qanlı çeşmim suyidin oldu Zərəfşan kağız.

Oda yandı cigərim, dud ilə çıxdı ahim,
Başı yıxılmış  ilan oldu o bican kağız.

Güli-rəna kimi ki, sarı olub, gahi sorx,
Sərbəsər oldu yüzi sorx güləfşan kağız.

Od şərarı düşübən canına yandı belə kim,
Dilə gəldi, elədi ah ilə əfğan kağız.

Bəs ki, yazıldıvü pozuldu, qara oldu yüzi,
Yayxadı suya qamu dəftərü-divan kağız.
Qanlu çeşmim suyu əz-bəs ki, gözümdən axdı,
Ağ ikən rəngi dönüb çün güli-reyhan kağız.

Ey Zəfər, səbr elə, ta ki, vüsalə yetəsən,
Sənin ahindən idi, eylədi əfğan kağız.

* * *

Yüzin görgəc könül quşini saldı məndə bir dilbər,
Onun qeydindən azad olmağa yoxdur bizə rəhbər.

Tutuşmuş şəmə döndü cismi-zarım eşq odundan,
Məgər pərvanələr söndürməgə cəm olalar yeksər.

Könüldə saxladım eşq odunu məcmər kimi axır,

Məni rüsvay qıldı dəhrdə seylabi-çeşmi-tər.

Oda düşmüş yılan tək gecə-gündüz piçü tabım var,
Onun gül çöhrəsinin tabından canında var əxkər.

Cəhanda yar üçün çox seyr edib axır, Zəfər, tapdım,
Mən oldum mehr üzündən bəndə ona, ol mənə rəhbər.

* * *

Sərv tək gər cilvə qılsan bağ ara, ey sərvnaz,
Can fəda eylər ayağın tozuna əhli-niyaz.

Qaşların taqinə mən səcdə onunçün eylərəm
Kim, qılallar Kəbənin evinə əz hər su nəmaz.

Bir dil ilə mən sənə razi-dilim deməyincə,
Yüz dil ilə gər desəm, qalır könüldə cümlə raz.

Şəmi-rüxsarın məni pərvanə tək qovdu gecə,
Danadək bitab idim, can qoymadı məndə güdaz.

Ya Zəfərin gözünün mərdümlərin eylə sipənd,
Ya yüzini gizləgil, etgil gözümdən ehtiraz.

* * *

Arif olan sirrini hər kimə izhar eyləməz,
Yar güldür, aşiqini bisəbəb xar eyləməz.

Zahirü batində birdir aşiqin könlü müdam,
Yarsız gər bağə girsə, seyri-gülzar eyləməz.

Dizini qucaqlayıb yatır əgər yar olmasa,
Öz yarından qeyri meyli-özgə dildar eyləməz.

Bu cəhanda görmədim bir əhdi bütün dilrüba,
Gözümü giryan görər, fikri-gühərbar eyləməz.

Aşiq oldur canın qurban edə cananına,
Hər könül kim, canın istər, fikri-dildar eyləməz.

Şəm′ə yanmaqdan pərvanənin nə bakı var,
Kəbeyi-eşqə irən fikri-girənbar eyləməz.

Ey Zəfər, giryan gözün etdi səni-rusvayi-xəlq,
Demə daxi kimsə sirr sözüni izhar eyləməz.

* * *

Yar vəslindən cüda pamali-dövranəm hənuz,
Yanaram eşq oduna, bimari-hicranəm hənuz.

Xatirimdir cəm kim, qeyr ilə yoxdur ülfətim,
Demə kim, yad olmuşam, dər fikri-cananəm hənuz.

Gözlərimdən qanlı yaş axmaqdan oldum bibəsər,
Buyini çəkməkdə, bilgil, piri-Kən′anəm hənuz.

Gər gəda tək dərbədər düşdüm vüsalından cüda,
Öz yanımda fikrün ilən şah, sultanəm hənuz.

Bir kəminə çakərindir bu Zəfər, ey gülüzar,
Düşmüşəm gər nəzərindən bəndə fərmanəm hənuz.

* * *

Eşq tərkin eyləməm, ta var bədəndə bir nəfəs,
Mənə derlər, gər həvəsdir eşq, bəsdir bu həvəs.

Yar cahildir əgər başında vardır çox qürur,
Ayağı kəsməm kuyindən, deməsinlər bülhəvəs.

Başlarında bu cəhan sevdası var zahidlərin,
Heç deməzlər kim, yetişir dadə bir fəryadrəs.

Eşqdən qafil olanlar səngsar eylər məni,
Könlümün şişəsinə dəgsə sınar pərməgəs.

Pasibanəm gecə-gündüz kuyində ol dilbərin,
Bülbüli-şuridəyə xoştər gəlir künci-qəfəs.

Ey Zəfər, səbr eyləgil bu dəhri-dunin cövrinə,
Yetişir bu gün sənin fəryadına fəryadrəs.

* * *

Könlümü eylədi bülbül kimi şeyda ariz,
Bağ ara görsədəməz ol güli-rəna ariz.

İkiyüzliligini eylədi xəlqə zahir,
Sürtərəm torpağa bağ ara dəmadəm ariz.

Taqətim yox ki, iki od məni yandıra müdam,
Hicr oduna yanayım söylə könül, ya ariz.

Düşmüşəm eşq oduna, mənə sarı bir baxmaz,
Əcəb olmaz ki, gələ, edə tamaşa ariz.

Yüzümü bir ayağ ilə qızartgil, saqi,
Necə sürtüm ayağinə məni-rusva ariz.

Ey Zəfər, istər isən dövləti-baqi tapmaq,
Şeyx Səfi dərgəhindən dərgəh, tutma ariz.

* * *

Zəfər, yarın üzün gördün, mübarək,
Könül halını bildirdin, mübarək.

Səhər xəndan gəlin derdin bağından,
Onu naz ilə güldürdün, mübarək.

Siyəh zülfün pərişan eyləyəndə,
Qəmin könlün sevindirdin, mübarək.

Tökərdin göz yaşın hicran əlindən,
Ümidi-vəslə sildirdin, mübarək.

Nihan yerdə görüb ol işvəsazı,
Səməndində mindirdin, mübarək.
Gecə bayram, gündüz oldu novruz,
Özünü yarə bildirdin, mübarək.

* * *

Güllərin mətlubi bülbül, bülbülün mətlubi gül,
Meykeşin mətlubi saqi, saqinin mətlubi mül.

Şəmdən ötrü özün pərvanə yaxmış odlara,
Eşq babunda bu san təqsim qılmış əqli-kül.

Bülhəvəs buz cisminə pünhan olur od görgəcin
Kim, iraqdan dinləmək yaxşı olur bangi-dühül.

Ey nəsimi-sübh, gəl bizdən apar yarə pəyam,
Elçilik babında məhrəm sən təki olmaz rəsul.

Ey Zəfər, yarın həvasidir həyati-cavidan,
Yardan ayrı dirilmək aşiqə mümkün degül.

* * *

Can nəqdini fəda rəhi-cananə qılmışam,
Könlüm evini eşqlə viranə qılmışam.

Məcnundən artı şöhrəti-eşqim bu xəlq ara,
Fərzanəyəm ki, özümi divanə qılmışam.

Eşq odu düşdü başıma bir şəmi-bəzmdən,
Ol şəmi-bəzmə canımı pərvanə qılmışam.

Mənidə bütpərəst olur surət istəyən,
Mən tərki-surətü bütü bütxanə qılmışam.

Fərhad verdi can rəhi-eşqi-məcazdə,
Mən xatiri məcaz ilə biganə qılmışam.

Ta düşdi başə nəşeyi-cami-şərabi-eşq,
Göz sağərin bu nəşəyə peymanə qılmışam.

İzhar etmə hali-dilin xəlqə, ey Zəfər,
Çün cümlə ərzi-halini sultanə qılmışam.

* * *

Üç bəlalu kimsə olmuş həmdəmim,
Gah hicran, gah hirman, gəh məlal.
Gecə-gündüzdür ənisü məhrəmim,
Gah hicran, gah hirman, gəh məlal.

Deyə bilməm kimsəyə halim təmam,
Yari-bədxu bir dəm olmaz bizə ram,
Ağladırlar bu fəqiri sübhü şam,

Gah hicran, gah hirman, gəh məlal.

Saqiya, gəl dövrə salgil sağəri.
Şayəd ola könlümün rövşəngəri,
Qoymadılar bəzmimə sən dilbəri,
Gah hicran, gah hirman, gəh məlal.

Vəslə yetürgil məni, ey yüzi gül,
Əksük etmə bəzmimizdən camü mül,
Oda yaxdı, cismi-zarım oldu kül,
Gah hicran, gah hirman, gəh məlal.

Bir qulundur boynu bağlı bu Zəfər,
Dost kuyinə onu yetir bixətər,
Etdi işim günbəgün yövmül-betər,
Gah hicran, gah hirman, gəh məlal.
Verdi dövran cami-eşqi saqi tək,
Qaldı həsrət urəgimdə dağı tək,
Çevrəm almış gahü bigəh yağı tək,
Gah hicran, gah hirman, gəh məlal.

Olmuşam Məcnun təki yardan iraq,
Canıma kar eylədi suzi-fəraq,
Məni istəyibən edərlər soraq,
Gah hicran, gah hirman, gəh məlal.

* * *

Nobahar oldu, yenə qəm götürüldü aradan,

Cümlə matəmzədələr çıxdı gög ilən qaradan,

Saqivü badəvü mütrib üçü həmraz olubən,
Gəldilər bizə məlayik kimi, bilməm haradan.

Onlar ilən belə bir şux pəri mahliqa,
Naz ilə suyə girib sünbüli-zülfün daradan.

Vermiş idi mənə bir vədə ki, yarın oluram,
Az yaratmış belə surət bizi heçdən yaradan.

Ey Zəfər, şükri-Xuda eylə ki, rəzzaqdürür,
Yetirir ruzini, bilməz kişi gəldi nərədən.

* * *

Dün gecə düşdü gözüm bir dilbəri-məhparəyə,
Naz ilən girmiş idi suyə ki, zülfin tarəyə.

Xali hindusin görüb oldu könül atəşpərəst,
Ondan ötrü mərdümi-çeşmüm giripdir qarəyə.
Məh yüzinə zülfi-mişkinin pərişan eylədi,
Qoydu mərhəm ləbləri könlümdə olan yarəyə.

Gözlərinin camidən məxmur idim, oldum xərab,
Rəhm qıldı, verdi bir sağər məni-biçarəyə.

Tazə güldür kim, nəzər bağında bulmuş pərvəriş,
Vermək olmaz ol güli, çün tazə gəlmiş arəyə.

Gözdən axan yaşimi bildi ki, mərdümzadədir,
Nisbəti yoxdur onun hər su gələn fəvvarəyə.

Yüzümə açdı, Zəfər, bağlı qapılar sübhdəm,
Eylədi ahım əsər ol dilbəri-xunxarəyə.

* * *

Şükr kim, gəldi mənim yanıma yarım bu gecə,
Fələkə çıxmış idi naləvü zarım bu gecə.

Qalmamışdı dili-zarımda zəmani təmkin,
Yerinə gəldi yenə səbrü qərarım bu gecə.

Yaxmış idi tənimi atəşi-hicran danadən,
Vəsli-yar oldu halım, sordu nigarım bu gecə.

Şiddəti-qəm belimi əgmiş idi çövkan tək,
Rast oldu yenidən qaməti-zarım bu gecə.

Ey Zəfər, könlüm ara qalmadı bir çü qəmü bim.
Çünki düşdi əlimə çeşmi-xumarım bu gecə.

* * *

Şəbabi-ömr keçdi, ey könül, gəl yarı tərk eylə,
Cünuni-eşq düşmüş başına, dildarı tərk eylə.

Ağartdı başını şeybin havası, qamət olmuş xəm,
Xəyali-çeşmi-məstü qəmzeyi-xunxarı tərk eylə.

Əcəl peyki yavuqlaşdı, oyan yuxudan, ey qafil,
Dimağindən həvayi-zülfi-ənbərbarı tərk eylə.

Əyibdir belini möhnət, düşübdür ayağə başın,
Əcəl yetdi, belindən rişteyi-zünnarı tərk eylə.

Yenibdir kim əcəl peymanəsin nuş eyləyə kamın,
Könüldən nəşeyi-ol dideyi-xummarı tərk eylə.

Yetişdi qulağə gülbangi-rehbət dəhr bağından,
Gəl indi bu tamaşayi, güli-gülzari tərk eylə.

Zəfər, cahil degilsən, eşq sevdasın çıxar başdan,
Gəl imdi zülfdən belindəki zünnarı tərk eylə.

## TƏRKİBBƏND

Mənəm ki, cümleyi-üşşaq ara bu gün ələməm,
Müqimi-dərgəhi-Sultan Səfiyi-pür kərəməm,
Əgərçi müflisəm, əmma fəqiri-möhtərəməm,
Yolunda verməyə can demə kimsədən ki, kəməm,
Əlimdə yox isə can nəqdi ilə möhtəşəməm.

Gözüm yaşı tökülən yerdə dürrü mərcandır,
Fəqir hədiyyəsi sultanə töhfeyi-candır.

Cəfayi-çərxi-fələkdən həmişə məmnunəm,
Əgər riayətin etsə qəminü məhzunəm,
Şikayət eyləsəm ondan, onun kimi dunəm,
Xəyali-Leyli ilən adı bəlli Məcnunəm,
Deme ki, cövrü cəfadən dəmi digərgunəm.

Apardı könlümü əldən o yar pünhani,
Qıya-qıya baxışı olmuş afəti-cani.

Mənəm dəva yerinə dərd qılmışam hasil,
Deməm ki, rəngü rüxi-zərd qılmışam hasil,
Könüldən ahü dəmi-sərd qılmışam hasil,
Rəqib gözlərinə gərd qılmışam hasil,
Kuyində it kimi şəbgərd qılmışam hasil.

Ki, gecə dana dəgin edə naləvü fəryad,
Nə qurtula o cəfadan, nə xod ola dilşad.

Hümayi-tarəmi-Qüdsəm könül həvasilən,
Əlaci-dərd edirəm xublar dəvasilən,
Təlaşə düşdi könül eşq macərasilən,
Bəlayə düşməmişəm özgələr rizasilən,
Xoşam həmişə siyəhzülflər bəlasilən.

Şükr ki, gərdişi-dövran mənim muradimcə,
Həqiqəti-əməlim hüsni-etiqadimcə.
Deyin əduyə mənim halimə nəzər qılsın,
Ədəb riayət edib ahdən həzər qılsın,
Olur dəmi ki, dua canına əsər qılsın,

Gəda kimi onu aləmdə dərbədər qılsın,
Rəvani it kimi tən mülkdən səfər qılsın.

Çəkər yəman kişidən çərx intiqami-zəman,
Öninə yaxşı gəlir yaxşının, yəmanə yəman.

Həqiqət əhli olan yerdə qeylü qal olmaz,
Zəmiri saf olanın könlündə məlal olmaz,
Günəş yüzündə şəhadətdən özgə xal olmaz,
Cəhanə feyz verir, özi paymal olmaz,
Pənahımızdır o kim, mülkinə zəval olmaz.

Həmişə ondan olur bəndəsinə fəthü Zəfər,
Yəqinü sidqin ilə bağla xidmətinə kəmər.

Onu ki, gül yaradıbdır, cəhanda etməz xar,
Həsud hiyləsi iqbalı eyləməz idbar,
Əgərçi afətü rahətdədir bu leylü nəhar,
Könlini qönçə tək açar nəsimi-fəsli-bahar,
Gətir piyaləni, sal gərdişə, gül yüzlü nigar.
Ki, hər kim oldu əzəldən cəhanda dövlətmənd,
Yetirə bilməz onun dövlətinə xəlq gəzənd.

Düşüşdü gərçi mənimlə bu çərxi-buqələmun,
Zəfər tapıb eylədi bəxt rayətini nigun,
Könül cəfayə dözüb vəz′in etdi digərgin,
Yenə vəfayə dönüb eylədi bəsi gərdun,
Budur həmişə onun işi, olmagil məhzun.

Müdam ol güli-rənanın içdügi qandır,
Vəli dun eylədügindən bu gün peşimandır.

Zəfər, Füzuli demiş əhdinə vəfa qılgil,
Yetər şikayət edib şərhi-macəra qılgil,
Vücudini hədəfi-navəki-bəla qılgil,
Qəmu cəfalərinə səbr edib dua qılgil,
Niyazü əcz ilə dur ərzi-müddəa qılgil.

Ki, həqdir qəmunun cümlə işinə bani,
Zəmanə mülkinə aldanmagil, olur fani.

## MÜSƏDDƏS-TƏRKİB

Hər gün çəkdin isə dəhr ara yaxşı-yəman,
Ta əbəd etməyəcəkdir belə gərdiş bu cəhan,
Olmadı çərxi-fələk gərdişinə kimsə zəman,
Bədgüman olmagilən, səbr qıl, ey ruhi-rəvan,
Əlinə düşdü bu dəm daməni-bir rahəti-can,
Qalmadı tünd axan sudə səlamət bu kuzə.

Ey şəha, pir olub qalmadı göz evində nur,
Verdigin mujdə bizə oldu neçün vədəsi dur,
Yüzinə baxmanam ər şimdi gələ yanıma hur,
Bəndədən nifrət edər bəzmim ara yari-qəyur,
Əyağım biri bu dünyadə, biridir ləbi-gur,
Vergilən nurini töxmini salan o gözə.

Ey könül, yar gəlib dərdinə qəmxar oldu,
Deməgil qəm əlidən könlümüz əfkar oldu,
Şükr kim, qəm yükü arxamda səbükbar oldu,
Dövlətin dönmüş ikən gəldi, Zəfər, yar oldu,
Düşmənin dəhr arasnıda qəmu xar oldu,
Xunfəşan olma dəxi, rəhm eyləgil iki gözə.

**MÜXƏMMƏS-TƏRKİB**

Bülbüli-şeyda kimi oldum gülüstandin cüda,
Zarü nalan olmuşam gülbərgi-xəndandin cüda,
Ney könül açıldı qəmdən hurü rizvandin cüda,
Ney nəva saz eylədi bülbül gülüstandin cüda,
Tutiyəm, könlüm açılmış şəkkəristandin cüda.

Ta edibdir ayrı cami-vəsldən canan məni,
Təlxkam etdi bu dövran badəsindən can məni,
Hər nəfəsdə öldürür qəm zəhrdin hicran məni,
Müstəmənd etdi bu dürlü dərd ilən dövran məni,
Ol zəmandan ta ki, düşdüm vəsli-canandin cüda.

Bəsdürür, ey xari-hicran, canıma sancılmagil,
Dilbərin cövrinə qatlan, bivəfalıq qılmagil,
Ta nəfəs vardır bədəndə, kuydən ayrılmagil,
Ey könül, səbr eylə sən, həm qeyriyə meyl etməgil,
Deməgil dövri-fələk saldı məni ondin cüda.

Ol qədər eşq atəşinə cismü canım yandılar,
Gecələr də şəmvəş pərvanələr oyandılar,

Sübh olanda mürdə şəm′i cümləsi kül sandılar,
Ondan ötrü yas tutubən külünə boyandılar,
Çərx etdi onları şəm′ü şəbistandin cüda.

Hər könül kim, qaldı tənha bir güli rüxsarsız,
Bülbülə bənzər ki, qalmışdır güli gülzarsız,
Qalmasın heç kim Zəfər tək bu cəhanda yarsız,
Bir yiyəsiz kimsə dönmüş, yarsız, dildarsız,
Olmasın, yarəb, zəmani bəndə sultandin cüda.

* * *

Hər kişi dünya evində oldu amil, ey könül,
Yoxdurur onun başında əqli-kamil, ey könül,
Bir nəfəs qəflət yuxusundan oyangil, ey könül,
Keçdi cahillik zamanı, olgil aqil, ey könül,
Bir nəsihətdir sənə məndən, eşitgil, ey könül.

Dövləti-dünyayə uymagil, sənə ol al edər,
Sahibi-cah eyləyəndə fikri-mülkü mal edər,
Səylər kim eyləmişdin, cümləsin pamal edər,
İki gün rahət verəndə salü məh bədhal edər,
Bolmagil divanəvü olgilən aqil, ey könül.
Bir güli-rənayə bənzər dövləti-dünyayi-dun,
Gəh qızarmaq, gəh saralmaq işləridir vajgun,
Ta ki, fürsət əldə vardır, olmagil ondan zəbun,
Aqibət salır başına fikri-sövdayi-cünun,
Özini zaye edər cəhlilə cahil, ey könül.

Damənin qoyma əlindən, saqi, bəzminin müdam,
Çıxarır qəmdən səni mey söhbətivü rəqsi-cam,
Öz əlinlən tutgilən işin, etməgilən fikri-xam,
Bu iki-üç dilbər ilən söhbət eylə sübhü şam,
Bunların söhbətidir insani-kamil, ey könül.

Ey Zəfər, xeyr əksük etmə müstəhəqdən bir zəman,
Yaxşıya yaxşı gəlir, yəmanlara qalır yəman.
Kimsəyə qılmaz vəfa bu gərdişi dövri zəman,
Hicr əlindən şimdi olmuşdur qədin misli-kəman,
Olmagil Həq dərgəhindən heç qafil, ey könül.

* * *

Bu cəhanda şami-qəmsiz işrət olmaz, ey könül,
Sübhi-eyşin istəmə bişami-firqət, ey könül,
Ayrı olmaz bir-birindən nurü zülmət, ey könül,
İşrət odu yanmadı bidudi-möhnət, ey könül,
Beh ki, vəsli içrə yanə şəm′i-ülfət, ey könül.

Bivəfadır bu qədimi deyr ara bu köhnə taq,
Kim ki, içdi vəsl camın artı onda iştiyaq,
Vəsl çün mümkün degildir, səkməgil dərdi-fəraq,
İçməyənə dərd verdi, içənə verdi fəraq,
Zinhar ol cahə sarı qılma rəğbət, ey könül.

Gər fələk döndü isə, cövri sənə oldu əyan,
Xəlq ilən amiziş etgil, eylə kim, abi-rəvan,
Ülfət ilə ta ki, külfət götürülsün əz miyan,

Söz danışmaq babdə ol tutiyi-şirinzəban,
Əql ilən peyda olur əsbabi-dövlət, ey könül.

Mənsəbi-dünya həsədsiz olmaz, ey rövşənzəmir,
Fitnə etmək peşəsidir gözləməz bürnavü pir,
Əlli il çəkdim cəfasun, axırı qıldı əsir,
Bir ulu sultan ikən etdi məni zarü həqir,
Çöhrəsindən bəllidir asari-nikbət, ey könül.

Əlhəzər, bu çərxi-dunun hiyləsindən əlhəzər,
Cövrünə səbr eyləgil, ta olmasın yövmül-bətər,
Xoş məsəldir kim, səfərdən mənfəətlidir həzər,
Şükr edib otur yerində, qıl ibadət, ey Zəfər.
Qoyma əldən bir nəfəs damani-ülfət, ey könül.

vV

## TƏRZİ ƏFŞAR

*Şah Səfi və II Şah Abbasın müasiri olmuşdur. M.T.Nəsrabadi XVII əsrin 70-ci illərində şairin artıq dünyada olmadığını göstərir. Şair Urmiya yaxınlığındakı Tərzi kəndindən olub. Tərzi təhsilini bitirdikdən sonra Şərqin bir sıra ölkələrinə səyahət etmiş, İraq, Hicaz, İran, Orta Asiya, Hindistan, Kiçik Asiyada, Cənubi və Şimali Azərbaycanda olmuşdur. Şamaxı və Gəncəyə dəfələrlə gəlibdir.*

*Tərzi Əfşar şerə yeni forma gətirmək məqsədi ilə fars sözlərinə Azərbaycan şəkilçiləri əlavə edir, fars şəkilçilərini azərbaycansayağı işlədir, adlardan fellər düzəldirdi. Onun farsca şeirlərində, bol-bol Azərbaycan sözlərinə, ifadə və cümlələrinə rast gəlirik.*

### II ŞAH ABBASA QƏSİDƏ

Pərvazlandı dil yenə bağdadlanmağa,
Ol bürci-övliyayə qonub şadlanmağa.
Ol xaki-pak təki hanı sərzəmin dəxi,
Qəm payvəndini qırıb azadlanmağa.
Məcnunəmu o xakdə çapurə eylərəm,
Yox taqətim cilaldə fərhadlanmağa.
Kuh ilə mıxlanmadı səhra o Bağdad,
Yəni ki, övliya ilə övtadlanmağa.
Rahi-fənada tuşeyi-təqva yetər mana,
Yox iştaham yolda mənim zadlanmağa.
Ta Dəcləvü Fəratə gözüm odu aşina,

Yarü diyar yadə gəlür yadlanmağa.
Cənnatdən bəxil edər əxbarü təhtiha,
İnhar axır Fəratdən ustadlanmağa.
Bağdad bir xocəstə məkani-şərifdir,
Kövsafi rast gəlməza edadlanmağa.
Seyri-miyani-səhr qılıb yaxşı yaraşır,
Cisrin kənarı yarilə miadlanmağa.
Seyri-sitarəvəşlərə hər kuçə kəhkəşan,
Dövründə bürci-sabitə irsadlanmağa.
Hərgəh ki, eylərəm Nəcəfü Kərbəlanı yad,
Sığmaz zəmini-xüldi-bərin yadlanmağa.
Haşa ki, gər yerim İrəm olsa, riza verəm,
Ol büq′eyi-şərifdən əb′adlanmağa.
Salmanında müzceyi darüs-səlam olan,
Yarəb ki, onda sal bəni məqdadlanmağa.
Xoş dilgüşa məqamdır, əmma nə faidə,
Qoymaz yəzidlər bizi dilşadlanmağa.
Ta mövridi-müxalif olubdur şətti-Fərat,
Mömin məzaqı meyl edə mürdadlanmağa.
Biz bəndələr ol Kəbeyi-amalın əhliyiz,
Yarəb ki, qoyma onları mötadlanmağa.
Bağdadımız xərabdır, əmma ümid var,
Abbas əlilə əl verə abadlanmağa.
Xoş ol ki, tapa nəşvü nüma Bağdaddə.
Şahın nihalı-qaməti şimşadlanmağa.
Abbasi-sani ölkəsinin guyi ar edər.
Cəmşid ruzigarilə həmzadlanmağa.
Ol seyyidəl-mülük ki, cəddi-mükərrəmi,
Əflak baisidir icadlanmağa.

Ta müjdeyi-vücudi-şərfi verilmədi,
Adəm aradə qalmadı övladlanmağa.
Darəd həsud u təmə anke çun vid,
Çün arizuyi-divo pərizadlanmağa.
Ə′da ki, xuni-fasidə məsrufdur təni,
Xoşdur Sinan şahla fəsadlanmağa.
Bədxah xaksarı başı tərpənir, vəli,
Şəmşiri-abdar ilə bərbadlanmağa.
Çoxlansa tirə bəxt ədusi, nə qəm gəlir,
Şahinə qarğa zərbəsi səyyadlanmağa.
İqbal şahi-təxtiyə bağlar ədu əlin,
Leyla cələsinə ərseyi-nərradlanmağa.
Davudvar əzmi anı mumlandırar,
Düşmən tədəbbür ilə fuladlanmağa.
Bərmək hanı ki, ba bu kərəm bişə kamilin,
Şagirdi ola bəzldə ustadlanmağa.
Hatəm budur, təriqeyi-ehsanda, leyk onun
Bəxşişdə taleyi var idi adlanmağa.
Ol baniyi-bənayi-ədalət ki, dəhrdə
Bünyani-zülmi qoymadı bünyadlanmağa.
Nəti-zəmin xütteyi-Bağdad yaqışır,
Edayi-dinü dövləti cəlladlanmağa.
Şahənşəha, kəminə duaguyi-Tərziyəm,
Mürşid dərinə gəlmişəm irşadlanmağa.
Nuşirəvani-vəqtsənü zilli ədlinə,
Çoxlar gəlir ümmidilə imdadlanmağa.
Mən həm sitəmkeşideyi-zülmi-zəmanəyəm,
Yet dadə, qoyma bəndəni fəryadlanmağa.
Virdim duayi-şahi ədalətpənahdır,

Hər ki, əzimət eylərəm övradlanmağa.
Ta sədri-mələk ruh verür çari-təb′ə sülh,
Hərgəh qılır mülahizə əzdadlanmağa.
Ömrün binası qaim olub, kimsə düşməsin,
Dövründə cövrü zülmlə bidadlanmağa.

## QİTƏ

Tərzi mənəm ki, hasidə atəş aloviyəm,
Tazə sözün bilərək tazə qilaviyəm.
Qədri-tilayi-xalisimi cövhəri bilir,
Nadan yanında xakilə gərçi müsaviyəm.
Kutah nəzər görür məni yerdə günəş kimi,
Surətdə gərçi ərziyəm, əmma səmaviyəm.
Bizayiqə yanında yavan aşə oxşaram,
Ağzı dadın bilənlərə Gilan çilaviyəm.
Tərziya, filməsəl öküzəm hər diyarda,
Əfşar eli içində vəli ev buzaviyəm.

## RÜBAİLƏR

Qəm çəkmə, dila, Həcc yolu o dərdir,
Kim xaki-rəhi-Hicaz taci-sərdir.
Mir hacımızın himməti-əlasından,
İnşəallah, Həccimiz əkbərdir.

* * *

Bir gül məni xarü zarü heyran etdi,

Könlümü həzin, didəmi giryan etdi.
Nərgisləri tək eylədi bimar bəni,
Zülfi kibi halımı pərişan etdi.

* * *

Xana, sənə salü mah bayram olsun,
Məşriqvəş əlində gün kibi cam olsun.
Nemət çoxü düşmən yoxü məhbubə mübah,
Dövründə müdam böylə əyyam olsun.

vV

## SAİB TƏBRİZİ

*Məhəmmədəli Saib Tərbizi (1601-1677) Təbriz şəhərində dünyaya gəlib. Ailəsi I Şah Abbasın əmri ilə İsfahana köçürülüb. Şərqin bir sıra ölkələrini səyahət etmiş şair II Şah Abbasın dövründə Məliküş-şüəra təyin edilib.*

*Saib Şərq poeziyasının bir çox janrlarında dəyərli əsərlər yazmış, «hind səbki»nin ədəbi üslub kimi formalaşıb inkişaf etməsində böyük xidmətlər göstərmişdir. Yüz iyirmi min beytə yaxın ədəbi irsinin əsas hissəsi farsca yazılıb. Azərbaycan türkcəsində yazdığı şeirlərdən şairin Füzuli ədəbi ənənələrinin davamçısı olduğunu görürük.*

vV

Nə ehtiyac ki, saqi verə şərab sənə –
Ki, öz piyaləsini verdi afitab sənə.

Şərab ləli içün tökmə abiru zinhar –
Ki, dəmbədəm ləbi-ləlün verir şərab sənə.

Əgər urum daşa peymanəni keçür bəndən,
Şərabdən neçə göz tiksə hər hübab sənə.

Qurutma tərli üzarın içində badeyi-nab –
Ki, gül kimi yaraşır çöhreyi-pürab sənə.

Şərabdən nə əcəb olmusan əgər sərxoş?
Bu duzlu ləblər ilən neyləsin şərab sənə?!

Bu atəşin yüz ilən kim tutar sənin ətəgin,
Həlal elər qanını, ta yetər kəbab sənə.
Dedim çıqarə səni xət hicabından qafil –
Ki, ol qübar olur pərdeyi-hicab sənə.

Sənin səhifei-hüsnün kəlami-Saibdir –
Ki, daği-eyb olur xali-intixab sənə.

* * *

Aşiqin göz yaşına rəhm eyləməz ol afitab,

Yığlamaq ilə aparmaz od əlindən can kəbab.

Baş verəndə xəncəri-sirabuna yetməz mənə,
Gərçi sanır özünü başdan keçənlərdən hübab.

İçdi qanlar ol sitəmgər ta kəbab etdi məni,
Çəkdi oddan intiqamın dönə-dönə bu kəbab.

Xak oldum ol kəmanəbru oxun seyd etməgə,
Bilmədim gög yayidən düşməz yerə tiri-şəhab.

Gər tutuşsa atəşi-rüxsaridən, yerindədir,
Eyləsin aşiqlər ilən neçə yüzsizlik niqab.

Şəfqət ilə bir kərə başın götür torpağdən,
Neçə yolunda şəfəqdən tərləsin qan afitab.

Fariğəm səngi-məlamət içrə cövri-çərxdin,
Neyləsin göhərdə olan suya mövci-inqilab.

Əqli-eşq etmək söz ilən səhlü asan görünür,
Baş ağardı nafə tək, ta qanın etdi mişknab.

Sanmiya hər kim fəna dünyada mövcud özünü,
Daxili-cənnət olur məhşərdə Saib, bihesab.

* * *

Əldən çıxaram zülfi-pərişanını görgəc,
İşdən gedərəm sərvi-xuramanını görgəc.

Susuzlara gər can axıdar çeşmei-heyvan,
Mən can verərəm çeşmei-heyvanını görgəc.

Gər bağlamısan el gözünü şərmi-üzarın,
Candan kəsilir xəncəri-müjganını görgəc.

Reyhan ki, nəzakət tökülürdi qələmindən,
Xət yerə çəkər zülfi-pərişanını görgəc.

Bülbül ki, gülün ləli-ləbindən söz alırdı,
Dili dolaşur qönçei-xəndanını görgəc.

Rizvan ki, behiştin yemişi gözünə gəlməz,
Dişlər əlini sibi-zənəxdanını görgəc.

Tərdən xəti-reyhan vərəqin pak silibdir,
Nəqqaşi-gülüstan, xəti-reyhanını görgəc.

Gülrəng olur sübh iki qanlu tərindən,
Xürşidi-üzar möhriqi-əfşanını görgəc.

Müjgani olub qanlu yaşından rəgi-yaqut,
Saib, ləbi-ləli-göhərəfşanını görgəc.

* * *

Olmadı xürşiddən dağlada rəngin qaşlar,
Gördülər ləli-ləbin, qan tərlədilər daşlar.

Qıldı peyda hökmi-təqvimi-kühən gül dəftəri,
Açdılar ta çöhrei-dildarımı nəqqaşlar.
Qılmadılar sinei-əfkarımı amacgah,
Əksük etdilər bizimlən ol müqəvvəs qaşlar.

Aşiqi-sadiq bilir səngi-məlamət qədrini,
Məxzəni-sultana layiqdir bu yarar daşlar.

Günü gündən el dedüm tərk etməsün yoldaşlığı,
Çün qara oldu günüm, yad oldular qardaşlar.

Yol əgər həqdür, çəkər yolsuzdan axır intiqam,
Yola tapşır, çıxdılar yoldan əgər yoldaşlar.

Oldu məğlubi-həvai-nəfsi-istilai-əql,
Aldılar hakim əlindən ixtiyar ovbaşlar.

Çün könül binur olub mütləq ənan alır həvəs,
Qaş qaralanda çıxarlar yuvadan xəffaşlar.

Mehriban olmaz nəsimi-sübhdəm hərgiz sənə,
Şəm tək ta tökməsən, Saib, gözündən yaşlar.

* * *

Aşiq qanını vəsməlü qaşın nihan içər,
Cövhərlü tiğ qın ara peyvəstiə qan içər.

Etdikcə qan könülləri ol ləli-atəşin,
Abi-həyat tək qara zülfün rəvan içər.

Ta bir piyalə verdi, kəbab etdi bağrımı,
Hər kim anın əlindən içər badə, qan içər.

İllər yaşar Xızr kimi hər kim ki, gecələr,
Gül üzlü yar ilən meyi çün ərğavan içər.
Adəm nədür ki, içməyə, sən  verdügin şərab,
Versən əgər firiştəyə mey, bigüman içər.

Saqi, mənimlə şişeyi-peymanə neyləsün,
Dəryani bir nəfəsdə bu rigi-rəvan içər.

Tezraq çəkər nədamətə bədməstlik yolu,
Hər kim ki, yaxşı içsə şərabi, yaman içər.

Saib, çü mən anın sözünü yerə salmadım,
Bilməm neçün mənim qanımı asiman içər.

* * *

Gül kimi hər kim ki, gülzar içrə nəqdi-canı bar,
Səy elər töksün sənin yolunda ta imkanı bar.

Ta ayağın toprağına tökməsün tutmaz qərar,
Hər kimin məclisdə mina tək bir ovuc qanı bar.

Nə əcəb aşiqlərin gər başdan açsın naz ilən,

Kakili-mişgin kimi hər kim ki, sərgərdanı bar.

İçməmiş can bəxşlər nəzzarədən üşşaqlara,
Tərlü rüxsarun əcaib çeşmeyi-heyvanı bar.

Eyləyibdir nöqteyi-xalın məni pərkarsız,
Yoxsa dərya üzrə hər bir qətrənin dövranı bar.

Gəzdirərlər əlbəəl dağın könüllər parəsi,
Yerdə qalmaz cam tək hər kim ki, isti qanı bar.

Puçdur hər söz ki, derlər mərifətdən əhli-qal,
Bəhrdən çıxmaz sədəf ta gövhəri-qəltanı bar.
Çox degül heyrət yeri, gər barsa şirin sözləri,
Tutinin, Saib, nəzərdə güzgi tək meydanı bar.

* * *

Məni məhrum edən rüxsardin zülfi-pərişandur,
Bu dəryayi-lətafət mövci-ənbər içrə pünhandur.

Əgər xürşidi-taban ilə sənsiz həmşərab olsam,
Ləbi-ləli-meyaludi gözümğə qanlu peykandur.

Dədü dami müsəxxər eyləyibdir cəzbeyi-eşqin,
Dügün Məcnuni-şeyda başına çətri-Süleymandur.

Qaçan aşiqlərin fikrinə düşər ol əqiqi-ləb –
Ki, anın bir qara gözlülərindən abi-heyvandur.

Məni məkri-rəqib avarə qıldı yar kuyindən,
Çıxaran Adəmi firdosdən təzviri-şeytandur.

Müsəlmanam, deyir məstin, içir aşiqlərin qanın,
Mənəm kafir, əgər ol düşməni-iman müsəlmandur.

Məhəbbət əhlinin cami-nişati dövrdən düşməz,
Niçün çəksün xümar ol kim, həmişə içdügi qandur?

Məni-xaki nə tənha olmuşam Məcnun kimi rusva –
Ki, ol dərddən fələk səngi-məlamət içrə pünhandur.

Fələklər qan içər gördükdə təcrid əhlini, Saib –
Ki, yuxsizlər, haramilər göziğə tiği-üryandur.

* * *

Çıxardı xətt, mənəm zülf mübtəlası hənuz,
Dügün sağaldıvü başımdadır qarası hənuz.

Xətin ğübari quyaşin əgərçi yaşurdi,
Gözümi xirə qılur yüzinin səfası hənuz.

Bahar edəndə nə qanlar ki, tökdü gözlərdən,
Xəzan olanda nələr eyləsün hənası hənuz.

Suvardılar qılıncından məgər gülüstanı –
Ki, bir-birinə qavuşmaz gülün yarası hənuz.

Həyat suyuna bir dağ qoydu rəşgi-ləbin –
Ki, keçdi ömri-əbəd, düşmədi qarası hənuz.

Mühiti-eşq ara mən ol hübabi-bibakəm –
Ki, getdi başımü başımdadır həvası hənuz.

Vüsal ümidinə ömrün keçirdi kuyində,
Yetişməz işlərinə Saibin duası hənuz.

* * *

Tutulmuş könlümü cam ilə şadan eyləmək olmaz,
Əl ilən püstənin ağzını xəndan eyləmək olmaz.

Nə sözdür bu ki, olsun sahibi-məşrəb quru zahid,
Qara torpağı hərgiz abi-heyvan eyləmək olmaz.

Bulut qının kəsər cövlan edəndə ildırım tiği,
Könüllər pərdəsində eşqi pünhan eyləmək olmaz.

Mənim göz yaşımı çıxgil fələklərdən tamaşa qıl,
Hübabi qəsrlər içində tufan eyləmək olmaz.
Qılıc gər içsə aləm qanını sirablıq bilməz,
Səni üşşaq qətlinən peşiman eyləmək olmaz.

Məni-Məcnuni aqil eyləmək mümkün degil, naseh,
Söz ilən müşknab olan qanı qan eyləmək olmaz.

Xətadan keçdi ceyran, qanını müşk eylədi Saib,
Demə, üsyanı taət, küfri iman eyləmək olmaz.

* * *

Meydan ol çöhreyi-ziba ərəqəfşan olmuş.
Ya sərasər göz olub yözinə heyran olmuş?

Bu görən dairəni halə güman etmə ki, çərx
Ağzın açub məhi-şəbgərdümə heyran olmuş.

Gözdən iraq ki, bu sultani-cünun şövkətidən,
Hər dügün başıma bir çətri-Süleyman olmuş.

Ləbi-ləlin ğəmidin bəs ki udupdular qan,
Xublarun daş yürəgi kani-bədəxşan olmuş.

Ta görüpdür nəzərün var oqilən, ey qaşı yay,
Gül üzün cəm  qılub qönçeyi-peykan olmuş.

Saf edəndə ləbi-canbəxşini dövran əlidən,
Bir-iki qətrə damub çeşmeyi-heyvan olmuş.

Rəhm qıl Saibə, saqi, mey ilən tut əlini,
Necə içsün qanını bu yürəgi qan olmuş?

* * *

Xəti-qübari arizin ayati-Quran eyləmiş,

Hüsni-sahib şövkətin muri-Süleyman eyləmiş.

Noqtei-səhv eyləyüpdir gözlərin ceyran gözün,
Qaşların bayram hilalın taqi-nisyan eyləmiş.

Azdurupdur gül yüzün bülbülləri gülzardən,
Sünbülün reyhan xətin torpağa yeksan eyləmiş.

Kəbəni bütxanə edüpdür firəngi gözlərin,
Yer yüzün zünnar, zülfün kafəristan eyləmiş.

Başını xəti-şüa ilən tutubdur afitab,
Ta mənim çapük səvarım əzmi-meydan eyləmiş.

Ləli-meygunin ki, içibdir bədəxşan qanını,
Qönçəni bülbül gözünə qanlı peykan eyləmiş.

İltifati-ləli-canbəxşin qara günlüləri,
Xəlq içində pərdədari-abi-heyvan eyləmiş.

Dərdi-eşqin çöhrei-zərrin ilən yer yüzünü,
Səfhei-xurşidi-təban tək Zərəfşan eyləmiş.

Mövci-dəryayi-ehsanın tutubdur yer yüzün,
Tərlü rüxsarun cahani şəhri-yunan eyləmiş.

Cilvei-badi-bahari-iltifatın gül kimi,
Könlümü min çak ilən dəsti-giriban eyləmiş.

Nə əcəb gər Saib ilən xəttini qıldım rəqəm,
Xəti-xalın böylə çox kafər müsəlman eyləmiş.

* * *

Ömr keçdi, səfər əsbabını amadə qılın,
Hər nə sizdən kəsə tiği-əcəl, andan kəsilin.

Qülzümi-eşqdən, ey ayrı düşən həmdəmlər,
Düşmüşikən yola silabi-bahari yığılın.

Ta sizi dövri-zəman eyləməyüpdür pamal,
Gün sarı şəbnəmi-gül tək bu çəməndən çəkilin.

Olmayan çərx ara pərvanə rəvandan ğafil,
Bu gül ilən qaralan güzgüləri saf qılın.

Gög fəzası nə məqami-pəru bal açmaqdır,
Danei-nar kimi bir-birinizə qısılın.

Gər umarsız ki, cavanbəxt olasız axiri-ömr,
Qocalar qədrini, zinhar, igidlikdə bilin.

Artırır gərdi-məasini quru istəğfar,
Bu zəmingir tozu əşki-nədamətlə silin.

Yaş qılır xəm qocalar qamətini taətsiz,
Əgməmişkən sizi bu çərxi-müqəvvəs, əgilin.

Tuta gər qönçə kimi çevrənizi nəştəri-xar,

Verməyin gül kimi əldən qədəhi-mey, açılınn.

Kim ki sağər kimi ağzın açasız mina tək,
Gülə-gülə kərəm ilə anı məmur qılın.

Badənin cuşi anın suzi-kəlamundandır,
Saibin qədrini, ey əhli-xərabat, bilin.

* * *

Tutma ol gül damənin məhşər günüdə can üçün,
Qılma yüzsüzlığ nigar ilən bir ovuc qan üçün.

Açmagil ağzın, görəndə xali-mişkin danəsin,
Əkmə baş pərgar tək hər nöqtəyə dövran üçün.

Yoldaş oldur kim, qara günlərdə yoldan çıxmasın,
Keçmə yoldaşdan Xızır tək çeşmeyi-heyvan üçün.

Yengi ay başın əgər xürşidə ta olsun tamam,
Sadədil bilməz ki, bəslər özünü nöqsan üçün.

Məşrəb üçün qoymagil, əldən ənani-ixtiyar,
Xamiliqdən atuni öldümə ki, meydan üçün.

Hüsni-cövlanindən əl kəsməkdir arvadlar işi,
Kəs özündən mərdilər tək Yusifi-Kənan üçün.

Minnət ilən dirilik, Saib, ölümdəndir betər,
Can verərlər əhli-qeyrət dərdi-bidərman üçün.

* * *

Məhi-şəbgərd əgər görsün anın xurşid rüxsarın,
Kəmənd eylər anı seyd etmək üçün halə zünnarın.

Şəkərxənd eyliyəndə  neyləsin üşşaq ilən yari –
Ki, aci sözlər ilən can verür ləli-şəkərbarın.

Deyirlər dərdmənd olan bilər həmdərd halını,
Yetişməz xəstələr halına neyçün çeşmi-bimarın?

Necə məhv olmasun adəm anun seyranını görgəc –
Ki, ceyran unudubdur vəhşətin gördükcə rəftarın.
Nə layiqdür ki, eşq əhli qıla qan içdügin zahir,
Niçün bülbül yaşırmaz el gözündən qanlu münqarın?

Süpehri-səngdil  içrə mən ol Fərhadi-tərdəstəm –
Ki, abi-tişədən kani-zümrüd qıldı kuhsarın.

Məgər ol afitab ilən şəfəqgun mey içər Saib –
Ki, sərxoş mey çəkər yer üzrə hər gün sübh dəstarın.

* * *

Saqiya, meydən rüfu qıl çak bolmuş könlümü,
Qıl bu işi qan ilən peyvənd yüzülmüş könlümü.

Qalmışam yerdə qanadsız quş təkin pərvazdan,

Yola sal cami-şərab ilən büzülmüş könlümü.

Artıq eylər badei-safi mənüm viranlığım,
Dərd ilən təmir qıl, saqi, pozulmuş könlümü.

Zöhddən qan quruyubdur bağrım içrə lalə tək,
Tazə qıl əski mey ilən bu qurumuş könlümü.

Lütf qıl səhbai rövşən birə, ey mahi-tamam,
Bayram ayı eyləgil, qəmdən bükülmüş könlümü.

Cam urmaq rəsmdir, saqi, tutulmuş ay üçün,
Seyqəli-cam ilə pərvaz et tutulmuş könlümü.

Eylə kim, Saib, qəmi-dövran tutubdur çevrəmi,
Seyri-gül mümkin degül açsın tutulmuş könlümü.

* * *

Biz nə imdi zərrə tək cövlanə gəlmişlərdənüz,
Afitabi-eşq ilən dövranə gəlmişlərdənüz.

Gün keçirməkdir hesabi-şahid əgrilik üçün,
Doğruluğdan biz bu gün divanə gəlmişlərdənüz.

Sairüz barani-rəhmət gər qılıc kökdən yağar,
Qoç kimi qurban üçün meydanə gəlmişlərdənüz.

## MÜLƏMMƏ

Şahe-mən, dər kuye to key konəm fəryad hey?[1]
Daxi taqət qalmamışdır, dad hey, bidad hey.

Həmdəməm qəm, munesəm qəm, delbəra, qəmxar qəm,[2]
Ey dolanım başına, sənsiz dəgil dil şad hey.

Gəh beeşvə, gəh bəğəmzə, gəh təğafol, gəh benaz,[3]
Aparırsan əqlimi bir şivəgər üstad hey.

Bəs həme şəb dər fəraqət zaro nalan, birəfiq,[4]
Qalmışam zaru-zəlil, ey yari-mən, imdad hey.

Dər dile Saeb bəsi ca kərdəəst çəşmane məst,[5]
İki kafər bir müsəlman öldürür, bidad hey!

* * *

Çıxdı ta məhtab seyraninə ol mişkin kəmənd,
Eylədi mahi-təmami halədin zünnar bənd.

Qılmadı qanlı gözümğə rəhm rüxsarun məgər,

---

[1] Ей мяним шащым, сянин йолунда ня вахта гядяр фярйад едим?
[2] Щямдямим гям, мунисим гям, дилбярим, гямхарым гямдир.
[3] Эащ ишвя иля, эащ гямзя иля, эащ наз иля.
[4] Бцтцн эеъяни сянин айрылыьындан зар, налан вя йолдашсыз.
[5] Сянин сярхош эюзлярин Саибин цряйиндя йер салмышдыр.

Bu yaranı eyləsün xətti-qübarun xüşk bənd.

Ləblərün şəhdi dilün acılığın az etmədi,
Necə şirin eyləsin acı olan badamı qənd.

Kimdir ol məclisdə təzim ilən, yer göstərən,
Qılmaya dilsuzluğ aşiqlər ilən gər sipənd.

Zalim əl çəkməz sitəmdən, çəksə dövrandan sitəm,
Piçü tab ilən nə mümkündür rəhim olsun kəmənd.

vV

## VƏHİD QƏZVİNİ

*İmaddüdövlə Mirzə Məhəmməd Tahir Vəhid Qəzvini XVII əsrin görkəmli dövlət xadimi, şairi və tarixçisi olmuşdur. O, həmin əsrin əvvəlindən sonuna qədər yaşamış və beş Səfəvi şahının dövründə hökumət idarəsində çalışmış, mühasib və vəqayenəvislik vəzifəsindən vəzirlik və sədri-əzəmliyə qədər yüksəlmişdir. Hicri tarixi ilə 1055-ci ildə (1645-1646) sarayın rəsmi tarixçisi kimi, II Şah Abbasın tarixini yazmaq ona tapşırılmışdı.*

*Onun ədəbi irsinə yüz min beytdən artıq şeirləri daxildir ki, bunlar da müxtəlif şeirlərdən başqa «Abbasnamə» əsərini və münşəatı əhatə edir. Berlin Dövlət Kitabxanasının əlyazmalar xəzinəsində saxlanan Vəhidin 487 vərəqdən ibarət külliyatının ilk otuz vərəğində şarin Azərbaycan türkcəsində şeirləri köçürülmüşdür.*

vV

Hərçənd dil tilsimi-qəmi-bikəranədür,
Sındır desəm, yenə sölə, bunlar bəhanədür.

Hər yerdə kim, dəmağ olur, tər könül qonar,
Hər xaru xuşk bülbülə bir aşiyanədür.

Məzmunidür bu kim, edə gör xəlqdən kənar,
Məcnun hədisi mən dedigüm bir fəsanədür.

Var dudman hüsndən ol şəmi-yadigar,
Min xar hasili bu nihali-yeganədür.

Çün bəstə-bəstə şərm alub vəsldən gözüm,
Şani-əsəl kimi ürəgim xanə-xanədür.
Bir müşti-xarə bağlama dil əndəlibtək,
Bu dam həlqə sinə demə, aşiyanədür.

Məyus olma, şam gər oldı, səhər gəlür,
İşlər əcəb degil ki, dolanə, zəmanədür.

Birdür çirağ, leyk çirağan görər gözün,
Dünya bənüm gözümdə bir ayinəxanədür.

Sındır xumarını, çü doldurdu gül qədəh,
Çak badə, tövbədən demə, bunlar bəhanədür.

Et zinhar nəqli-mükərrərdən ehtiraz,
Nuşxar edən sözün dəvətək hərzəxanədir.

* * *

Yoxumsa səbrü taqət, olmasın, heyranlığım vardur,
Xəbər səndən yoxumdur, leyk sərgərdanlığım vardur.

Rəiyyət olmuşam nəfsi-xəbisə, qalmışam aciz,
Əgər olsam müsəllət nəfsimə, sultanlığım vardur.

Neçə almaz bəni ol şuxi-bipərva səlamımtək,
Giranəm özümə andən çü bu ərzanlığım vardur.

Sözün, sana əgər gəldün, ola ağır, çəkə bilməm,

Zəifəm, bu səbəbdəndür ki, nafərmanlığım vardur.

Gözün bimarı çün pəhriz edüb, azü çoxa baxmaz,
Sana bir quş qanadı mayə mehmanlığım vardur.

Bu damun həlqəsindən baş çıxarmaq çün degil mümkün,
Pəri turinə düşmüş sövəyəm, heyranlığım vardur.
Bəni üryan edüb əsbabdən sövdayi-eşqindür,
Bəsimdür bu ki, dürri-əşktək qəltanlığım vardur.

* * *

Bağrımı qan eylədün, ey dilbəri-xunxar, hey,
Yet bənüm fəryadimə, bidərd, hey, dildar, hey.

Əndəlibəm, dərmənəm gül, gəlmişəm dərdin dərim,
Açıl, açıl, üzümə gül, ey [gül-i] bixar, hey.

Zülfün açsa könlümi, gör yarəlüdür, yarəlü,
Zəxmimi  nasur edər, ey ahuyi-tatar, hey.

Ləblərün həm qönçə, həm gül, həm qədəh, həm badədür,
Olma, olma xari-bigül, ey güli-bixar, hey.

Gəldi-getdi novbahar, ey qönçei-ləb, açılmadın,
Səndən oldı bunca asan işlərim düşvar, hey.

Bən səni azdırmaq istərdim, sən azdırdun bəni,
Bu nə nazü qəmzədür, ey dilbəri-pərgar, hey.

Könlüm, ey gül, çünki sən açılmadun, açılmadı,
Eylədi bədxuluqun candan bəni bizar, hey.

Gərçi işdən çıxmışam, cana, ayağdan düşmüşəm,
Sən əlim dut, çün bəni saldun ayağdan, yar, hey.

Bir baxışdan gər könqül taş isə, edər tutiya,
Yüzbəyüz necə durur, ey nərgisi-bimar, hey.

* * *

Ey mükərrər sözlərün qəndü-mükərrərtək ləziz,
Zəhri-çeşmindür bənüm kamümdə sağərtək ləziz.

Güşimə ta yadi-ruyin könlümi etmiş vətən,
Zari-əfğanım gəlür peyğami-dilbərtək ləziz.

Ta axıtmış yuxumı, ey bivəfa, covrün gəlür,
Didəmə sübhi-qiyamət şiri-madərtək ləziz.

Ey ki, etmiş nəşei-hüsnün cəhani bişüur,
Dövri-hüsnündür bəna dövran sağərtək ləziz.

Bu saçılmış abdən pərkalə dili-çeşmimə,
Bağdə olmuş gülün övraqi ibartək ləziz.

Bu dili-surax suraximdən əfğani-həzin,
Yari-bipərvayə gəlmiş dudi-məcmərtək ləziz.

vV

## ŞAH ABBAS SANİ
## (1633-1666)

*II Şah Abbasın (hakimiyyəti illəri: 1642-1666) aşağıdakı şeiri görkəmli türk alimi, professor İsmayıl Hikmət Ertaylanın 1965-ci ildə istanbulda çapdan çıxmış «Divani-türkiyyi-Zəfər» kitabından götürülmüşdür.*

vV

Üç vəfalı kimsə olmuş həmdəmim,
Gah firqət, gah möhnət, gah qəm.
Gecə gündüz həm ənisü məhrəmim,

Gah firqət, gah möhnət, gah qəm.

Verdi dövran cami-hicran saqi tək,
Qaldı həsrət ürəyimdə taqi tək,
Çevrəm alır gahü bigah yağı tək,
Gah firqət, gah möhnət, gah qəm.

Deyə bilməm kimsəyə dərdim tamam,
Yar mənə sərkəşü əğyarə ram.
Könlümə ola mənim hər sübh, şam,
Gah firqət, gah möhnət, gah qəm.

vV

## MÜSAHİB GƏNCƏVİ

*Uğurlu xan Ziyad oğlu Müsahib Gəncəvi Qacar elinin Ziyadoğlu qolunun məşhur nümayəndəsi Məhəmmədquluxanın oğlu, XVII əsrin görkəmli şairi və dövlət xadimi olubdur. II Şah Abbasın hakimiyyəti zamanı sarayda yüksək mövqeyə malik olmuş, «Müsahib» – şahın nədimi adını almışdır. Bir müddət Qum şəhərinin darğası, sarayda eşikağasıbaşı olduqdan, 1664-cü ildə əmisi Mürtəzaqulu xanın ölümündən sonra onun yerinə Qarabağ vilayətinə bəylərbəyi təyin edilib. I Şah Süleymanın hakimiyyəti dövründə Uğurlu xan uzun müddət Qarabağ hakimi olmuş, tədqiqatçı Firəngiz Xəlilovanın göstərdiyinə görə*

*təxminən 1704-cü ildə 70 yaşında vəfat etmişdir.*

vV

Sən saqi, naz oldun bülbüllər arasında,
Mən məsti niyaz oldum novgüllər arasında.

Bu şür ki, sən saldın bülbüllər arasında,
Müşkül ki, dəxi sönsün od güllər arasında.

Şəhbaz gözün bir gün pərvaz eylədi, cana,
Könlüm quşunu gördüm cəngəllər arasında.

Xətti-siyəhin, Ya Rəbb, vəsfində nə yazmış kim,
Zülfün dil uzadıbdır sünbüllər arasında.

Gər könlümü, ey saqi, almaq ələ istərsən,
Axtar tapasan, şayəd kakillər arasında.
Cadu gözünə zülfün mənzur nəzər oldu
Kim, ovçi tapar kamin zəngüllər arasında.

Dur başınçün, zahid, əfsanəni kutah et,
Ağırlığını salma yüngüllər arasında.

Bəzmində Müsahib çox mina kimi qan içdi,
Gəh ağladı, gəh güldü gül güllər arasında.

* * *

Ey saqi, bəni qoydun məstanlar arasında,
Oldu cigərim şan-şan müjganlar arasında.

Bir tağda dü dəstənbuyun bir-birindən xub,
Əl dəğməmiş ol hərgiz bustanlar arasında.

Yaqut ləbin sordum gül qönçə dəhanından,
Dün dişlərini gördüm mərcanlar arasında.

Səgridür atın dilbər naz ilə bu meydanda,
Başım topunu qovlar çovqanlar arasında.

Seylabi sirişkimdən aləm yenə qərq oldu,
Halın nə deməz munca tufanlar arasında.

Gün-gündən olur əfzun bu dərdü bəla bəndə,
Qaldıq bu qəmü möhnət, hicranlar arasında.

Bədəsl ilə yar olmaq bil buna müşabehdir,
Gün keçirə bir kişi ilanlar arasında.

Məsruriyə xoşdur, xoş pərvanə sifət hər dəm,
Yanub ola kül şəmi suzanlar arasında.

* * *

Qurban olum bən ol güli-xəndan olan yerə,
Zülfi-siyah, sərvi-xuraman olan yerə.

Sultani-ələmü şəhi-iqlimi həft həm,

Kişvərguşa, məmaliki-dövran olan yerə.

Dildar, dilfərib, sehrsaz, işfəgər,
Eyşi çəmən, nişati gülüstan olan yerə.

Şal şuxi-şəng, çeşmi-firəng, xəvide pələng,
Kirpikləri xədəng, işi ehsan olan yerə.

Ruy çu mah, saidi-simin, üzari-gül,
Dəndan incu, ləli-bədəxşan olan yerə.

Xalı qulami-hind, üzü məhbubi-məhcəmal,
Şirin kəlam, zülfi-pərişan olan yerə.

Məhluç pənbə sinəsi, ya ustuxani-ac,
Şümşad iki qolu, xəti reyhan olan yerə.

Qan yaş tökər bu dideyi-həsrətkeş ansam an,
Varsam dəxi çaki-giriban olan yerə.

Bən necə can verüb qəmi-dərdini almayum,
Məsruri uğrunda süxəndan olan yerə.

* * *

Qışı nobahar qıldın, nə əcəb gəlişdürür bu,
Nə işvədir, nə adət, nə əcəb rəvişdürür bu.

Sənin yüzün görəndə rəgü pey tənimdə titrər,

Yüz alışı istəməz, nə bəlalu qışdurur bu.
Dəhənində kani-gövhər gülüşündən oldu zahir,
Sədəf içrə incudur, ya ağzında dişdürür bu.

Qulaq as sümüklərimdən nə nəva ki, nalə çəkməz,
Ney bəzmə saz olubdur, bir ovci-qamuşdurur bu.

Varubən xəyal içində yüzünə nəzarə qıldım,
Yuxu gəlməmiş görübdür səna bəzm ki, dışdurur bu.

Nə cədəl çu könlüm aldın, təni-xaki qələsində,
Nə hücumdur, nə qovğa, sanasan yerişdürür bu.

Xəbər al, Müsahibindən nə çəkir cəfa əlindən.
Böylə bixəbər olma ki, bir özgə işdürür bu.

vV

## MƏCZUB

*XVII əsrdə yaşamış Azərbaycan şairi və alimi Şərəfəddin Mirzə Məhəmməd Məczub Təbrizinin farsca şeirləri indiyədək elm aləminə məlum olsa da, onun türkcə divanı son dövrlərdə, Leyden universiteti kitabxanasında aşkar edilmişdir. Əslən Təbrizdən olan şair 1682-ci ildə vəfat etmişdir.*

*Məczub 1652-ci ildə on min beytdən ibarət şeirlərini toplayaraq divan tərtib edibdir. O, üç min beytdən ibarət «Şahrahi-nicat» («Nicat yolu») əsərini 1655-ci ildə yazmışdır. Məczubun 1677-ci ildə yazıb bitirdiyi «Təyidat» («Təsdiq olunan fikirlər») adlı risaləsi Şah Süleyman Səfəviyə ithaf edilib. Səkkiz min beytdən ibarət bu əsər tövhidə, imaməti təsdiq edən hədislərə, on iki imamın mədhinə həsr olunmuşdur. Bunlardan əlavə şairin dövd min beytlik farsca divanı da vardır. Şairin türkcə divanının Leyden nüsxəsi 1869 beytdən ibarətdir.*

vV

Məstanə baxışından meyxanə oldi peyda,
Artuqluq eylədi mey, divanə oldi peyda.

Bir həqq namaz üçün eşq həqq qiblə axdarurdi,
Qarşuda tağİ-əbru mərdanə oldi peyda.

Üşşaq məclisində söz keçdi mürği-dildən,
Zülfin sözi uzandi, əfsanə oldi peyda.

Vəsfi-ləbin oxurdi mərcan üzi qızarmış,
Açdı sədəf qulağın, dürdanə oldi peyda.
Hüsn istədi ki, bir dəm ayıq keçirməsün eşq,
Şuri-cünun göründi, xümxanə oldi peyda.

Bəzmi-məhəbbət içrə ta hüsn şəm yaxdi,
Dövrində yerü gögdən pərvanə oldi peyda.

Eşq odi könlə düşdi, yandurdi can hicabın,
Aşiq özin itürdi, cananə oldi peyda.

Ta iltifati-saqi taqətcə dövrə düşsün,
Üşşaq məhfilində peymanə oldi peyda.

Ta aşiqin vəfası məşuqə zahir olsun,
Rəşk eylədi rəqabət, biganə oldi peyda.

Qarşumda göz yaşından gənci-göhər düzüldi,
Hər danəsindən axir bin danə oldi peyda.

Əl qatdı zülmə zalim, dünyani dutdi möhkəm,
Möhkəm binalarından viranə oldi peyda.

Əql ənsəsincə, Məczub, qırx il yügürdüm axir,
Xızri-cünun yolumda mərdanə oldi peyda.

* * *

Əgər bir can ilən ol ləli-şəkərbar elər sevda,
Tükənməz aşiqin sərmayəsi, ta var, elər sevda.

Ləbin sevdası can istər, verim baş üstə, can üstə,
Düşübdür başə bir sevda ki, hər nəm var, elər sevda.

Gözü qaşü ləbin dinü dilü can nəqdin istərlər,
Bu sevda canə minnətdür, əgər dildar elər sevda.
Qəmi-zülfi-pərişanın nə çulğanmış müəmmadur,
Ki hər aşüftəsin bir fikirdə bimar elər sevda.

Pərişanlıq libasında elər bir tar ilən münim,
Əgər bir şəhr ilən ol türreyi-tərrar elər sevda.

Bu sevda dövlətindən virdüm olmışın başına dönmək,
Mənim tək zərrəni əflak ilən həmkar elər sevda.

Ləbin sevdası ilən qızmış başlar nə bilsünlər,
Neçün aqillüqin bir cam ilən hüşyar elər sevda.

Cünun sevdası ilən əqli sevda etməyən bilməz,
Nə daşluq yazılır divanəyə səvar elər sevda.

Açuq söylər yuxusuz gözləri, divanə gər dinməz,
Ki uymuş bəxti bu meyxanədə bidar elər sevda.

Bu heyrət vadisi, yarəb, nə payansız biyabandur,

Ki hər divanəsin bir yazıda səyyar elər sevda.

Qıraqdan etməmişlər özlərini seyr aqillər,
Nə bilsünlər neçün divanəni bikar elər sevda.

Əgər hüsnün kimi sevdayi-eşqin yokdur ecazı,
Necə gülxən bucağın aşiqə gülzar elər sevda.

Düşər hər başə bir sevda, kimi həqqü kimi batil,
Yüz illüq səbhəni çok zahidə zünnar elər sevda.

Əgər can istəsə canan, rəvan Məczub tək tapşur,
Olur Mahmud hər kim əvvəli-bazar elər sevda.

* * *

Könlüm ilən ta qəm olmaz aşina,
Yarəsilən mərhəm olmaz aşina.

Ta kim ilən aşina olsun qəmin,
Hər kim ilən bu qəm olmaz aşina.

Boynımi ta bur mənim zülfün kimi,
Ol kəməndi-pürxəm olmaz aşina.

Könlümi ta həsrətin qan etməsün,
Çeşmi-xunbarə nəm olmaz aşina.

Eşq sevdasinə əl tapmaz məlal,
Bu qəm ilən heç qəm olmaz aşina.

Araliqdə ta həya olmaz hicab,
Əlli illüq həmdəm olmaz aşina.

Bilsə sahibhüsn əgər öz qədrini,
Heç kim ilən bir dəm olmaz aşina.

Söz deyərlər, gəzmə hər nabab ilən,
Sən tək insanə kəm olmaz aşina.

Çar-naçar el sözidür həqq sözi:
Aləm ilən adəm olmaz aşina.

Sərvi-qəddin gər eşidsə el sözin,
Kölgəsilən bir dəm olmaz aşina.

Baxışın gər tanısun baxışları,
Hər nigahə dər dəm olmaz aşina.

Aşina biganələrdən et kənar,
Hər kişilən adəm olmaz aşina.
Bülbül ilən gül əgər açılmasa,
Damənilən şəbnəm olmaz aşina.

Gül qulağın açsa bülbül pəndinə,
Qönçə könlilən qəm olmaz aşina.

Aşinaluq üz suyilən olmasa,
Aşinayə məhrəm olmaz aşina.

Badə ver, saqi ki, fürsət əldədür,
Cam ilən daim Cəm olmaz aşina.

Aşina olsan bizüm Məczub ilən,
Könlinə hərgiz qəm olmaz aşina.

* * *

Qurban günidür, gəl elə qurbanə tamaşa,
Ta can verə qurbaniyə-heyranə tamaşa.

Qurban olım ol vəqtə ki, qurbanına bibak,
Məstan eləsün nərgisi-məstanə tamaşa.

Qurban olım ol qəmzeyi-cəlladə ki, eylər,
Qurbanına bibakü dəlirəanə tamaşa.

Rəhm eylə ki, köynəkdə gəzən talibi-didar,
Sənsiz eləməz rövzeyi-rizvanə tamaşa.

Bikar degül dideyi-xunbar, gəl eylə,
Dərya üzərində bu çırağanə tamaşa.

Gəl bəzmimi rövşən elə, ey şəmi-diləfruz,
Ta şəm eləsün şiveyi-pərvanə tamaşa.
Gördükcə səni başına ta dönməyəm, olmaz,
Eylər necə kim şəminə pərvanə tamaşa.

Mən tək olan ol qaşü gözə mailü valeh,
Məstanə elər Kəbədə bütxanə tamaşa.

Rüsvalığımı gizləyə bilməm ki, edirlər,
Heyranlığıma məhrəmü biganə tamaşa.

Divanə də bikar degil xəlq içində,
Yaxşılar elər aqili divanə tamaşa.

Divaneyi-bikar da aqillər işini,
Eylər necə kim cahili divanə tamaşa.

Yarın o tamaşanı elər cümleyi-aləm,
Sən eylə bu gün ol ulu divanə tamaşa.

Hatəm oda varmaz, oda varsa nə rəvadür,
Kafir eləsün danla müsəlmanə tamaşa.

Gəl qanuni, Məczub, halal eylə könüldən,
Ta qəmzeyi-bibak eləsün qanə tamaşa.

* * *

Bəxt oldi yarü ərz elədüm yarə müddəa,
Dil mətləbincə söylədi dildarə müddəa.

Sə'd ulduzum müqabil idi aftab ilən,
Mətləbcə üzbəüz sölədüm yarə müddəa.

Dövri-fələk müvafiqü tale rəsa idi,
Kamınca döndü başına bir parə müddəa.
Pərvanə tək dolandumü düşdüm ayağına,
Ta düşdü mətləbim kimi pərgarə müddəa.

Bülbül, oxi ki, düşdi gözün gül camalına,
Pərvanə, dön ki, döndi tələbkarə müddəa.

Mətləb üzinə ahi-səhər açdı qapılar,
Açuq göründi dideyi-bidarə müddəa.

Çəkdi dua mətai çok illər kasadlıq,
Axır yoluxdu bir dəlü bazarə müddəa.

Olsa dua təbibü pərəstar səbrü şükr,
Əlbəttə, mətləbincə tapar çarə müddəa.

Çox şükr Tanrıya ki, təbib oldi mehriban,
Can sağluğilən okurdi bimarə müddəa.

Qırx il şikayət etmədi könlüm cərahəti,
Ta oldi mərhəmi-dili-sədparə müddəa.

Məcruh könlüm incimədi acı yarədən,
Ta söylədüm o ləli-şəkərbarə müddəa.

Mətləb yolında çok gecə mətləbcə ağladum,
Ta rövşən oldi çeşmi-göhərbarə müddəa.

Açıldı sübhi-vəslü Günəş dutdi aləmi,
Mətləbcə düşdi neməti-didarə müddəa.

Qan etməsəydi bağrımı mətləbcə mətləbim,
Üz verməz idi dideyi-xunbarə müddəa.

Mətlub ləblərindən alur mətləbincə kam,
Hər kim buraxdı qadiri-cabbarə müddəa.
Tanrı kərimdür, söləmə qeyrə mətləbin,
Tanrını tanıyan deməz əğyarə müddəa.

Məczub, verdi mətləbini Mürtəza Əli,
Bu qapıdan həmişə tapar çarə müddəa.

* * *

Gözlərin sunmasaydı badeyi-nab,
Qan olurdi qərabələrdə şərab.

Qaşların gər işarət eyləməsə,
Tanımaz doğru qibləni mehrab.

Qızmasa ləblərin xəyalından,
Bağlarda qızarmaz innab.

Könlümün pərdəsindədür mehrin,
Eylə kim qönçə yaprağında gülab.

İltifat eylə, xəstə könlümi gör,

Xəstə görmağda var çoxca savab.

Başın üçün rəqibə üz vermə,
Fərzdür kafirə həmişə əzab.

Bulhəvəsdür rəqib ağlasa da,
Məkri-toprağa ad qoydi sərab.

Başdan oldi bu ayda gör neçəsi,
Başa getməz müsahibi-nayab.

Həvəsi faiq eyləmə eşqə,
Müshəf üstinə qoyma özgə kitab.
Çoxa aldanma, az qədrini bil,
Çoxdur əğyarü azdur əhbab.

Bu cəfa kim vəfa yolunda çəkər,
Qaf dağı ola, gətürməz tab.

Zərrəsən, zərrə, əcz ilə, Məczub,
Hüsndür aftabi-aləmtab.

* * *

Çox gətürdük xumarə, saqi, tab,
Qalmış ola qərabələrdə şərab.

Bağlamış yar vəsl qapusını,
Əftətəh, ya müfəttəhül-əbvab!

Bisəbəb yar bizdən inciməmiş,
Yarəb, olsun rəqib xanəxərab!

Belə kim yar yolda bizdən ötər,
Eyləməz ömr də bu yolda şitab.

Bisəbəb türki-qəmzə barışmaz,
Səbəbi, ya müsəbbəbül-əsbab!

Çaxır üstə savaşduq, saqi,
Gəl unut, macərayi-aləmi-ab.

Belə birəhm əgər baxar qəmzən,
Tökə bilməz əlinə su qəssab.

Gər sənin qaşına degil mail,
Sənə qarşu necə durar mehrab.
Demə yövmül-hesabdən, naseh,
Söylə divanədən kim aldı hesab.

Vəcdü çərxü səma' babında,
Nə deyərlər, eşit, üluül-əlbab:

Əhli-həqq olsa sufiyi-rəqqas,
Eyləməz dəf səsi oni bitab.

Bazgəşt etdi qapuna Məczub,
Söylə tuba ləhuvü hüsni-məab.

* * *

Etdin məni gər aşiqi-rüsva, nə təəccüb?
Gül bülbülini eyləsə şeyda, nə təəccüb?

Gördükcə camalın dönürəm başına bibak,
Şəm etsə giriftarını rüsva, nə təəccüb?

Məşuq ki, sərgəştəsini istəsə rüsva,
Pərvanə də gər etməsə pərva, nə təəccüb?

Ol nərgisi-məxmur xəyalında unudsa,
Mən tək yuxuni nərgisi-şəhla, nə təəccüb?

Sevdayi-cünun sərxoş olub yadi-ləbindən,
Divanəyə mey artura sevda, nə təəccüb?

Eşq etdi könül güzgüsini cami-cahanbin,
Qeybətdə səni görsə hüveyda, nə təəccüb?

Qafil yuxusi aqili qəflətdən oyadur,
Divanəni aldatmadı dünya, nə təəccüb?
Göstərdi bu gün sün' iyəsi bir belə qüdrət,
Yarın edəsən həşrə tamaşa, nə təəccüb?

Aç gözüni, bax yerü gögü cümlə cahana,
Bu qüdrət ilən həşr ola peyda, nə təəccüb?

Hakim gərək etsün neçə gün həftədə divan,
Divan eləsə davəri-yekta, nə təəccüb?

Şeytan söləşür adəm ilən büt cəsədində,
Gər sufiyi-rəqqas ola şeyda, nə təəccüb?

Vəcd əhlini şeytan gətürür çərxü səma'yə,
Kulini əri oynada rüsva, nə təəccüb?

Olmışdı qızıldan iki büt Kəbədə natiq,
Gər çərxə girə Konyədə molla, nə təəccüb?

Rəs qövmi ilən şaxi-sənubər söləşürdi,
Heyvanə nüfuz etsə o xudra, nə təəccüb?

Məczub ki, mövladur ana Qənbəri-Mövla,
Heç kimdən əgər etməsə pərva, nə təəccüb?

* * *

Şükr oldi mənə ol ləli-şəkərbar təbib,
Şad ol dil ki, olur xəstəsinə yar təbib.

Şükr oldi genə bir naleyi-məstanə ilən,
Bəxti-bidarə fələk yavərü dildar təbib.

Şükr oldi genə bir əczi-qəvitale ilən,
Xəstəyə həmdəmü qəmxarü pərəstar təbib.
Tanrı ol xəstəyə kim mərhəmətü lütf edər,

Yetürür başına bir sən təki qəmxar təbib.

Cəmdür xatirimiz zülfi-pərişanın ilə,
Oldi ta xəstəmizə nərcisi-bimar təbib.

Könlümün yarəsini yarə ilən etdi əlac,
Kim bilürdi ki, olur qəmzeyi-xunxar təbib.

Çeşmi-bidar yəqin dövləti-didarə yetər,
Xəsteyi-hicrə olur dideyi-bidar təbib.

Aşiqin könlü bu yolda qəm ilən şad olur,
Şad olur qarşuda görsə dili-bimar təbib.

Aşiqin könlünü yoxlar gecə-gündüz qəmi-eşq,
Olmasa xəstə, olur acizü bikar təbib.

Aşiqin dərdini biçarə necə çarə elər,
Olmamış arizeyi-eşq ilə bimar təbib.

Eşq sevdasına, naseh, nə nəsihət, nə əlac,
Mərəzi tanımasa, çox çəkər azar təbib.

Eşq möhnətləri ta könlüni bimar eləməz,
Əczü nadanlığına eyləməz iqrar təbib.

Qəmi-dildar dəvayi-qəmi-dildar olur,
Aşina qəmlərə olmaz qəmi-əğyar təbib.

Yerbəyer varı hünərlər görünür gözlərə eyb,
Eyblər illətinə olmasa səttar təbib.

Kim ki, Məczub kimi dərdini əğyarə deməz,
Dili-bimarinə, əlbəttə, olur yar təbib.

* * *

Kəsb etməsə şüayi-camalından aftab,
Mahi-münir handan elər nur iktisab.

Yad etməsə camalını gülşən təravəti,
Gül yaprağı içində qayırmaz özin gülab.

Lütf etməsə Süheyli-camalın qızarmaz,
Rəngi-əqiqü ləli-Bədəxşanda abü tab.

Mərcan sənayi-ləli-ləbindən qızarmış,
Salmış qulaq dürci-sədəf içrə dürri-nab.

Qaşın kənarına düşən ol xali-ənbərin,
Bir nöqtədür nişan eləmiş beyti-intixab.

Əvvəlki gün ki, düşdi gözüm qaşına, gözüm
Duydım ki, bir işarəsidür şərhi-hər kitab.

Mümkün degil ki, qaşların imasın anlaya,
Ta baş verməsün yoluna fəhmi-nüktəyab.

Bir rəng təmam etdi səmaiyi-rəvani
Kim, cismimizi ruhi-rəvan eylədi mütrib.
Mən həm elə ahəng ilə fəryad elədim kim,
Yavıncıdı, yalvardı, aman eylədi mütrib.
Çün nəğmeyi-tər etdi vücudum bir avuc su,
Çün nalə ilə bağrımı qan eylədi mütrib.
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ta könlümü asan aparub müşkülə saldın,
Dildən məni saldın, məni dildən-dilə saldın.
Saqi, dolu minani, məni-xanəxərabi
Neyrəngilə sındırdın, ayaqdan belə saldın.
Əglənmiş ikən rövzeyi-rizvan arasında,
Yarəb, nədən ötrü məni abu gilə saldın.
Yüz həlqə edib zülfi-pərişanını çin-çin,
Bir həlqə ilə boynuma bir silsilə saldın.
Ol badəni kim, əqlimi başdan aparıbdır,
Sundun mənə, mən sadədili işgilə saldın.
Hərçənd tünük hövsələyəm bəzmi-bəladə,
Hərçənd ayaqdan məni bir cam ilə saldın:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağda ki, eylədi Mirzə onu zahir,
Mirza ki, onun həqq ləqəbin eylədi Tahir.
Ol bağda kim, ayineyi-dövr nümadır,
Firdövs onunla ola rif`ətdə nə qadir.
Təsvir edə bilməz onu yüz rəng ilə Mani,

Təqlid edə bilməz onu neyrəng ilə sahir.
Heç fərqi onun rövzeyi-rizvanilə yoxdur,
Ol cənnəti-qaibdirü bu cənnəti-hazır.
Dünyadə bu rif`ətdə məqam kim eşidibdir
Kim, aləmi-mənzur olavü aləmə nazir.
Bir vəqtdə ki, əbri-bahar ola göhərbar,
Ol bağdə kim, badə çəkər möminü kafir:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!
Ol bağdə kim, eylədi Təbrizi gülüstan,
Ol bağ ki, bir guşəsidir rövzeyi-rizvan.
Bir həddi Səhənd olmuş, o bir həddi Urumi,
İki yanı Sürxabdır ol kuhi-Bədəxşan.
Fəvvarələri çeşmeyi-xurşidə tökər su,
Dəryaçələri rəşkilə dəryayə verir qan.
Minayi-meyü laləvü xaşxaşü şəqaiq,
Bir rəng bular etdilər ol bağı çırağan.
Kim, pərtövi-xurşid kimi bağ füruği,
Etdi fələyin sabitü səyyarini pünhan.
Ol bağdə kim, göllər olar bəhri-göhərxiz,
Bir vəqtdə kim, əbri-bahar ola dürəfşan:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağdə kim, qəl`əsi əflakə çəkib sər,
Ol qəl`ədə kim, dari-sünehr ilə bərabər.
Cövşi-gülü nərgisü rəyahinü qərənfil,
Dünya üzünü eylədi rənginü müəttər.
Pəh-pəh, nə gözəl sərvləri var bu bağın

Kim, faxtəsi kərkəsi-gərdun ilə oynar.
Gül butələri dilkəşü ər`ərləri mövzun,
Cənnət yoludur çar xiyabani sərasər.
Axır necə hüşyar oturum mən bu çəməndə
Kim, qönçəsi mina kimidir, lаləsi sağər.
Ol qəl`ədə kim, bağ kənarına düşübdür,
Dörd canibi bişübhə səkkiz cənnətə bənzər:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Mütrib, belə gülzari-tərəbxanə gərəkdir,
Mey nuş elə kim, naleyi-məstanə gərəkdir.
Həm məbədi, həm meykədəsi var bu bağın
Kim, özgəyə məscid, bizə meyxanə gərəkdir.
Hər qönçə bu gülzardə bir Leyliyə bənzər,
Hər kimsə ki, Məcnun ola, divanə gərəkdir.
Bu abi-havadan ki, verir aşiqə əhya,
Var canımız, əmma bizə cananə gərəkdir.
Ol bağdə mən sinəmi sədçak edərdim,
Sünbüllərinin kakilinə şahə gərəkdir.
Bir fəsldə kim, səbzə silər zəng könüldən,
Ol bağdə kim, bülbüli-pərvanə gərəkdir.
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Hicran sitəmi bağrımı qan eylədi, ey vay,
Ey dilbəri-hərcayiyü xunxar, mədəd hay.
Qövsi necə dursun xəmi-əbrulərə qarşı,
Ol baziyü pürzurilə netsin bu sınıq yay.

Əzbəs ki, ərindim ləbi-ləlin həvəsindən,
Dəryayi-mühit oldu gözüm, didələrim çay.
Mina kimi, nolur, bu sınıq könlümü alsan,
Bir sağəri-ləbriz ilə, ey kafəri-xudray.
Gəl-gəl ki, içib mey döşənək bərgi-xəzan tək,
Hər bağdə kim, badi-bahar ola səmənsay.
Mehmanlara var saf suyun özgə səfası,
Derlər ki, yavuqdur ola on dörd gecəlik ay:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

**3**

Gətir, saqi, qədəh kim, novbahari-eyşü işrətdir,
Bu gündən böylə cuşi-eşqü tüğyani-məhəbbətdir.
Bu gün kim, camü güldən bangi-nuşanuş urar bülbül,
Meyi-gülrəngdən hər kim ki, qafil, məsti-qəflətdir.
Verir badi-bahar əmvatə əhya sübhdəm sən həm
Oyaq ol, fürsəti fövt etmə kim, fürsət qənimətdir.
Nola gər cami-minadan düşərsə aləmə qovğa
Ki, bu xurşidi-məşhər, ol qiyam etmiş qiyamətdir.
Gətir səhba ki, baqidir səlahü tövbənin çağı,
Bu beş gün kim, qələm yoxdur bizə, əyyami-möhlətdir.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, xaki-rəhgüzarı sürmeyi-çeşmi-bəsirətdir.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, şərabı ver mənə, əmvatə əhya tək,

Ləbi-canbəxşini məndən diriğ etmə Məsiha tək.
Nə xoş güllər düşübdür çeşmimə gülzardən sənsiz,
Əcaib dağlar var lalədən sinəmdə səhra tək.
Məni mə`zur tut, gər olmuşam məst, istərəm səndən
Vəfa kim, adı var, yoxdur özü aləmdə ənqa tək.
Nola gər rəşkdən bülbül töküb göz yaşı qan ağlar
Ki, məhv olmuş gülə şəbnəm bieynih çeşmi-bina tək.
Mənim tək nola gər məstanə söylər bülbülü qumru
Ki, gəl cami-meyi-gülgun kimidir sərvi-mina tək.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, daniş gövhərilə var mala-mal dərya tək.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, qədəh kim, arizu bağrım kəbab etmiş,
Meyi-gülrəng tək qeyrü məni həsrət xərab etmiş.
Mənim göz yaşımı zinhar ğur et, sərgiran baxma
Ki, suzi-dil onun hər qətrəsin bir ləli-nab etmiş.
Mənim hər misreyi-ahim urar divan ilən pəhlu
Ki, divani-qiyamından məni eşq intixab etmiş.
O günlər kim, keçibdir tövəbvü zöhdü vərə` birlə
Fəğan kim, xameyi-təqdir ömrümdən hesab etmiş.
Bahar əyyami olma naleyi-məstanədən qafil
Ki, rəhmət naləsin məstin duayi-müstəcab etmiş.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, hər bir zərrəni şəfqət gözüylə aftab etmiş:
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, şərabi-nab kim, ömrün həzar olsun,
Açılsın qönçələr tək xatirin daim bahar olsun.
Ayaqdan düşmüşəm, tutsan əlimdən bir ayağ ilə,
İlahi başədin əyyami-eyşin paydar olsun.
Mənə müşkül keçir dövran, qədəh seyrilə asan et,
Binayi-xatiri-müşkilpəsəndin üstüvar olsun.
Qara dünlərdə qət`i-rah edərkən tövsəni-ömrüm,
Gətir gülgun meyi kim, əbr tək gərdunsuvar olsun.
Kəməndi-piçü tabi rişteyi-saz olmadan mütrib
Mahali-əqldir ol ahuyi-müşkin şikar olsun.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, olsun dövlətilə cavidan ta ruzigar olsun.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir saqi, qədəh ver kim, bu dövran yaxşı dövrandır,
Könüllər qönçəsi açılmağa aləm gülüstandır.
Peyapey tut əyağın sədqəsi, tez keçmə məndən kim,
Həyat onsuz mənə müşkil gəlir, gəl qeyrə asandır.
Behşiti-nəqd olubdur gərçi aləm laləvü güldən
Vəli səhbayi-gülgun olmayınca bəndü zindandır.
Nola Təbrizi gər Qövsi behiştə ixtiyar etsə
Kim, anun xak-payi sürmeyi-çeşmi-Sifahandır.
Həvayi-Gəncə, ol firdovsi-sani var başımda,
Fəğan kim, natəvanlıq maneü cəm`im pərişandır.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, biz onun qulu, ol bəndeyi-Sultan Süleymandır.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

## MÜSƏDDƏS-TƏRCİBƏND

Gəlin, ey əhli-vərə`, aşqü xümmar olalım,
Hamı bir müqbəcə yanında giriftar olalım,
Ney kimi nalə çəkib, çəng kimi zar olalım,
Necə kim böylə gözəl fəsldə hüşyar olalım.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Camlər zəhrilə məmlü şəbi-hicran içdik,
Eylədik tövbə əgər göz görə, pünhan içdik,
Hər nə kim verdi bizə saqiyi-dövran içdik,
Bu fəna dərhdə bəsdir bu qədər qan içdik.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Necə bir şamü səhər xabü xəyal ilə ötə,
Necə kim əxtəri-məs`ud zəval ilə ötə,
Yüz nişat ilə gəlib ömr, məlal ilə ötə,
Heyfdir böylə bahar ayı bu hal ilə ötə.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Xublər vari çəmən seyrinə zinhar gəlin,
Cəm` olun qönçə kimi, gül kimi bir dəm açılın,
Eşidin bülbülün ahəngini, qədrini bilin,
Dustlər mövsümi-gül getmədən əldən yığılın.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Yarə can eylədik isar, budur niyyətimiz,
Tutarıq damənini yar ola gər dövlətimiz,
Biz onun bəndəsiyik, səcdəsidir taətimiz,
Ömr əgər möhlətimiz versə, fələk fürsətimiz:
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Fariğ olman fələki-mübrimin ibramından,
Hiç kim sə`y ilə qurtulmaz onun damından,
Dustlər, dövri-zaman gərdişi-əyyamından
Etəməmişkən bizi bihuş əcəl camından:
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Nola gər çərx ilə yekru qıluram mən Qövsi,
Dust gər yar ola neylər mənə düşmən, Qövsi,
Büt ilə xəlvət edən yerdə bərəhmən Qövsi,
Gəl ki, bir guşədə saqiyü mənü sən Qövsi:
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

## MÜXƏMMƏSËßĐ

### 1

Məni hicr eyləmiş zirü zəbər, vallah-billah,
Könül abü kəbab olmuş cigər, vallah-billah,
Məhəbbət qoymamış məndən əsər, vallah-billah,

Deyin məndən ona, dustlər, vallah-billah.
Yetər, zalim, yetər, kafər, yetər, vallah-billah.

Gülün peyvəsteyi-könli açılur fəryadi-bülbüldən
Ki könli qönçə olsun bülbüli mən` eyləyən güldən,
Yıxıbdır səbr evin eşqü ötübdür iş təhəmmüldən,
Sənə məqsud əgər üşşaqi yıxmaqdır təğafüldən,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Bu kim, könlümdə od, köz pərdəsində təhbətəh qandır,
Səninlə içdigim meydir ki, adı abi-heyvandır,
Əgərçi aşiqə məşuqdən hər dərd dərmandır,
Cəfa səndən vəfadır, cövr səndən gərçi ehsandır,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Səni kim, durbinlər eşq ilə sərgiran derlər,
Bu zahir zülmə heç bilməm nəçün lütfi-nihan derlər,
Vəli əğyar ilə var cuşeyi-çeşmin yəman derlər,
Nigahın sədqəsi kim, fitneyi-axırzəman derlər
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Məgər görməzmi halim çərx, fəryadim eşitməzmi,
Tərəhhüm eyləyib bidadın axır axır etməzmi,
Gəlib sübhü vüsalü şami-xunaşam getməzmi,
Mənim naləm ki, yetməz kuyinə, əflakə yetməzmi,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Bilir mən tək gəzən Məcnuni-bipərva libasında
Ki, Leyli cilvə eylər ahuyi-rəna libasında,

Bu məndən şükrdür, gər şikveyi-bica libasında,
Bu səndən lütfdür, hərçənd istiğna libasında,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Mənə hərçənd bidad eylərü imdadıma yetməz,
Əgər çərxin binasın sel aparsa, yadıma yetməz,
Sipehri-səngdil beş gün əgər fəryadıma yetməz,
Sanırsan Qövsinin fəryadı bir gün dadıma yetməz,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

**2**

Ey şami-qəmim zülfi-pərişanına qurban,
Sübhi-tərəbim çaki-giribanına qurban,
Sevdazədə başım xəti-fərmanına qurban,
Ey nəqdi-həyatım ləbi-xəndanına qurban,
Şirin sözünə, lə`li dürəfşanına qurban.
Bax bir nəzəri-lüftilə sinəmdəki dağə,
Rəhm eylə mənə, qəmzən oxun atma qırağə,
Ey hiçə satan bülbüli-xoşləhzəni zağə,
Yarəb, ola bir gün kim olam başdan-ayağə,
Başdan-ayağa sərvi-xüramanına qurban.

Ey başım iyəsi, olayım başına sədqə,
Həm özünə, həm yarına, yoldaşına sədqə,
Ey ahuyi-Çin, dağınavü daşına sədqə,
Ey əqlimü huşum gözünə, qaşına sədqə,
Xalu xətinə, çahi-zənəxdanına qurban.

Hərçənd qərib etdi məni eşq vətəndə,
Bir sən kimi novgül bulunur hansı çəməndə,
Bihudə degil bəslər isəm canı bədəndə,
Ey kaş ki, tük baş isə bir can ola məndə
Ta bir-bir ola navəki-mücganına qurban.

Hərçənd verib dərd, dəvanı unudursan,
Qövsi kimi bir süxteyi-canı unudursan,
Ol aşiqi-binamü nişanı unudursan,
Hərçənd ki, tez mehrü vəfanı unudursan,
Ey bağrı bütün əhdinə, peymanına qurban.

**3**

Daneyi- ləbtəşnəyəm, ey əbri-gövhərbar hey!
Aşiyansız bülbüləm, ey şəm`i-gülrüxsar hey!
Yüz qəmü dərdü bəla pamalıyam, qəmxar hey!
Canə yetdim piçü tabü eşqdən, ey yar, hey!
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Əhli-dil kim, çeşmi-tərdən qan qatarlar aşıma,
Əşkimə seylabi-xunü pül demişlər qaşıma,
Sən ki, şəm`i-bəzm tək rəhm eyləyib göz yaşıma,
Ol qədi-rə`na ilə hər gah gəldin başıma
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Başımı ta şəm` tək sevda oduyla dağladım,
Cahi bitəqrib güldüm, gahi bica ağladım,
Hər nə tutdum dəstimə damani-fürsət çağladım,

Ta ki, durdum qulluğunda əl-əl üstə bağladım,
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Ey xoş ol saət ki, şəm`i-bəzmim ol rüxsar idi,
Bülbülü pərvanədən məclis dolu əğyar idi,
Ol nəfəs ki, guşeyi-çeşmin mənimlə yar idi,
Sən əlim tutdun, vəli mən ta ayağım var idi.
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Xəstədir Qövsi, təbibim, dərd bilmək çağıdır,
Çarə qılmaq, kam vermək, könlün almaq çağıdır,
Çünki gəlmək, çeşmi-eyvanında qalmaq çağıdır,
İntizarın çəkdümü gördüm ki, gəlmək çağıdır,
Getdim əldən, ey dolanım başına, dildar, hey!

**4**

İstərəm ləli-göhərbarına qurban olum,
Dilinə, ağzına, göftarına qurban olum,
Qədi-mövzuninə, rəftarına qurban olum,
Nərgisi-məsti-füsunkarına qurban olum,
Xətinə, xalına, rüxsarına qurban olum.

Ey həvayi-səri-zülfün mənə balü pər edən,
Eşq oduna pərimi, balımı xakistər edən,
Dili-sədparəmi qan eyləyənü gövhər edən,
Məni bu qülzümi-xunxardə biləngər edən,
Nə göhərsən ki, xiridarına qurban olum.
Nola gər əl verə, ey sərvqəd: siməndam,

Dolanıb başına öpmək ayağın, almaq kam,
Ey ki, olmuş iki zülfün hər iki aləmə dam,
Ey mənim şamimi sübh eyləyənü sübhümi şam,
Mən sənin türreyi-tərrarına qurban olum.

Ol ki, bidərdlərin dərdinə timar etmiş,
Məni bu rəng ilə yüz dərdə giriftar etmiş,
Ey səba, söylə ona kim, məni əfkar etmiş,
Ol ki, adını təbibi-dili-bimar etmiş
Ki, sənin nərgisi-bimarına qurban olum.

Sərvqədlər sənə, ey sərvi-rəvanım, sədəqə,
Sənə, ey sərvi-rəvan, ruhi-rəvanım sədəqə,
Adına, yadına nam ilə nişanım sədəqə,
Xal olan daneyi-təsbihinə canım sədəqə,
Zülf olan həlqeyi-zünnarına qurban olum.

Dili-divaneyi-bibakımı gözdən qoyma,
Şölə çəkmiş xəsü xaşakımı gözdən qoyma,
Eşq bərbad qılan xakimi gözdən qoyma,
Sən mənim sineyi-sədçakimi gözdən qoyma,
Mən sənin navəki-xunxarına qurban olum.

Ey ki, hüsn ilə yetirdin məhi-Kən`anə nəsəb,
Bu nə sözdür, nə dəhandır, bu nə dişdir, bu nə ləb,
Nə çəməndir, bu nə şəbnəm, bu nə gövhər, yarəb
Ki, sənin əbri-göhərbarına qurban olum.

Bağban bağınavü rənc aparmış əlinə,

Nəxlinə, hasilinə, sərvinəvü sünbülünə,
Dəsti-gülçininə, cibü bəğəli-pürgülünə,
Lütfünə, qəhrinəvü zağınavü bülbülünə,
Gülünə, gülşəninə, xarına qurban olum.
Sənü şirindilü Qövsivü bəsi rəngin söz,
Gah od yandıranü gah verən təskin söz,
Ah, əgər ləlin ona eyləməyə təlqin söz,
Şur ilə aləmi ləbriz qılan şirin söz,
Nə nəməksən ki, nəməkzarına qurban olum.

**5**

Məni saldın ayaqdan, ey səbükcövlan, günahım nə?
Əlimdən tutmadın, ey saqiyi-dövran, günahım, nə?
Əzəldən mey verib axır verirsən qan, günahım nə?
Vüsal əyyamın eylərsən şəbi-hicran, günahım nə?
Günahım nə, dolanım başına, canan, günahım nə?

Təhi-minada ta mey var, ola bağrımdakı qan tək,
Nə lazım xuni-dil vermək məni-məxmurə dövran tək,
Mükərrər tarü pudim dağıdıb zülfi-pərişan tək,
Vəfa qanununun tarını üzdün rişteyi-can tək,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Bir-iki gün mənimlə bitəkəllüf durdun, oturdun,
Dönüb torpağımı bidad ilə əflakə sovurdun,
Məlamət tiğini çəkdin, təğafül yayını qurdun,
Nə bir gün rəngimi gördün, nə bir gün halımı sordun,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Özün sən yaxşısan, əmma yamandır böylə, başinçün,
Cəfavü cövr səndən eybdir, tərk eylə, başinçün,
Neçin viranimi, yarəb, verirsən seylə, başinçün,
Əgər var isə cürmüm, bilməzəm, sən söylə, başinçün,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Məni çün aqibət Qövsi kimi candan usandırdın,
Əzəl başdan neçin bəs canımı aldın, inandırdın,
Qılırkən saf, döndüm, çeşmeyi-çeşmim bulandırdın,
Çırağım yandırarkən qəm oduna dağ yandırdın,
Günahım nə, dolanım başına, canan, günahım nə?

## MÜRƏBBE

Könlüm istər kim, ola ol atəşin rüxsarü mən,
Fürsəti-ərzi-niyazü xəlvəti-didarü mən,
Növbaharü əndəlibü guşeyi-gülzarü mən,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

İkimiz ol məhvəş ilə bir qədəhdən məst olaq,
Bir nihalın sayəsində əylənib pabəst olaq,
Bağlarıq gərdun əlin gər bir nəfəs həmdəst olaq,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Ol mənə mənzur, ona seyri-çəmən mənzur ola,
Əngəlü biganə napeydavü məhrəm dur ola,
Mütribi-xoşləhcəvü çəngü neyü tənbur ola,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz diyari-eşqdə çeşmi-çırağİ-aləmik,
Bir cahan ənduh ilə bibakü rindü biqəmik,
Saxlasın tanrı yaman gözdən ki, yaxşı həmdəmik:
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Bərgü bar ilə mühəyyadır baharın tuşəsi,
Bir tərəf gül xərməni, bir yanda sünbül xuşəsi,
Künci-deyrü bərəhmən, zöhhadü məscid guşəsi
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz kimiz, surətdəvü mənidə layiq dustlər,
Dustluq dəvasını etməkdə sadiq dustlər,
Bir-birilə az düşər biztək müvafiq dustlər,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.
Ey xoş ol saət ki, bizdən gərm ola bazari-eşq,
Adımızdan sikkeyi-rayic bula dinari-eşq,
Qövsivü təkrari-şeri-halivü izhari-eşq,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

## RÜBAİ

Ey eşq əmanətində sirdaşım, gəl,
Gəl, ey dəlilikdə yarü yoldaşım, gəl,
Məcnunə yetirsən, söylə, ey badi-səba,
Qövsi dedi: ey oxşama qardaşım gəl,

vV

## MÖVCİ

*1925-ci ildə nəşr etdirdiyi «Qovsi» kitabçasının müqəddiməsində Salman Mümtaz Mövci barədə qısa məlumat vermişdir. Alimin yazdığına görə, Mövci müasiri olan Qövsi Təbrizi ilə məktublaşmış, şeirləşmişdir.*

*Məhəmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» əsərində Şeyxülislam Mövci Əhərini şirin dilli söz ustadı adlandırıb.*

*Mövcinin şeirlərinə Qövsi Təbrizi divanı Məşhəd nüsxəsinin vərəqlərinin kənarında rast gəlirik. Təqdim edilən şeirlər həmin mənbədən götürülmüşdür.*

vV

Bismillahir-rəhmanir-rəhim,
Mövciyə qıl lütfi kərəm, ya kərim.

Həmdinə quya dilinin lütfilə,
Doğru yolun eylə ona müstəqim.

Aldı könül mülkini fir′onnəfs,
Turi-vücudindən yarat bir kəlim.

Könlümni qoyma pərişan, yetir
Qönçeyi-ümmidimizə bir nəsim.

Mövciyi-biçarəni dərd öldürür,
Rənginə bax, çarəsin et, ya kərim.

* * *

Rəva degil ki, verə müddəi şərab sana,
Fərağın ilə yanıb mən olam kəbab sana.

Əlində, ey büti-meyxarə, sağəri-xurşid,
Verir Məsih öz əli ilə şərab sana.

Yaratdı aləmi nur ilə, ey mələksima.
Desəm, nolur bu cəmalilə aftab sana.

Yanıbsan, ey dili-biçarə hicr odilə bu gün,
Fərağət ol ki, verilməz bərin əzab sana.

Xəmidə qəddini qüllabə döndərir Mövci,
Xəyali-zülfi verir bəs ki, piçü tab sana.

* * *

Arizin kim, rəngi-meydən göstərir gülgun niqab,
Od həvasilə verir zənciri-zülfə piçü tab.

Ta ərəqnak oldu meydən arizin məşşatənin,
Suyə döndi əldə güzgusində zahirdir həbab.

Sən ədəb gözlə, götürmə əl həyadən, ol ədib,
Şöhreyi-afaqdır bir yüz suyundan aftab.

Arizin sərlövhi derlər qaşları tuğrasinə,
Ya yazılmış hüsn divanında beyti-intixab.

Nəşeyi-meytək lətafətdən ləbin sirabdır,
Göstərir, Mövci, təbəssümlər əqiqi-ləlnab.

* * *

Gəl məni, ey təbib, rəncur et,
Dərdimi canım içrə nasur et.

Odlu canım şərari-eşq ilə,

Məni sən daxi Museyi-Tur et.

Gəzmə əğyar ilə bizi unudub,
Bizi şad eylə, düşməni kur et.

Oldı xətün tilsimi-əzəmi-hüsn,
Əfi zülfin andə gəncur et.

Mövciyə dəgmə həşrdə sən özün,
Həq rizasın aradə mənzur et.

* * *

Hər kimə ol səngdil səhba verir, qan ağladır.
Güldürür sübhi-vüsalü şami-hicran ağladır.

Fariğ olmaq bir nəfəs qəmdən mənə mümkün degil,
Saqi, xuni-gərm əgər güldürsə, dövran ağladır.

Yüz tutub mehrabə ağlarsam, demin zahid mənə,
Ey müsəlmanlar, məni ol namüsəlman ağladır.

Ey məni bəzmində yarın nalədən mən eyləyən.
Bülbüli-bitabi neyrəngi-gülüstan ağladır.

Hər kimi gülməkdə görsəm, məhv edər həsrət məni,
Bəs ki, müşkil güldürür gərdun, asan ağladır.

Piçü tabi-zülf ilə ol qönçeyi-xəndan mənim,

Tarü pudim şəmtək eylər pərişan, ağladır.

Rövzeyi-rizvan həvası məndə yox, əmma məni,
Arzuyi-rövzeyi-şahi-Xorasan ağladır.

* * *

Bimari-qəmi-eşqə dəva olmaz imiş,
Bu dərd mərizinə şəfa olmaş imiş.

Dərdi-dil eşitməzlər imiş məhvəşlər,
Aşiqlərə çox çunü çera olmaz imiş.

Biganəlik imiş aşinalıq rəsmi,
Biganələr ilə aşinə olmaz imiş.

Aşiqlərə rüsvaligi Məcnun qoymuş.
Divanələr içrə kədxuda olmaz imiş.

Çox kimsəni dilşikəstə gördük, bildik,
Hər günki sınıqda mumiya olmaz imiş.

Bu heyət ilə ki, ibtidası görünür,
Hicran gecəsinə intəha olmaz imiş.

Azadəlik üryanlıq imiş aləmdə,
Andə gireh, bəndi-qəba olmaz imiş.

Üftadələrin əlin tutarlar, Mövci,

Musayi təriqətdə əsa olmaz imiş.

* * *

Bu daği-kühən üstə bir tazə dügün qoydum,
Bir ömr təmam etdim, gün üstünə gün qoydum.
Məcnuninəm, ey Leyla, rüsvayi-cəhan oldum,
Əql ilə işim yoxdur, adımi cünun qoydum.

Hicran gecəsi ta qəmi-can istədi, can verdim,
Aşiqlər arasında bu rəsmi zəbun qoyum.

Əşk ilə cigər qanın gözdən axıdıb tökdüm,
Ancaq könülə bir qətrə xun qoydum.

Təqsir nədir, Mövci, yandın, əridin, getdin,
Təhqiq budur mətləb dağ üstə dügün qoydum.

* * *

Dəva qılmaz təmənnasilə dil əfkar olan yerdə,
Olur bimar sahibi-dərd olan timar olan yerdə.

Könüllər naləsin mən etməmək əqlə münasibdir,
Gəlir cüğdün sədası hər sınıq divar olan yerdə.

Gəzər, bir boş qəfəsdir, aşiqi-miskin bu aləmdə,
Alıbdır mürği-ruhi, həq bilir, gülzar olan yerdə.

Nədir üsyan kim, ondan kimsə çəksin munca istiğna
Ki, məhrudur, qaçar əglənməz istiğfar olan yerdə.

Əbəs can çəkmə, naseh, söyləmə Mövci qəbul etməz,
Nəsihət kargər olmaz kişi biar olan yerdə.

* * *

Aldı könül qulağə yenə dilrüba səsi,
Pəjmürdə gül açıldı, eşitdi səba səsi.

Ta ibtidayi-aləmə basdın qədəm həman,
Gördün gəlir qulağımıza intəha səsi.

Eşq içrə görmüşüz sərü saman edənləri,
Məcnundan özgə çıxmadı bir kədxuda səsi.

Çıxmaq gərək bir özgə diyarə bu mülkdən
Kim, günbəgün ziyadə gəlir macəra səsi.

Bir qayət ilə dərdinə xu eyləmiş könül,
Bimar olur, qulağına gəlsə dəva səsi.

Hatəm olan mübarizi-mərdan qulağına,
Davud nəğməsi kimi xoşdur gəda səsi.

Qəm gəlmək ilə tapdı sınıq könlümüz fərəh,
Bitdi şikəstəmiz, eşidib mumiya səsi.

Cismim qəmində bir pəri-kah oldu şövqdən,
Pərvaz edər, eşitsə əgər kəhrəba səsi.

Biganə olsa qafilə, bəsdir cərəs bizə,
Ondan gəlir qulağımıza aşina səsi.

Mövci, xudadan istə bu bəhr içrə sən nicat,
Girdabə düşsə kəşti nelər naxuda səsi.

* * *

Məhrəmin yox deme, qəmim yoxdur,
Bu da bu qəm ki, həmdəmim yoxdur.

Çıxsa bilmən vücud mülkindən
Daxi bir özgə aləmim yoxdur.
Ney kimi dəldi bağrımı gərdun,
Çəkirəm nalə, həmdəmim yoxdur.

Şölətək həsrətilə sirabəm,
Bərqdən özgə şəbnəmim yoxdur.

Göz yaşın sildi surəti-halim.
Bikəsəm, bəs ki, adəmim yoxdur.

Aşiqəm, vəslü hicrdən özgə
Bir behiştü cəhənnəmim yoxdur.

Yalqızam mərifət diyarında

Ki, həqiqətlə toəmim yoxdur.

Gəzirəm çərx kimi sərgərdan,
Heyf, Movci, çəmü xəmim yoxdur.

* * *

Kami-zəxmimdə məzaq dərdi-peykandan ləziz,
Ləzzəti-peykan məzaqi-zəxmi-dərmandan ləziz.

Çöhreyi-tiğin məgər sərçeşmeyi-caviddir
Kim, içər hər kim anı, der abi-heyvandan ləziz.

Saqi ilə mey içib bəzm eyləsək məzur tut,
Nəşeyi-peymanəmiz olmuş o peymandan ləziz.

Müttəsil canan qəmindən bəs nədən canın üzər,
Mövciyə canan qəmi gər olmasa candan ləziz.

vV

**MİRZƏ SALEH TƏBRİZİ**

*XVII əsrdə yaşayıb-yaradan və Füzuli ədəbi məktəbini davam etdirən şairlərdən biri də Mirzə Saleh Təbrizidir. Təzkirələrdə şair haqqında çox az məlumata rast gəlirik. Vəliqulu bəy Şamlu «Qisəsül-xaqani» əsərində yazır: «Mirzə Saleh Təbrizin şeyxül-islamıdır. O bəzən Füzuli təbiətlidir və Nəvai kəlamının ardınca gedir… Alimin doğulduğu yer Təbrizdir… O cənabın türkcə və farsca şeirlərinin cənnətnişan İran ölkəsində çox böyük şöhrəti var». Şairin digər müasiri Məhəmməd Tahir*

*Nəsrabadi isə öz təzkirəsində onun haqqında yazır: «Təbriz kübarlarındandır. Ata-babadan o vilayətin başçıları olmuşlar. O, yüksək insan, səlahiyyətdar və yumşaq bir şəxsdir ki, bir kimsənin ondan şikayəti yoxdur… Türki və farsi nəzmində təbi qüdrətli olan bir şairdir».*

*Şairin oxuculara təqdim etdiyimiz şeirləri İranın Parlament kitabxanasında saxlanan əlyazmadan götürülmüşdür.*

## QİTƏLƏR

Səndən iraq könlümi viranə etdi qəm,
Viranə etdi könlümivü xanə etdi qəm.

Hicran yolında kim, deməк olmaz hekayətin,
Tənri bilür, gözüm ki, nələr canə etdi qəm.

Göz yaşlu, sinə dağlu, qayğulu, başlu,
Söz doğrıdan keçər, bəni samanə edi qəm.

Mən vəsl istəyicivü hirman tələb həbib,
Gəldi arayəvü işi bir yanə etdi qəm.

* * *

Su səpdi, sildi-süpürdi gözüm nigar yolın,
Nə yaxşı güzguyə döndərdi didə yar yolın.

Güzari bir gün kuyi-vəfayə düşmüş imiş,
Bu qanlu didə gözətlər bizim qübar yolın.

Əziz olmağə kuyində xaki-rah oldı,

Bu qatı baş könül bildi etibar yolın.

* * *

Ola, yarəb, bir kərəz yarım bəni yad eyləyə,
Afəti-qəm görməsin hər kim bəni şad eyləyə.

Bu könül abad ikən viranə oldı hicrdən,
Şimdi vəqtidür ki, bu virani abad eyləyə.

Rəhm qalxubdur aradən, göz dutım qan ağlaya,
Dadinə kimdür yetən, könlüm dutım dad eyləyə.

* * *

Daği-cünun da etmədi eşq yolında çarəmiz,
Talemiz zəbn idi, işləmədi sitarəmiz.
Danei-əşk düzmüşüz riştei-ah ta məgər,
Ola təriqi-eşqdə səbhei-istixarəmiz.

* * *

Nəng qayğusun çəkən çaki-giriban istəməz,
Xatirin cəm istəyən zülfi-pərişan istəməz.
Qoy ətabi könlümi çini-cəbin viran edər.
Mövc kafidür sınıq kəştimğə, tufan istəməz.

* * *

Hər nəfəs xoş nəqşlər bu çərx varun göstərür,

Şol hərifdən olma qafil, qum satur, un göstərür.
Başə gəldi günlər, o gün yüzlü yarı görmədük,
Ey fələk, dövran sənindür kim, bizə gün göstərür.

* * *

Yuxu girməz gözümə, şəm bilir, mah bilir,
Könlümün halını sən bilməsən, Allah bilir.
Bu əgər heç yerə aparmazam, yol nə ola,
Dadrəs qapısını ahi-səhərgah bilir.
Saleh, onmaz iş əgər olmasa tövfiqi-rəfiq,
Vər nə salik yerin yolları gümrah bilir.

* * *

Sən dərd duymamış nə sölərsən dəvasını,
Hər nəstə bilməyə, deyə kimsə vəbaldır.
Ya mehr, ya sitəm, birini səndən istərəm,
Lütfün əgər həram isə, qanım həlaldır.
Dünyanın alu yaşılı bir-birə yaraşür,
Gər qövr ilən nəzər edəsən, vari aldır.
Küsməkdən özgə söz söləməz şəhr vaizə.
Bir taş ürəkli, odlu ağız, bikəmaldır.

* * *

Göz yaşım ilə su səpərəm yar qapısın,
Allahə şükr, bilməzəm əğar qapısın.
Sınıq qanatlı quş kimi hiç yanə getməzəm,

Taş yağsa başə, bəkləmişəm yar qapısın.
Dün dərd dilli Salehi xub eylədi xamuş.
Xuyini gördi, bağladı göftar qapısın.

## QƏZƏLLƏR

Ey tənrini sevən, sölə, vaiz xəyali nə?
Bu hay-huydən nə bitər, qiylü qali nə?

Ta eşq verdi yüz, görməm afiyət yüzin,
Hiç bilmənəm ki, hicr nə etdi vüsalinə.

Qanum töküci bağrımı qan etd firqəti,
Könlümdəki bənim nəvü dustim xəyali nə.

Tufani-hüsn ol yüzü göz şövq xirəsi,
Heç bilmədüm cəmali nəvü xəttü xali nə.

Şadivü qəmdə etməyinüz çox mübaliğə,
Dünya nədür ki, eyşi noləvü məlali nə.

Saleh bu qapu xəstəsidür, bir kərəz neçün,
İstəmədün, dirildimi, öldümi, hali nə?

* * *

Ta bu viran təndə bir can var idi, gəzdim cəhan,
Mehrdən bir nam eşitdim, bulmadım əmma nişan.

Gər məhəbbət görmədim, şadəm ki, minnət çəkmədim,
Bilməzəm bir böylə sövdani ki, sud edər ziyan.

Şükr ədasi bir çətin qayğulu müşkil iş idi,
Etdilər asan bizə düşvarı əbnayi-zəman.

Sağərüm sındırdıı vaiz, bən də tökdüm qanını,
Bir yaman iş etmədim, çoxdan demişlər qanə qan.

Sən bəni sərgəştə istərdin, səni mən – sərfəraz,
Sən də oldun kamranü bən də oldum kamran.

Ruzgari-şeyb də xali degil pür lütfdən,
Qəddimiz bidi-müvəlləh, çöhrəmiz bərqi-xəzan.

Azü çox Saleh sözindən yox, əzizim, sud kim,
Bir təbəssümçün desə can verürəm, inan, inan.

* * *

Mehrü vəfa sözini heç kimsədən inanmaz,
Yəğmadən əl götürməz, bidaddən usanmaz.

Can vermişəm yolunda yüz bin xəcalət ilə.
Bilmən neçün demişlər, varın verən utanmaz.

Vaiz, sənin kəlamün hər biri neştər olsa,
Hər kimi basdı qəflət, ta diridir, oyanmaz.

Mən çərxə atmışam taş, mən eşqi etmişəm faş,
Mərd etdügini söylər, ər dedügini danmaz.

Töhmət deyər özinə, nə söylər özgəsiçün,
Utanmiyən özündən heç kimsədən utanmaz.

Hirsilə etmə möhkəm qəsri-əməl binasın,
Seyli-qəza önində çərxi-bərin dayanmaz.

Göz həqq yolından örtən tənbihi həqqə lazım.
Ağır olan yuxusi, oyatmasan, oyanmaz.

Saleh, nə kibriyadur ol nazlu dilrübadə,
Heç xəstəsini sormaz, heç aşiqini anmaz.

* * *

Yeriməz salik olan rahi-rizadən qeyri,
İstəməz arif olan cövrü cəfadən qeyri.

Varıdır hər nə gərək mehrü vəfadən qeyri,
Yoxudur, istəməyin cövrü cəfadən qeyri.

Görmədim mehr təriqində sitəmdən özgə,
Gəlmədi eşqdə başımğa bəladən qeyri.

Görgəc ol xosrovi-xubanı nə əfğanlar edim,
İti söz kimsə deməz şahə gədadən qeyri.

Yardan başqa dü aləmdə muradım yoxdur,

Nə gərək dərdi olan canə dəvadən qeyri.

Könlini saf elə xəlq iləvü asudə diril,
İstəməz ayinə heç kimsə səfadən qeyri.

Əhli-məal nəvü mehri nəvü kini nə ola,
Saymadım heç kimi mövcud Xudadan qeyri.

Qədü balavü gözü qaşilə yox bazarım,
Könlümü seyd etməz imiş hüsn ədadan qeyri.

Qapı çox gəzdimü göz yaşımı bica tökdüm,
Yox imiş dadə yetən kimsə Xudadan qeyri.

Salehi mən edərlər meyü məşuqindən,
Bana heç kim sitəm etməz Salehadən qeyri.

vV

## MƏLİK BƏY AVCI

*II Şah Abbas və Şah Süleymanın dövründə yaşayıb yaradan Məlik bəy Avci yüksək vəzifə sahibi, dövlət adamı olmuşdur. Şairin ədəbi irsinin müəyyən hissəsi Berlin Dövlət Kitabxanasının əlyazmalar xəzinəsində saxlanan «Gəncinə» məcmuəsi vasitəsilə günümüzə çatmışdır. Məlik bəyin qəzəlləri «Divani-Məlik bəy» başlığı altında kitabın 245a-307a vərəqlərinə köçürülmüşdür.*

*Məlik bəy Avcının haqqında danışdığımız şeirləri 1933-cü ildə*

*İstanbulda müasir Türkiyə əlifbasıyla çap edilmişdir. Kitabın tərtibçisi, mərhum Əhməd Cəfəroğlunun əməyini təqdir etməklə bərabər, demək istərdik ki, burada yol verilmiş bir sıra səhvləri düzəltməyə, ümumiyyətlə Məlik bəyin ədəbi irsini yenidən tədqiq etməyə ehtiyac vardır.*

## QƏZƏLLƏR

Pəri cilvə çəkər, ey məh, mələk riqab sana,
Nə aysın, duagudur afitab sana.

Götür bu bürqəği, tutsun cəhanı tazə günəş,
Yaraşmaz ay üzidə əbr tək niqab sana.

Müariz olsun gülşən içrə lalə ilə,
Sən, ey behişt gülü, kim verür cəvab sana.

Sana nə hacət müşkü gülab erür, ey şux,
Səpər əbr suyu gülü tərin gülab sana.

Məlik, xərabə könül köşəsin nə xoş tutdun,
Mübarək ola bu məmureyi-xərab sana.

* * *

Eşq adabında can verməkdürür şərti-ədəb,
Dilə sən bu şərtlə, et yardan hüsnü tələb.

Çərxi pür al iş bir daxi füsusilən çalur,
Qızdurur bu növ hər gün bəzmi ənduhü tərəb.

Qılma pür nəhsi, balü gərdəni mərdanədir,
Kətxudalıq şərti dünya üzrə məqdurü əzab.

Bisəbəb çəkdim səbəblərdən bəs azarlar,
İstərəm qəti-təəllüq hər səbəbdən, ya səbəb.

Gecələr əzbəs bənəfş ahımla bimandır tənim,
Gafliya, ya zəncir edər axır bəni sevdayi-şəb.

Nə Nəvayi, nə Füzuli, nə Məlik, nə Adəməm,
Bəndə şaham Məlik adlu, nə kənitü, nə ləqəb.

* * *

Bəni el ağzında əfsanə qılan dərdmidür.
Xansı dərdim söləyim, dərdi-dilim fərdmidür.

Qış günü xəstə tənim isti təmuz içrə yanar,
Qızdıran böylə bəni-zarı dəmi-sərdmidür.

Gəlür ol zülfü pərişan mey bu miskin başına,
Rəhgüzarında gözüm sürməsi, ya gərdmidür.

Nə gözü qaşü iti qəmzəvü kəskin müjədir,
Nə oxü yayü qılıcü söhbəti navərdmidür.

İti misri qılıcı nola gər pas tutmuş ola,
Adəmin cövhərini tanımıyan mərdmidür.
Nəqşi yanmış fələki süflə nə yaxdun Məliki.

Bimürüvvət necə qəm şeşdəri bu nərdmidür.

* * *

Mürəqqə dərd əgnimdə libası etibarımdur,
Mürəssə dağ başım üzrə taci-nigarımdur.

Gözümdən ləl axar əlmasa od verən yaşım,
Cəvahir danəsi qiymətlü əşki-abdarımdur.

Bənəm od Dəcləsi içrə qanad çalan Səməndərtək,
Gözümdən daşlanan odlar sirişk uçqun şərarımdur.

Başımda təprənən sevdamıdur, ya dağda daş oynar,
Çıxan əflakə təpəmdən tütünmü, ya buxarımdur.

Çəmənlərdə çiçəklər rəng açıldılar, bən həm
Vücudum şərha eylədüm, yəni baharımdur.

Bu miskini nola kəlbim desən, gər oxşasan bir gəz,
Bana ar olduğun bilməm, bənim xod iftixarımdur.

Quru yaşı suvardı bərqi-tiği növki-müjgandan,
Bana heç iltifat etməz, Məlik, birəhm yarımdur.

* * *

Ol şux səhər sərxoş bağ içrə xüram eylər,
Rəftarı cəvan sərvə eyşini həram eylər.

Şahanə qoyub əgri altun külahın başdan,
Hər baxışı Yusif tək bir şəhri qulam eylər.

Həm başda qızıl fincan, həm əldə büllurin cam,
Gəh camını ayinə, gəh börkünü cam eylər.

Zülfi gecədən saçmış, köksün dəmi-sübh açmış,
Çün könli pərişanın sevdasını xam eylər.

Öz başına su içmiş vəhşi gəzən ahu tək,
Cadu gözi hər saət bir yerdə məqam eylər.

Uşaq kibi aldadur ol şux, Məlik, bizni,
Hər sübhümüzü bir növ vədə ilə şam eylər.

* * *

Saru bənzim birlə al eylər, rüxi-gülnarı gör,
Yandurur miskingahı, bərqi-atəşbarı gör.

Sərv bir əgri çubuq, şimşad bir əgri tikan,
Uyma bu naqislərə, ol şiveyi-rəftarı gör.

Çox görübsən qan içən əgri qılıclar cövhərin,
Göz ucuyla bir daxi ol şiveyi-rəftarı gör.

Hər nigaru nəqşə gətir surəti-divar tək,
Gər özündən getmək istərsən, gözün aç, yarı gör.

Kəbəni etmək təvaf istərsən, ötmə qapudan,
Ol qara daş qaçmaz, əvvəl külbeyi-xəmmarı gör.

Çəkdügüm avazı rudü meylə görmüşdün, Məlik,
Şimdi könlümdən çəkən gülbani-istiğfarı gör.

* * *

Bənimlə dinməz, qeyr ilə min kəlam keçər,
Sözü rəqib ilə xas, bənimlə am keçər.

Nəfəs-nəfəs qəmimi xəlqdən nihan edərim,
Bişən xəyallərim könlüm içrə xam keçər.

Fitilə şölədən etdüm, könülcə yanmadı dağ,
Bənim tamam işim ilə natəmam keçər.

Xərabü xatirü aşüftə zülfə tapdı nizam,
Nə haldır bənə kim, böylə binizam keçər.

Xəyali-zülfün ilə sorma zar halimi heç,
Nə söyləyim, bana hər sübhü dəm nə şam keçər.

Yetişmiyincə dəmi-vüsl, sayi qılmaz sud,
Könüldə nola ki, hər dəm yüz ihtimam keçər.

* * *

Aləmin dilgəştin etdim, bir rüxu-zibası yox,
Bənzi saru, könlü qanlu, bir gülü-rənası yox.

Kimsə imanın nə ümmidilə bərbad eyləsün,
Bu Firəngistanı gördüm, bir büti-fərsası yox.

Cəfd tək çoxlar bu viran içrə fəryad eylədüm,
Bu xərabın güyiya bir bülbüli-şeydası yox.

Ta ayaq basdum məlamət dəştinə, çaqrışdılar,
Bir-bir ahular ki, həm Məcnun, həm səhrası yox.

Yağdurubdur dağlar tək eşq daşlar başıma,
Bən ki, bu sevdaya düşdüm, sanuram dünyası yox.
Necə surgün ola dərgahında bu miskin Məlik,
İtilür bir yana axır sevdügüm qavğası yox.

* * *

Heç yerdən başıma daş yağdırır sevdayi-eşq,
Eylədi rüsva bəni ətfal ara qavğayi-eşq.

İltifat etməz vüsalə, ömrü bad ilən keçər,
Yad olur andan daxi kafirdür istiğnayi-eşq.

Bir dolu peymanə saqisiz, qədəhsiz, badəsiz,
Başə çəkdüm bixəbər, çox saf imiş səhbayi-eşq.

Yandurubdur pərdədə bin şöləni fanus tək,

Kül kimin pərvanə dənlü şəmi bipərvayi-eşq.

Düşmüşəm heyrət məqamı adlu bir vadiyə kim,
Bir ucu səhrayi-qəmdir, bir ucu dəryayi-eşq.

Böylə naziklikdə kim, görməzsən artıq qatı dur,
Xarü daşın təlaş eylər, Məlik, minayi-eşq.

* * *

Tut fəna mülkün gər istərsən, könül, azadəlik,
Kim olubdur bu yol əhlinə əsa üftadəlik.

Qəm yoluna olsa gözüm yaşı pamal, incimə,
Öz işini işlər axır, zaye olmaz zadəlik.

Der pəri bir sübuhilik mey etmiş mərhəmət,
Ey səbu, saz istərəm zərfi ki, olsun badəlik.

Qəm yükü bidi-müəlləq kibi əgmişdi belim,
Qılmasaydı saqiyi-şimşad istadəlik.

Gəl müsəvvər bu nigarü nəqşə aldatma özün,
Bir neçə gün həm səhər tək eylə məşqi-sadəlik.

Məbədü mədfən, Məlik, mövtu həyatında yetər,
İstərəm Sahi-Nəcəf kuyində bir səccadəlik.

* * *

Bəni candan usandurdun, nə sevdasun, nədür adın,
O nə şorın çıxarursan, gərəkməzmi düzün dadın.

Nə vəslindən könül asudəlik buldu, nə hicrindən,
Qaçandur yaxşı vaxtın, xandadür bəs xatirü şadın.

Nə dəmdür sərsəri-ahıyla getməz badə bünyadım,
Nə eşq oldun, ilahi, badə qopsun pənci bünyadın.

Bu məhv olmuş könüllərdən gəlürmi yaduna hərgiz,
Nə gizlü kimsədən, vallahi, yandurdu bəni yadın.

Bəla zülfiylə saldın hər tərəf bir seyd toprağa,
Düşür damın fəribi çoxca, rəhmi heç səyyadın.

Bu gün, ey sərvi-nazik, çöhreyi-qəd yara bənzərsən,
Səbaq kimdən alubsan bu rəvişdə, kimdür ustadın.

* * *

Mübarək, padişahım, tacu təxtin, eydi-novruzun,
İşıq daim çırağı-mehr tək şəmi-şəbanruzun.

Cəhan gün minnətin dövründə çəkməz, əlminnətülillah,
Tutubdurmuş günəş tək yer yüzün iqbali-firuzun.

Sinanlarla damarın çalsalar, xəşmin əsər qılmaz,
Qurutmuş bəs ki, qanın bərqi-şəmşiri-cəhansuzun.

Basub bağruna can tək san xəyali-növki-müjgandü,
Ədu könlündə xoş yer eyləmiş peykani-dilduzun.

Nə yalquz bən yeddi gögdə yulduzlar dua eylər,
İlahi, ayü gün olduqca olsun rövşən ol düzün.

İrəm bağı, Məlik, artıq qəzəlxan əndəlib istər,
Bu gülşəndə səsi müşkül çıxar mürgi-novamuzun.

* * *

Kəsmişəm aləmdə ülfət aşiqi-fərzanə tək,
Düşmüşəm bir aləmə yazı keçən divanə tək.

Şölə suyu tək suvarur bu Səməndər məşrəbi,
Ururum oda-közə yalın qılıc pərvanə tək.

Eşq ola, yarəb, bu sevda, ya ki, bir batil xəyal,
Sərnigun başımda odlar yanar atəşxanə tək.

Zülfü içrə könlümün fikrinə düşməz ruzgar,
Küncü üzrə mar yatmış guşeyi-viranə tək.

Ömrlər dövr etmişəm yolunda şirin canı sərf,
Aşinayam, keçmə bəndən görməmiş biganə tək.

Bilməzəm bihudəgu vaiz əlindən neyliyim,
Başluyubdur yenə bu dövri-diraz əfsanə tək.

* * *

Baharım keçdi sənsiz, xandasan, ey gülüzarım, gəl.
Baharım gülüzaründür, behiştim gəl, baharım, gəl.

Gəl, ey könlüm, qərarım qalmadı, sənsiz, qərarım, gəl,
Necə səbr eyləyim, gəl həddən ötdü intizarım, gəl.

Qədi şəm, rüxi gül, xuyi atəş, laləzarım, gəl,
Müsəlsəl türrəsi dami-bəla, aşiq şikarım, gəl.

Gözün dövründə məstan olmuşam, keçməz mədarım, gəl,
İti kirpiklərin kəs, doğra bağrım, qanlu yarım, gəl.

Qədin sərvü ərərür, ixtiyar etdim, nigarım, gəl,
Boyun göstər, xuram et, getdi əldən ixtiyarım, gəl.

Məlik, yarım səri-kuyində gəl gör, etibarım gör,
Əgər bir desə ki, miskincə kəlbi-dağıdarım, gəl.

* * *

Yar zülfündən ayru gəl açılma, ey sünbül,
Sən daxi qızarma çün, ey gözüm tikanı gül.

Necə açılım gül tək, getdi çün bahar əldən,
Söyləməz xəzan fəsli aləmi yaxan bülbül.

Saçı sünbülümsüz heç zülfü-ahım açılmaz,
Ey bənəfşə, başınçün, sən də saçma çox kakül.

Yarsız düşüb tənbur, tarsız, qədəh meysiz,
Naydən nəfəs çıxmaz, şişə eyləməz qülqül.

Zari-cismimi əzbəs yaxdı odlu hicranın,
Göz yaşım daman yerdən biteydi laləvü gül.
Yardan cüda hər dəm canımı, Məlik, sancar,
Xah əqrəbi-kaşan, xah fitneyi-kakül.

* * *

Eşq içində can qəmi fərzanəlik şərti degil,
Baş qaçurmaq tiğdən mərdanəlik şərti degil.

Səndə mey tək, nəşeyi-gül tək xəndə istedadı var,
Böylə boş gəzmək, gözüm, peymanəlik şərti degil.

Gecələr qəddin xəyali şölə sərvidür bana,
Yanmasan, qumru sifat pərvanəlik şərti degil.

Aşiqəm, duzax kibi yüz növ od canımda var.
Dağ odun söndürmək atəşxanəlik şərti degil.

Ver iyi yidür köp ayağı miri-zəban, piri-Muğan,
Dolu ver kim, kasəlik xümmanəlik şərti degil.

Surəti-çini bir-birinə dəgsə könlüm oyanmır,

Qeyri-timsalı, Məlik, bütxanəlik şərti degil.

* * *

Oldu dövründə, şəha, yeksər cəhan növruzü gül,
Fəsli fəsl eylər sənünçün gülsitan, novruzü gül.

Gül-gül açıldı qədəh saqi qolunda subhdəm,
San çəməndə qıldı şaxı ərgüvan, novruzü gül.

Yaralı tək kim həna rəngində açmışdır çiçək.
Hər gün eylər müxtəlif bərgi xəzan novruzü gül.

Dili bağlu əndəlibi açılub biçarənin,
Toy tutub gülşəndə eylər bağban novruzü gül.

Saqiya, mey sun ki, yetmiş yaşlı bir möhnəti,
Oldu yeddi gündə lütfünlə həman novruzü gül.

Qönçələr açıldı, nurlar güldü, yazuqsan, Məlik,
Sən həm ol şahı sevərsən bir zaman novruzü gül.

* * *

Yürək sıxub dolu peymanələrlə qan çəkərəm,
Lətif mey çəkicək el, bən acı qan çəkərm.

Duranda saqi ayağa yazıq nə qanlar udar,
Könül qəmini bən el mey çəkən zaman çəkərəm.

Soruşma çəkdügimi, saqi, bəla əlindən
Ki, cümlə dadəvü bən təşnələb aman çəkərəm.

Əlinə taxta alub məşq edər müsəvvir tək,
Həmin oturmuşamü nəqşi-imtəhan çəkərəm.

Qəmindən il bu uzun gecələr nə gün çəkələr
Ki, qurdü quş həman uyur və bən fəğan çəkərəm.

Qatı yer olsa çökər, güclü dağ olsa ərir,
Məlik, bu növiki bən cövri asiman çəkərəm.

* * *

Qan sirişkim, lalə dağım, sölə ahımdur bənim,
Bu qızıl danlu qara ləşkər sipahımdur bənim.

Saçılan tel-tel saçın, ey şux, sünbül hər yana,
Sanma zibi-hüsn kim, bəxti-siyahımdur bənim.

Ey kəmanəbru, xətadür doğru baxmaq yüzünə,
Öz gücü birlə sinən tiri-nigarımdur bənim.

Ol ki, hərgiz əgri zərrin tellərə baş əgmədi,
Başda əgri sanduran tərəfi-külahımdur bənim.

Gər bənimlə çərx kim bin əksük atdıysa nola,
Yarun artuq himməti-püştü pənahımdur bənim.

Bu qılan təsxir dünya mülkünü gün tək, Məlik,
Padşahım, dinpənahım, qibləgahımdur bənim.

* * *

Büti ki, dərgəhi ol kainatədür məscud,
Nə şeydür, nədür əsli, nədəndür ol mövcud.

Bu mümkinat əlamətidin irür peyda
Ki, var məhal, nihan olsa gəl vücudi-vücud.

Nə büt, nə qiblə, nə iman, nə din, səni bilürəm,
Xudayi həm bilür, ey sevdügüm, səni məsud.

Yüzündən olmuşam atəşpərəst, könlümə bax,
Yanır səni göricək türfə nalə ilə bu ud.

Şərabxanədə piranə sərmüqim olubam,
Kim etmiş ola dua, kim ki, aqibəti-məhmud.

Məlik, pərəstişə şayəstə taət eyləmədün,
Bu din ki, səndədür, olsun nəsibi-gəbrü yəhud.

* * *

Verən girdabtək dəryayə tən fəryadrəs neylər?
Olan fikri-fəna qövsində dəryayi nəfəs neylər?

Rəvan olğac təvafi-Kəbeyi kuyinə məhmillər.

Ayılmış könlümün aşüftə əfğanin cərəs neylər?

Dönər pərvanətək başinə, qoy uçsun, qanatin aç,
Gül ətvarinə sərgərdan olan bülbül qəfəs neylər?

Bəlalər, qayqular, qəmlərlə netsün binəva aşiq,
Fəqiri dürlü-dürlü dərd öldürməzmi, bəs neylər?

Süleyman ləşkəritək səf çəküb bikəslüqüm hər yan,
Bu aləm ləşkər ilən adəm olsa, kimsə kəs neylər?

Məlik, sən çək ətək bir guşei-üzlətdə ənqatək,
İraqdan bax, bu dünya şəhdi üstə gör məkəs neylər?

* * *

Şərabi-ləli-nabun can degilsə, candan artuqdur,
Bana bir qətrəsi min çeşmeyi-heyvandan artuqdur.

Pərişan kakilin munisi quvrıdu, bəyan olmaz,
Bu misra vəsfi-hal olduqca bir divandan artuqdur.

Bu nazik toz ki, gül yarpağıtək rüxsarına qonmuş,
Qübar ilən mütərcəm yazılu Qurandan artuqdur.

Qara əgricələr kim, ərğəvani üzrə baş urmuş,
Gülüstan arasında səbz olan reyhandan artuqdur.

Gər olsan yar dərdi birlə məmnun, ol, nəfəs çəkmə,

Bu dərdin yaxşı bil qədrin ki, çox dərmandan artuqdur.
Məlik, zəbt eylərəm könlümdə minatək gözüm yaşın,
Bu qanlu çayə yüz versəm, gözüm tufandan artuqdur.

* * *

Yuxulu nərgisün dövründə bimar olmışam, neylim?
Pərişan kakilin tarı kibi zar olmışam, neylim?

Neçə bir keçsün acı hicr ilən vəqtüm, nə gündür bu,
Bu şirin ömrdən, əlbəttə, bizar olmışam, neylim?

Nə qaldı məndə, ey kafir, qəmindən bəs ki, incəldüm,
Miyanun muyi zinnari kibi tar olmışam, neylim?

Gözüm, gəl, gəl, gözümdən qanlu yaş saçılsa, məzurəm,
Dolu peymanələr dövrində sərşar olmışam, neylim?

Neylim, sən bivəfa əz bəs gəzərsən gizlü aşiqdən,
Xəyalın birlə bən həm gizlücə yar olmışam, neylim?

Məlik, pərvanətək ol şəmi-gülrux oduna yandum,
Sanur, bən sanuram bülbül kimi xar olmışam, neylim?

* * *

Hüsnünqə oxşar çəməndəki güli gördüm,
Zülfünqə manənd şax sünbüli gördüm.

Naz ilə ol şux ötəndə canum evindən,
Mülkinə Dara satan təcəmmüli gördüm.

Gözümə gəlməz müşəvvəş olduğu halim,
Ta dolaşuq həlqə-həlqə kakili gördüm.

Düşmən sərkeş olur zəbun müdarə,
Dağı ayağdan salan təhəmmüli gördüm.

Xak oynar zərur düşsə yerindən,
Aləmi pamal edən tənəzzüli gördüm.

Bən dəxi bilməm, Məlik, kim etdi bəni qətl,
Qanum içən qəmzədən təcahüli gördüm.

* * *

Cərahət canə oddur mərhəmi-lütf aşinalərədən,
Pozulmuş qönçəyə peykan dəgər peyki-səbalərdən.

Nə vəsfin eyləyim aramsız bir qətrə qan könlün,
Əgər simab yaqut istəsən, sor mübtəlalərdən.

Ləbi-xüşk ilə daim atəşi-tiz içrəyəm qəltan,
Güziran olmışam yaqut suyutək həvalərdən.

Səba bir sürməliq toz səpsə nola yar kuyindən,
Gözüm artuq qamaşdı bu işıqsız tutiyalərdən.

Vəfasız yardən gahi edərdüm şikvei-bica,
Yağar daş başimə el tənidin şimdi vəfalərdən.

Humayun padşahun çətri iqlimi-səadətdür,
Məlik, dut sayəsin kim, od yağar balu hümalərdən.

* * *

Bu gün, ey sərvi-nazik, cilvei-qədd yarə bənzərsən,
Xürami-dilfirib ol sərvi-xoşrəftarə bənzərsən.

Nəsən, ey acı-acı sözlü, şirin dillü tutisən,
Sözi şirinü təlx ol şuxi-xoşgöftarə bənzərsən.

Bu gün çox aşina gəldün gözə, kimsən, nəsən, ey gül,
Açıldı könlüm açılduqca rəngi-yarə bənzərsən.

Məgər, ey əbr, düşdün bəntək ayru yardən sən həm
Ki, firqətdən qan ağlar didei-xunbarə bənzərsən.

Sənin, ey bərq, həm çox odlu gördüm tiği-müjganun,
Bu könlümdən su içmiş ahi-atəşbarə bənzərsən.

Nə zənginsən bu gün, ey qanlu-qanlu köksümün daği,
Açılmış lalə-lalə didei-xunbarə bənzərsən.

## MÜXƏMMƏS-MÜSTƏZAD

Bir afət imiş eşq ki, sevdasinə düşmaq
Divanəlik istər,
Gəncin diləyüb kuhinə, səhrasinə düşmaq
Viranəlik istər,
Qan ağlayıban qorxulu dəryasinə düşmaq
Peymanəlik istər,
Odlara yanub tövri-təmənnasinə düşmaq
Pərvanəlik istər,
Ey vay ki, müşkil işə düşdüm, yenə ey vay,
Fəryadimə yet, hay.
Ney vəslüvə təskinəmü ney hicrüvə tabim
Eşqün sitəmindən,
Gündüz-gücə gözdən uçub əncüm kibi xabım
Əflak qəmindən,
Şamü səhər amadə şəfəqtək meyi-nadım
Göz qanı yəmindən,
Sənsiz nə deyim necə keçir hali-xərabim.
Hicrün ələmindən,
Çemimdən axan çeşməvü könlündən axar çay,
Ey nərgisi-şəhla…

vV

## VAİZ QƏZVİNİ

*XVII əsr Azərbaycan şairi Mirzə Məhəmməd Rəfi Vaiz Qəzvininin Səfəvi şahlarından II Abbas və I Süleyman zamanında İsfahanda yaşamışdır. Professor Turxan Gəncəyi şairin Londonun Britaniya muzeyində saxlanılan farsca divanının əlyazmasından onun Azərbaycan türkcəsində 9 qəzəlini üzə çıxararaq 1971-ci ildə İstanbulda çıxan «Türk dili və ədəbiyyatı dərgisi»ndə nəşr etdirib. T.Gəncəyi göstərir ki, Vaizin bu qəzəlləri XVII əsrdə İsfahanda inkişaf edən türk şeirinin imla və şivə*

*xüsusiyyətlərinin öyrənilməsi baxımından diqqətəlayiqdir.*

*1971-ci ildə Vaiz Qəzvini divanının elmi-tənqidi mətnini tərtib edən doktor Sadat Nasiri şairin 1617-ci ildə doğulub, 1678-ci ildə vəfat etiyini göstərir. Vaizin bəzi ana dilində yazdığı şeriləri Berlinin dövlət və İstanbulun Nuri-Osmaniyyə kitabxanasında aşkar edilmişdir.*

vV

Çapqınçı əgri baxışı müjgan yarağıdür,
Ol qəmzə oğrı gözləri oğrı yatağıdür.

Ol növbahardin göyül odlandı lalə tək,
Yandı çırağımız, nə əcəb eşq  ocağıdür.

Ol zərf qanı almaya gər hünsdür şərab,
Al qanı ala sağər əgər yar saqidür.

Hər tük başımda qət′i-rəhi-eşq ilə tikən,
Hər rəg tənümdə dağ ilə bir gül budağıdür.

Ol türrə çöhrə atəşidin qalxmış tütün,
Ol əgri qaş fitnə odın çaxmağıdür.

Ol yar vəslin istər isən, xəlqdin üzül,
Vəhdət kəməndi aşiqə canan qucağıdır.

Dünya evində cud eləyən axirət tapar,
Acıq əl ol kərim ilə qonşu çanağıdür.

Vaiz, əgildi qəd qocalıqdan oraq tək,
Yəni bu yerdin indi biçilmaq çağıdür.

* * *

Əlində sağəri-gül müflisin ayağına bənzər,
Yüzində ğazeyi-tər gündüzün çırağına bənzər.

Nəzər ki, bağİ-cəmalına düşdü, çıxmağı yoxdur,
Bieynih ol rüzi-ziba behişt bağına bənzər.

Göz içrə mərdüməki cay vermişəm nə əcəb kim,
Bənim köyüldəki ol gülüzar dağına bənzər.

Cüda bolup səri-zülfi yüzindin oldı pərişan,
Yüzindin ayrı tüşən aşiqin dimağına bənzər.

Ağardı baş tüki, Vaiz, nə iş gəlir dəxi səndin,
Dimağ bu qocalığda səhər çırağına bənzər.

* * *

Vermə çox rəngi-güli arizi-cananımıza,
Girmə, ey badeyi-gülrəng, bizim qanımıza.

Ol nə rüxüdür, nə təravət ki, onun feyzindin,
Gül olur xar, əgər əl vura damanımıza.

Ol nə ləbdir, nə dəhandır, nə həlavətdir bu

Ki, şəkər sözləri od saldı bizim canımıza.

Necə kim, qönçeyi-sirab gülər şəbnəmdin,
Ol gülər yüzlü gülər dideyi-giryanımıza.

Gün kimi sıyra qılıc dün gecə bizdən keçdin,
Nə bilirsən ki, nə gün keçdi yazıq canımıza.

Nari-rah oldu Məsiha kibiyə bir suzan,
Vay əgər bəxyə əli təysə giribanımıza.

Sayılır dadü bihiş xəlqi-cəhan içrə bu gün,
Verə fitva əgər ol həşm bizim qanımıza.

Rizqimiz güşşadın əz bəs ki, boğazda dögülür,
Nə əcəb saysalar abumızı danəmizə.

Müddəi birlə sözüm var süxənvərlikdə,
Qanı bir hakimi- adil,yetə divanımıza.

Qanı bir dilli fəğan ərz edə, Vaiz, sözümü,
Bizə türki deyən o yari-süxəndanımıza.

* * *

Köyünlər yerdə ceyranı, fəğanlar gögdə durnası,
Gözəl avlaq imiş, laçın baxışlım, eşq səhrası.

Zi bəs pürcəzbə olmuş Bisütun Şirin misalindin,

Əcəb kim almaya Fərhad əlindən tişə xarası.
Axar abi-həyat əz bəs bulandıq ömr bağından,
Nəzərdə girdbadindin bulunmaz sərvi-rənası.

Çürür torpaqla çox gənci-hünər bu künci viranda
Ki, bu cüz′i-zamanda tanımazlar qeyri-Abbası.

Dilü canı qəmindir, mülkü malı hadisatındır,
Deyəllər xacə dünya dardır gör qanı dünyası.

Görür aqil bu dəstin laləsindən çeşmi-dil birlə
Ki, daim işrət içrə külfəti, toy içrədir yası.

Gözi xoşluq yüzi görməz, təni asudəlik bilməz,
Diriykən can çəkər, əlqissə mülkü mal cuyası.

Bu cahil xəlq daim bir-birindən hacət istəllər,
Tamamı bəndəvü hiç kimsə bilməz kimdir ağası.

Sərapa dərdi-sərdür, çox cahan malına aldanma,
Fərağat istər isən, Vaiz, əldən vermə iflası.

* * *

Dəni nancaq tərəqqi eyləsə, ali-məkan olmaz,
Zəmin toz olsa, başı gögə dəgsə, asiman olmaz.

Çox islah istər insan vücudı, ta ki dil bilsin,
Qələm yonulmayınca hər tərəfdin xoş bəyan olmaz.

Köyül çak olmayınca, bitməz anda mərifət töxmi,
Sökülməz ta zəmin şoxm ilə bağü bostan olmaz.

Sığışmaz bu köyüllər aləminə şövkəti-hüsni,
Bənim dərdim aniçün kimsəyə xatirnişan olmaz.
Bir iki misra ilən olmasan sahibsüxən, Vaiz,
Ki, mövzun olmaq ilə hər çubuq sərvi-rəvan olmaz.

* * *

Cəbrsiz bir-birdən ayrılmaz kəsəklər, daşlar,
Yol həqin neyçün itirdilər gözəl yoltaşlar.

Noldu, yarəb, başə varmaz bir-birinin iki göz,
Varisi bir arxadan gəlmiş bu qarıntaşlar.

Bu nifaq əhlinin öv zainə bir bax, gör əyan,
Yüzlərində cidəli gözlər, qılıclı qaşlar.

Yapışıpdır dizə daim hiyləbazlıq fikriçün,
Bir nəfəs əğlənməyən həq səcdəsidən başlar.

Bağlıyan çağ bəhri-rəhmət fikri qapdı könlümi,
Qalmadı qayitsələr yoddan tökülmüş yaşlar.

Saydım ol ömri-giraminin səfərdən gəldügi
Kim, yenə qayıtdılar yetmişdən ötmüş yaşlar.

Yığlayan çağ hicrdən xəndan gözükdi qarşıdan,
Gözlərə az qaldı qayıtsa tökülmüş yaşlar.

* * *

Əhbabə olmuya dəgə yanmış sitarəmiz,
Bica degil xəlayiq içində kənarəmiz.

Dərda ki, görmədük həmeye-ömr gül kibi,
Peymanəmizdə cüz cigəri-parə-parəmiz.

Bitmişsə bəxyə diş kibi ağzında saçılır,
Dişində görsə tiğini, səksənsə yarəmiz.

Taxdıq qulağə dürr kibi həq sözlərin təmam,
Artar cənan xəracinə bu guşvarəmiz.

Eşq əhlinin kəmalinə kim sərhesab olur,
Hər dağ başidə sifr tək artar şomarəmiz.

Baş rəşə başlıyanda umardım oyanəli,
Başdan kənun uşaqbaş olub gahvarəmiz.

* * *

Ey səhiqəd, keçdi igidlik, xəm olmaq çağıdır,
Yetdi bu tumar payanə, bükülmaq çağıdır.

Döndü ağız tişsizlikdən ilan suraxına,

Ağla, ağla, bu ağız birlə nə gülmaq çağıdır.

Getdi qüvvət dizlərdən, oturaq olmaq gərək,
Çün bina sustaldı, divarın tökülmaq çağıdır.

Güclü yağar qarıluq qarı, əsər qəm sərsəri,
Necə yüz çin tüşməsun, yüzgə pozulmaq çağıdır.

Kəs təəllüq cismi-xakidin, budur, gəldi əcəl,
Cani-şirinim, bu süzgəcdən süzülmaq çağıdır.

Ruzigar ilən müdara qıl bir-iki gün daxi,
Çox çəkişmə, ey mənim ömrüm, üzülmaq çağıdır.

Ömr keçdi, cani-şirinim, keçinmə təlxkam,
Kam özündin al ki, bostanın pozulmaq çağıdır.
Xəlqi-aləm içrə, Vaiz, çox mükərrər olmuşuz,
Başə gəl, ey ömr, başlardan savulmaq çağıdır.

* * *

Özgə aləmdə məgər töksəm qəmindən yaşlar,
Yoxsa bu seylabə dözməzlər budağlar, taşlar.

Keçsə gər ləli-ləbindin adımız bu şövqdin,
Daşınur əşkim kibi xatəm gözindən qaşlar.

Ol bahari-hüsn feyzindin ki, mən Məcnuniyəm,
Gül kibi ətfal əlində açilullar taşlar.

Ta qılınc çıxmaz qından, zahir olmaz gövhəri,
Nuri-çeşmim, vəsməni neylər o əgri qaşlar.

Pay ta sər ol pərivəş cani-şirindür, nə tən,
Can çəkəllər surətin gər çəksələr nəqqaşlar.

Laləvü gül damənində hər səhər şəbnəm degül,
Gecələr ruzi siyahimdin tökəllər yaşlar.

Padşahi-mülkü-fəqrük, təxtimizdir püşti-pa,
Taci-dövlət dust yolunda verilmiş başlar.

Qocalıq hirsi kənun fikri-sərü saman elər.
İndi tutmuş başdan bu başə gəlmiş başlar.

Tən qocaldı, Vaiz, işdən düşdülər əqlü həvəs,
Ömr əz bəs tünd keçdi, qaldılar yoldaşlar.

* * *

Gər gəlsə lütfdin gözə ol mahparəmiz,
Müşkil ki, gəlməyə gözə axır sitarəmiz.

Bəs kisələr ki, tikmiş idi cövri-tiğinə,
Bidərdi-bəxyə qoymadı göz açə yarəmiz.

Tapmaz füruğ cövhərimiz, ta vətəndəyük,
Olmaz çırağ çıxmasa taşdin şərarəmiz.

Duyduq ki, bu cəhan nə məqami-qərardur,
Andəm ki, verdilər hərəkət gavharəmiz.

Tufani-fitnədür nə əcəb güzgi suyi tək,
Gər basmasun ayağ arayə kənarəmiz.

İbrət gözündə gör necə bietibardur,
Dünya köçər, düzətməğə getməz nəzarəmiz.

Əz bəs pür abdür gözümüz ol mühitdin,
Bir gətrəyik, və leyk görünməz kənarəmiz.

Vaiz, yaraşmaz bizə cüz dərdməndlik,
Biçarəlikdin özgə nədir daxi çarəmiz.

* * *

Əgər güllər qəmindindür çəməndə bülbül əfğanı,
Kimin eşqindin, aya çakdür güllər giribanı?

Sənin gül tək cəmalın bir nəzər ta pərdəsiz gördi,
Gözüm hər laleyi-sirabə tüşdi, qaynadı qanı.

Gecə seylab tək gər dağə durmaz taş-taş üstə,
Qiyamət qaməti ta neyləsün bu əprimiş canı.
Oniçün sərnigun bəxti-siyahım tək müşəvvəşdir
Ki, ol yüzdin uzaq tüşmüş səri-zülfi-pərişanı.

Həsəddin çaxnaşullar bir-birə dağda qara taşlar,
Yizin əksi ola gəl bir nəfəs ayinə mehmanı.

Sərasər bu niyazi-əczdir ol nazi-istiğna,
Dəgər hüsnün sərapasına eşqin çeşmi-giryanı.

Gəhanda görmədük, Vaiz, bizim Məcnun təki aqil
Ki, əldin vermədi bir ləhzə hərgiz dəşt damanı.

## RÜBAİLƏR

Ey sənəm, qəndil tək vəqf oldu könlüm deyrina,
Od yanar başımda, baxmaq fürsətim yox qeyrina.
Sayıram daği-fəraqətdən vüsal əyyamını,
Bu dügünlər əldə təsbih oldu zikri-xeyruna.

* * *

Əvvəl sözi safi təblərdən süzdür,
Ondan sora əhli-təbi andan qızdır.
Gər həq sözi acı ola, şirin sözə qat,
Hər kuzəyə bir qətrə gilab damızdır.

vV

## SƏFİ

*«Ruzi-Rövşən» və «Qisasül-xaqan» əsərinə istinad edən Salman Mümtaza görə «Səfi» təxəllüsilə şeirlər yazan Səfiqulu bəy Şamlu tayfasından olan Zülfüqar xanın oğludur. O, hicri tarixi ilə 1070-ci ildə (1659-1660) Məşhəd valisi, 1088-ci ildə (1677-1678) Herat bəylərbəyisi təyin edilmişdir.*

*«Təzkireyi-Nəsrabadi» məlumat verir ki, şairin atası Qara xan Şirvanda bəylərbəyi olmuş, sonra Astrabada getmişdir.*

*S.Mümtaz Səfinin 1 qəzəl və 1 müxəmməsini 1925-ci ildə «Maarif və mədəniyyət» jurnalında çap etdirmişdir. Təbrizdə çıxan «Yeni yol» dərgisində (№3,1982) verilən məlumata görə, şairin Tehranın Məlik kitabxanasındakı məcmuədə azərbaycanca 5 qəzəli, farsca 6 qəzəli və qitəsi, Tehran Universiteti kitabxanasındakı məcmuədə farsca şeirləri ilə bərabər azərbaycanca 11 qəzəl, qitə və rübaisi, bundan başqa, Məclisi-Şurayi-İslami kitabxanasındakı məcmuədə farsca şeirləri vardır.*

### Q Ə Z Ə L

Yüz qoyub könlümə qəm ləşkəri hamun-hamun,
Qara baydaqlu ələmlər ucu gülgun-gülgun.

Çağırırdım uca avaz ilə Leyla, Leyla!
Dağ səs verdi cavabımda ki, Məcnun, Məcnun.

Gözlərimdən yenə od parladı duzəx, duzəx,
Cigərimdən yenə qan qaynadı Ceyhun-Ceyhun.

Yığmışam hasili-qəm yanıma xərmən-xərmən,
Yetə bilməz mənim imkanıma qarun-qarun.

Bu nə viranə könüldür Səfi, ey vay, ey vay,
Sərvlər var idi bu dağda mövzun-mövzun.

## MÜXƏMMƏS

Şəbahət birlə bax kəc bu qəm cananıma bir-bir,
Gövhərlər mərdumi-çeşmim düzər müjganıma bir-bir.
Dedim ərz eyləyim əhvalımı sultanıma bir-bir,
Nedim, qəmzən xədəngi sancılıbdır canıma bir-bir,
Salıbdır küfr zülfün rəxnələr imanıma bir-bir.

Rəhi-eşqində, ey bidərdi-can, nəqdin nisar etdim,
Cəhan əsbabidin keçdim, cünunluq ixtiyar etdim.
Dağıtdım çərxi-gərdunin büsatın, tarımar etdim,
Səri kuyində mən bəs nalə çəkdim, ahü var etdim,
Mələklər baş çıxarmış naleyi-əfqanıma bir-bir.

Cünunəm, mənzilim səhra, məqamım dəşti-hamundur,
Du çeşmim həsrətindən lalə tək dəryaceyi-xundur,
Eşitdim, aşiqə cövr eyləmək xublərdə qanundur,
Uşaqlar düşmüş ardımca deyirlər qoyma, Məcnundur,
Atarlar tənə daşın bu təni-üryanıma bir-bir.

Bənə ləlin verir can, çün mükərrər gördüm ecazın,
Alır can dəmbədəm qəmzən tənimdən, açmadım razın,

Dəlir bağrım, tökür qanım sənin ol xəncəri-nazın,
Atır min ox bənə hərdəm kamandar çəp əndazın,
Gözün navükləri huş susuyubdur qanıma bir-bir.

Qara bağrım olur qan arzuyi-ləli-yar etsəm,
Olur xatir pərişan zülfi-muyin tarmar etsəm,
Məni mən etməgil gəl, sevdiyim, əfqani-zar etsəm,
Nola, dilbər, yolunda çün Səfi canım nisar etsəm –
O gün xublar gəlirlər külbeyi-əhzanıma bir-bir.

## MÜSƏDDƏS-TƏRCİBƏND

Ey mahi-cəmalın şərəfi-bürci səadət,
Ey tutiyi-güldəsteyi-bustani-fəsahət,
Almış gülü reyhan güli-ruyində təravət,
Məqbul üzün, ləli-ləbin kani-məlahət,
Gəl yanıma, gəl gecələri canıma rahət,
Hey, hey, bu nə qəddir, bu nə qamət, nə qiyamət!

Peyvəstə qaşın hüsn kitabında səraməd,
Vəlleyl qara zülfü xətindir xəti-əbcəd,
Əfzun sədəfü ləli-ləbin xali-zəbərcəd,
Çəkmiş gözünə qüdrət əli sürmeyi-sərməd,
Gördükcə deyir kafir əgər ali-Məhəmməd,
Hey, hey, bu nə qəddir, bu nə qamət, nə qiyamət!

Ta nəxli-qədin bağİ-cəhan içrə bitibdir,
Gün kimi cəmalın vari dünyanı tutubdur,
Fərhad, başınçün, tişəsin başə çalıbdır.

Məcnun gözü görcək səni yarın unudubdur,
Rəftari-qədin cümlə cəhanı ….. tutubdur,
Hey, hey, bu nə qəddir, bu nə qamət, nə qiyamət!

Sən hurimisən, ya ki mələk, ya ki pərizad,
Ey gözləri qanlı, müjə ox, qəmzəsi cəllad,
Tanrı səni guyamu neçün eylədi icad?
Kim cilvənə təhsin qılalar sərv ilə şümşad,
Ey qəmzəsi qanlar içici, gözləri cəllad,
Hey, hey, bu nə qəddir, bu nə qamət, nə qiyamət!

Göstərdi mənə nükhəti-zülfün tatarı,
Aşüftə qılıbdır məni-bisəbrü qərarı,
Getmiş Səfinin sənsiz elə səbrü qərarı,
Gər qismət ola bir də görəm sevgili yarı
Bu sözü deyib canı qılam yar nisarı,
Hey, hey, bu nə qəddir, bu nə qamət, nə qiyamət!

## BAHARİYYƏ QƏSİDƏSİ

Müjdə, ey meyxarələr, kim getdi dey, gəldi bahar,
Qönçə gəldi gülsitan içrə, yenə biixtiyar.
Açdı nərgis göz yuxudan, baş götürdü nimməst,
Gəl, gəl, açıldı şükufə, tərlədi əbri-bahar.
Laləvü gül atlasından qırmızı don geydi dəşt,
Oldu dibayi-şəqayiqdən mürəssə kuhsar.
Ağladı yarından ayrı bən kimi düşmüş bulud,
Oldu göylərdən gülüstan bir gülər üzlü nigar.
Saldı od gül yağmağından bağ ara badi-səba,

Şöləvərdir hər tərəfdən baş çıxarmış şaxsar.
Ol çiçəklər əksdən kim, açılıbdır rəng-rəng,
Çeşmə olmuş bir bilurin sağəri-gövhər nigar.
Sərvi görgəc laləzar içrə xəyal eylər kişi
Kim, həna yaxmış ayağına yaşıl donlu nigar.
Gül zühurundan həva əzbəs tapıbdır etibar,
Əbri-gövhərbar olur yer üzündən qalxan qübar.
Yox, əcəb kim, yerə qılıc qan ola gül bayrağı,
Əlinə gər gül dərərkən, gülbən içrə batsa xar.
Lalə əksindən ki, sanırsan tutuşmuş şəmdir,
Böylə qarşı asılan fanusa oxşar cuybar.
Hiç bilməm nərgisü gül sayə salmışdır suya,
Ya unudmuş güzgü içrə əksini bir gülüzar.
İtirir heyrətdən özin bağ ara görgan kişi
Kim, görər gül güzgüsündə əksini hər dəm həzar.
Badə içmək fəslidir, yuxuda qalmışlar, durun
Kim, dolu peymanələr şax üzrə düzmüş ruzigar.
Gəl açıl başımdan, ey gərduni-kəmfürsət, açıl,
Bihəyalıq bəs, mənimlə çox düşüşmə zinhar.
Kim dəxi könlüm ara səbrü təhəmmül qalmadı,
Eylərəm yaxamı çak axır əlindən qönçəvar.

* * *

Ağaclar sarmaşıb qəddindən ayrı zar ağlarlar,
Sızıldarlar pərirulər kimi təkrar ağlarlar.

* * *

Gögərçin yolladım, yazdım sənə səndən şikayətlər,
Qolunda ol qanadlardır, başı bağlı kitabətlər.
Unutma aşiqi, namehriban olma, mənim canım,
İşıqsız sərvə oxşarlar vəfasız sərvqamətlər,
Səni-tarı, necə səndən şikayət etməyim axır,
Hanı ol nazlı baxmaqlar, hanı gizlin işarətlər.
Hanı zalım, hanı gözüm, hanı kafər, hanı canım,
Sevişməklər, barışmaqlar, öpüşməklər, qucuşmaqlar.

* * *

Olan həq yadi birlə qayqusuz divanə kəs neylər,
Qılınc əlində mə′ni çağıran ər dadrəs neylər.
Sınıq könlüm nəva tutmazsa, əşkim fövci kəsilməz,
Belə ağır qaralı karvan sövti-cərəs neylər.
Çəkən köksüm şikafindən mənim bidərd könlümni,
Bu qanlı bəhr qarşısında zəngivar səs neylər.
Dəniz murdar olmaz it su içmağından, ey arif,
Həqiqət anlıyan ari könüllərdə həvəs neylər.

* * *

Can qılanda cism tərkin məhrəmi-canan olur,
Quş yuvasından azanda həmdəmi-şeytan olur.

* * *

Həbibim nazdan Leylini ancaq pasiban eylər,
Bənim könlüm quşu Məcnun başında aşiyan eylər.

* * *

Eşq zəncirimi üzdü, yol açın,
Ay uşaqlar, ulular gəldi, qaçın.

* * *

Bəni xar eyləyən gözlər də, yarəb, xarü zar olsun,
Deməm kim, məndən artıq, mən kibi gözlərdə xar olsun.

* * *

Bu nə cilvədir, nə qamət, nə rəviş yerişdürür bu,
Nə rəviş yerişdürür bu, nə gözəl rəvişdürür bu.
Bu nə nazlı sürmədir hay, bu nə qanlı qəmzədir vay,
Bu nə gözdürür, nə kirpik, nə qıya baxışdürür bu.
Ağızını öpmək olmaz, dodağını əmmək olmaz,
Ürəgimni qan elərkən, nə bəla gülüşdürür bu.
Mənə gər yanaşa ol gül, sümügüm köyüb olur kül
Ki, tutuşmuş oddürür o, qurumuş qamışdürür bu.
Bu nə hüsndür, nə afət, bu nə şürü nə qiyamət
Bu nə eşqdir, nə möhnət, nə xətərli işdürür bu.
Ağarıb başımda tüklər, qapısında oldum əbtər,
Demədi o nazlı dilbər ki, bizim Gümüşdürür bu.
Səfinin sözün inanma, sən onun oduna yanma,
Özünü oyaq sanma ki, yaman yatışdürür bu.

* * *

Göy güldü, bulud ağladı, ey şanlı piyalə,

Saldı bəni mey şövqinə bu qanlı piyalə.
Ol dəm ki, dilim tutmadı, saqi, kərəm eylə,
Allahı sevərsən, bənə bir canlı piyalə!

* * *

Demin kim, dərdimi bilməz, bilər vallahi, billahi,
Desə bilməm inanmın, aldadır, vallahi, billahi,
Dedin: hərgiz mənim könlüm səninlə mehriban olmaz,
Deme, zalim, demə kafir, olur, vallahi, billahi.
Qıya baxgəc, təbəssüm nazın etgəc iltifat ilə,
Bəni axır bu zalim öldürür, vallahi, billahi.
Deyin Məcnun gəlibdir şəhrə, evdən çıx, tamaşa qıl,
Uşaqdır nazəninim, aldanır, vallahi, billahi.
Səfini qoyma yalqız, getmə, getmə, getmə, gəl, gəl, gəl,
Yazıqdır, başına dönüm, ölür, vallahi, billahi.

* * *

Dust kuyindən ayaq çəkmək mənə çox ar idi,
İtləri birlə süründi, ta sümügüm var idi.
Var idi bir gün ki, ol bəd, xubanımla var idi,
Gülsə idim mən, gülərdi, ağlasam, ağlar idi.
İçdigim qan, yedigim qəm, rahətim azar idi.

* * *

Üz gizləmə gün tək qara çadır yiyəsi, hay,
Axşam araya girdi, qəribəm, neyləyim vay.

* * *

Yar dodağın əmər qarşıda həlva kibi,
Baxa-baxa ağlaram nərgisi-şəhla kimi.

* * *

Günəş bir şölədir əbləq başımdan,
Fələk bir lalədir qanlı yaşımdan.
Bu dərya göz ki, lölödən gül açqar,
Buludludur, havalanmış yaşımdan.

vV

## MÜRTƏZAQULU SULTAN ŞAMLU

*Herat hakimi Həsən xan Şamlunun oğludur, şikəstə xəttinin yaradıcısı olmuşdur. Şah Süleyman Səfəvi taxta çıxarkən (1666) qorçübaşı, sonralar Qumun hakimi təyin edilmişdir. Tədqiqatçılar onun təxminən h.1105-ci ildə (1693-1694) vəfat etdiyini göstərirlər.*

*Dövrün böyük sənətkarı Saib Təbrizi ilə tanış olmuş, onlar bir-birinin şeirlərinə nəzirələr yazmışlar. Saib «Səfinə»sinə onun da şeirlərini daxil edibdir. Həmin şeirlərdən bəzi beytlərə Nəsrəbadinin təzkirəsində, bir çoxuna isə şairin Astani-Qüdsi-Rəzəvi kitabxanasında (şifri: 4605) saxlanan əlyazma divanında rast gəlirik. Şairin istər türkcə, istərsə də farsca yazdığı şeirlərdə Saibin güclü təsirini görürük.*

*Mürtəzaqulu Sultanın tükrcə şeirlərini ilk dəfə toplayan Salman Mümtaz olmuşdur. Şairin antologiyaya daxil edilən şeirləri də S.Mümtazın AMEA Məhəmməd Füzuli adına Əlazmalar İnstitutunda saxlanan arxivindən götürülüb.*

### QƏZƏLLƏR

Ülüvvi-rütbeyi-şandır cəhanda xaki-rah olmaq,
Kəmali-əhsəni-əxlaqi-xəlqə xeyirxah olmaq.

Əgər əhli-cəhandin simü zər əxzinğə talibsən,

Gərək səngi-məhək tək eybcuvü rusiyah olmaq.

Nə zəh qıldın kəmani-zülmə, ey bədkiş, neydərpey,
Bəli, gücdür nişani-tiri-ahi-sübhgah olmaq.

Büləndiqbal olan üftadə bulğanlargə gahi-əcz,
Əgər püştü pənah olmazsa, yeg pəstü təbah olmaq.
Qumaşi-etibar mənsəbi-dəhr etmiyən yaxşı,
Nə lazım, Mürtəza, mərdudi-dərgahi-İlah olmaq.

* * *

Dilbərimdə dilrübalikdən fərəh olur ziyad,
Padşahlər şah olur qıldıqca təsxiri-bilad.

Gözlərün səflər çəküb gəlmiş könül taracına,
Fərzi-eyn irmiş qıla möminlə kafirlər cihad.

Hüsnünə məftunəm, ər kuyində sakinsəm nola,
Bəs düxuli-rövzeyi-rizvanə hüsni-etiqad.

Gögə yetsə başı ədnazadənin, xeyr umma kim,
Sahibi nan eyləməz xəlqi tənuri-girdbad.

Bir müəmma misrəidir məddi-tuli-ömr kim,
Bu müəmmadən həmin məqsu irür bir yaxşı ad.

Qəlb oxunsa kek, mənası bəğyir eyləməz,
Sanma kim, islah ilə müfsid qılır tərki-fəsad.

Sayəsiz gedəm nigarın astani tövfinə,
Mürtəza, eylə ki, bən ögrəndüm təriqi-ittihad.

* * *

Gəl, ey zalim, fəraq axşamı gör sənsiz bənim nəmdür,
İşim qəm, taqətim kəm, qamətim xəm, gözlərüm yəmdür.

Yoxum-varım, çoxum-azım fəda ol şuxə kim, hərgiz,
Deməz kim var, ya yox, iltifatım  bişü ya kəmdür.

Könül qan olmuşü göz yaşı gəlmiş başdan keçmiş,
Olan olmuş, keçən keçmiş, xoş ol kim, ömr bir dəmdür.

Həkimi-eşqdin tərkibi-hüsn əczasını sordum,
Buyurdu kim, həya ol cüvzlərğə cüzvi-əzəmdür.

Könül qan oldu, tut eşq ilə qan-yaş tökmə, ey göz kim,
Yumazlar qan ilə qanı, bu söz məşhuri-aləmdür.

Dedim əğyar ilə çəkmə əyağ, çəkmə ayaq bəndən,
Məgər kim, əks anlar sözləri hər kim ki, əfhəmdür.

İrür asan kühənsal olana rahi-ədəm qət′i,
Yovuqlatmış yolın hər kimsənin kim, qaməti xəmdür.

Bir az cürmilə derlər Mürtəzanı ol büti-bədxu,
Behişt kuyidin ixrac etmiş, sanmış Adəmdür.

* * *

Biçarə ol ki, bir büti-niku xisali yox,
Sevdayi-xəttü zülf ilə aşüftə hali yox.

Qılmaz füsürdə səbzeyi-təsviri qəhti-ab,
Olmaz zəval hər kişinin kim, kəmali yox.

Könlüm təriqi-eşqdən etmişsə inhiraf,
Məcnun xilafi-şər edər olsa vəbali yox.

Ni külfətim, nə ülfətim əğyarü yar ilə,
Xatirqə bimi-möhnətü rahət xəyali yox.

Kamillərə küdurəti-dövran yetər müdam,
Ay bədrlənməz isə küsuf ehtimali yox.
Əldən buraxma daməni-övladi-Mürtəza,
Bu bir səfinədir ki, xətər ehtimali yox.

* * *

Bu nə rüx, nə səbzeyi-tər, nədir aşikar olupdur,
Nə gözəl bahar olupdur, nə bənəfşəzar olupdur,

Bu nə zülf, bu nə kakül, bu nə dəstə-dəstə sünbül,
Nə dumandır, Allah, Allah ki, gün özü tar olupdur.

Bənim, ey gül üzlü yarım, necə oldu etibarım,

Neyləmiş məhəbbət əhli ki, yanında xar olupdur.

Nə nəsimi-xoşxəbərdir, nə nigari-cilvəgərdir,
Niyə bilmərəm ki, könlüm, niyə biqərar olupdur.

Düşəcək rüxi-nigarə, baxə-baxə, varə-varə,
Bu qara çanaq gözlər nə göhərnisar olupdur.

Mütəvəccih olma qeyrə, gedər isən özgə seyrə,
Təni-zari dağ ilə gör ki, nə laləzar olupdur.

Qəmin ilə aşinadır, bu vəfalı Mürtəzadır,
Eşqində yazığı gör ki, nə xaksar olubdur.

* * *

Qeyri behişt kuyinə ta məhrəm eylədim,
Adəm misal kəndümi naməhrəm eylədim.

Həsrət nəsib, ləzzəti-dərdi-məhəbbətəm,
Ta dağımı vəzifəxore-mərhəm eylədim.

Möhnət qərin könülləri gördükcə şikvənak,
Əhvalimi bəyan edübən xürrəm eylədim.

Mövquf qürbü böd degül el təranəsi,
Həm rami-əhli-aləmidim, həm rəm eylədim.

Hurilərin həbibimə təziminini görüb,

Təhqiqi-imtiyazi-bəni-adəm eylədim.

Bir nəqdi sikkədari-xəridar görmədim,
Ta könlümi dükani-mətai-qəm eylədim.

Təsir qılmadı bunca kim, Mürtəza, sana,
Tə′n eylədim, kinayə dedim, mülzəm eylədim.

* * *

Ey zülmi çox, mürüvvəti əksük, vəfasi yox,
Müştaqəm ol qədər sana kim, intəhasi yox.

Sənsən murad aşiqəvü səndən özgə heç,
Məqsudi yox, təvəqqei yox, müddəasi yox.

Billah, ey nigari-xəyali, könül evin,
Qami müşərrəf ilə ki, sənsiz səfasi yox.

Rövşəndir işbu yox əcəb ər kurdur desəm,
Hər gözdə kim, qubari-rəhin tutiyasi yox.

Səndən əcəbdürür nə təvəhhüm, nə ehtiyat,
Öldür, sağınma aşiqi kim, xunbəhasi yox.

Kuyində Mürtəzayə, həbibim, tərəhhüm et,
Biçarənin bu qapuda bir aşinasi yox.

**TƏKBEYTLƏR**

Əgər əhli-cəhandin simü zər əxziğə talibsən,
Gərək səngi-məhək tək eybcuvü rusiyah olmaq.

* * *

Kamillərə küdurəti-dövran yetər müdam,
Ay bədrlənməz isə, küsuf ehtimali yox.

* * *

Eylə kim, əfsari-məşru ilə qəsr olur nəmaz,
Qıldı kutəhömr əhli-fəzli təhsili-məaş.

* * *

Söyləməm ki, sən Səməndər ol və ya pərvanə ol,
Yanmağın gər fikrinə düşdün, o an mərdanə ol.*

---

* *Сонунъу тякбейт фарсъадан тяръцмя едилмишдир.*

## TƏSİR

XVII əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən Mirzə Möhsün Təsir Təbrizi (1655-1719) Şah Süleyman və Sultan Hüseyn Səfəvi dövrünün məşhur şəxsiyyətlərindən və dövlət adamlarından olmuşdur. Ulu babası I Şah Abbasın əmri ilə Təbrizdən İsfahana köçürülmüşdür.

Təsir dövlət vəzifələrində, xüsusən maliyyə işlərində uzun müddət dürüstlüklə çalışmış, Yəzd şəhəri vəzirliyinə təyin edilmişdir. Sonra istefaya çıxaraq ömrünün son 9 ilində güşənişin həyat sürübdür.

Təsirin qəsidə, qəzəl və qitələrindən ibarət farsca divanından başqa 7 məsnəvisi vardır. Professor Turxan Gəncəyi 1949-cü ildə «Türk dili və ədəbiyyatı» dərgisində çap etdirdiyi məqaləsində şairin ana dilində 447 beyt həcmində şeirlərinin olduğunu göstərmişdir.

vV

Hey-hey, bu gün daxi nə izarü nə gunədür,
Rəngün nədən şikəstəvü xurşid gunədür.

Guya əsirsən bir özün tək sitəmgərə,
Rəngin şikəsə olmağı ondan nümunədür.

İstərsən elə sən onu, ya istər ol daxi,
Gəl doğrusunu söylə, görüm kim nə gunədür.

Yaşlı gözün, qəmgin üzin, aşüftə sözlərün,
Aşiqlərin təriqəsi mayil cünunədür.

Məşuqidün daxi sana nisbət degüldi eşq,
Axır deməzlər ol nə idi, imdi bu nədür.

Mən′ etmə, şükr elə ki, yar oldu qədrdan,
Təsir, sən həmişə işin vajgunədür.

* * *

Rüxsarun olan yerdə daxi gül nə üçündür,
Baş vurdu xətün səbzəvü sünbül nə üçündür.

Ol hüsni-xudadadə degül zinətə möhtac,
…… cəmalilə təcəmmül nə üçündür.

Dedüm ki, səni öldürərəm tiği-sitəmdən,
Ey şuxi-cəfapişə, təəmmül nə üçündür.

Cürmü günəhimdən ki, səni istəməgümdür,
Iğmaz elədün nazü təğaful nə üçündür.

Bir həlqeyi-zülfilə cəhan oldu əsirün,
Başqa daxi bin həlqeyi-kakül nə üçündür.

Yumdun gözüni gizlin iraxdan bəni görgəc,
Üşşaqı görən yerdə təcahül nə üçündür.

Ol ləli-ləb ilə ki, sana qismət olubdur,
Artuqi dəxi noqlü guvü mül nə üçündür.

Qış getdi, bahar oldıvü başdan aşdı gül,
Məlum degül naleyi-bülbül nə üçündür.

Allah ilə düz gəlsə əgər mənzilətü qürb,
Hər nakəsə, Təsir, təvəssül nə üçündür.

* * *

Məh gizlədi üz çöhreyi-xəndanını görgəc,
Ceyran sevişib nərgisi-fəttanını görgəc.

Şümşad ki, mövzun eləmiş misreyi-qamət,
Qaldı quru ol sərvi-xuramanını görgəc.

Çak etdi kətan köynəgüni sübhi-qiyamət,
Ey mah, fələk çaki-giribanını görgəc.

Gər filməsəl ayinə ola səddi-Skəndər,
Gözi bulaşur çöhreyi-tabanını görgəc.

İlan kimi zinharə gəlüb. dil çıxarubdur,
Peykanidən ox navəki-müjganını görgəc.

Hərçənd vurubdur üzinə mahi-firuzan,
Bağrı qısılır mehri-firuzanını görgəc.

Yaquti-firəng ah ilə dikləndi çırağı,
Bin həsrət ilə ləli-Bədəxşanını görgəc.

Sünbül ki, çıxarub xəti-mənşuri-gülüstan,
Batil sanıyor zülfi-pərişanını görgəc.

Sandı ki, gülüstanda uçan xeyli pəridür,
Təsir səvadi-xətti-reyhanını görgəc.

* * *

Bənim tək heç kimin əhvalı dərhəm olmasun, yarəb.
Qəribü bikəsü biyarü həmdəm olmasun, yarəb.

Vətən xüldindən irağ ayru düşmüş hurü rizvandan,
Gər adəm nəslidür, möhtaci-adəm olmasun, yarəb.

Qəfəs ilə qənaət eyləmiş quş bağü gülşəndən.
….. içdügi qan, bildügi qəm olmasun, yarəb.

Olub qan zar könlüm qətrə-qətrə damdı gözlərdən,
Bu aləm kimsədə əşki-dəmadəm olmasun, yarəb.

Dolu minayi-mey tək olmuşam əhbab əlindən rəd,
Qərini-ahü əfğan çeşmi-pürnəm olmasun, yarəb.

Əzəldən beyət etmiş lalə tək dərdimlə dərmanım,
Cigər dağına könlün qanı mərhəm olmasun, yarəb.

Məgər təğyir ola, Təsir, həqdən bəxtü iqbalün,
Xəti-nəqşi-cəbinün xətti-xatəm olmasun, yarəb

* * *

Dağıtdu əqlimi bir nazlu dillər, şəm tək qanlu,
Yigit atlu sipahi, gün qılıclu, bədr qalxaqlu.

Nə illər ay kibi təsxiri-canlarçün siyah etdün,
Xətün ənbərli, xalün sə′dlü, qaşın qaramanlu.

Olurdu bir öpüşlə xoşnişin üşşaqlar nəqşi,
Əgər bir azcuq ləli-ləbün olsaydı meydanlu.

Bəni yar ilə görgəc qaçdılar namərd nasehlər,
Tirini cansız eylər gər müqabil olsa bir canlu.

Təəccüb yox əgər canan ilən nisbət dürüst etsəm
Ki, etdi könlümü ol atəşin ariz dağıstanlu.

Bəsi qanlar töküb ləlün ki, gözlərdən nihan olmuş,
Bəli, məmuldur, xunxahdan üz gizlədür qanlu.
Əcəb kafir müsəlləs müddəi Təsirə tuş gəlmiş,
Əbu Bəkr üzlü, imansız Ömər quyruqlu, Osmanlu.

* * *

Nə başumı tanuram, nə ayağ meydən irağ,
Baş ol zaman dutaram bən ki, saqi dutdu ayağ.

Nə ….. ki, qazar çərxi-pir hilali ilə,
Təəddi əhlinə ey kaş olmasun dırnağ.

Günüm nə gündürü gecəm nə decəyə bənzər,
Bu cürm ilə ki, təmiz etmişəm qaradan ağ.

Səhər xüram ilə gülzara gir ki, qönçeyi-gül,
Yetirsə əksi-meyi-ləlün ilə tazə dimağ.

Məgər ki, bağ əzəldən əsiri-hüsnündür
Ki, bəndilər kibi cədvəl qoyub ayağına bağ.

Hədisi-vəsfi-izarün eşitmək istər kim,
Bahar laləvü güldən səbayə verdi qulağ.

Gərək fələk kibi sərgəşteyi-məhəbbətü mehr
Ki, dağ tək ola gök hər yeri ki, olmasa dağ.

Müqəyyədi-süxən asudəlik güni görməz,
Xamuş olanda deyərlər ki, dikləndi çirağ.

Fələkdə gəl ola məğrur baş sana gətürür,
İtürdi özini Təsir, səndən etdi sorağ.

* * *

Hüsnündən ol pəri, bəni dün eylədi xəbər,
Dedüm ki, söylə hansısı ondan vecə yarar.

Əvvəl dedi belüm, dedüm ondan nə bağlıdür,
Ağzum dedi, dedim ki, söz ondan dəxi keçər.

Dedi ki, söylə sünbüli-zülfüm nə eybi var,
Dedim ki, kim bilürmi pərişanı mötəbər.

Sonra nigahi-nərgisi-şəhlasıdan dedi,
Dedim ki, ol sitəmgəri-bədməstdən həzər.

Pəs heyrət üzrə söylədi ha sərvi-qamətin,
Dedim nə sud, sərvdə yoxdur gülü səmər.

Yerdən bükatla çıxdı və acıqlı söylədi,
Təsir, vermədi sənə insaf həq məgər,

* * *

Bitirdim hacətim, gördüm, götürdüm əl dualərdən,
Gözəl məqsud imiş bimiddəalıq müddəalərdən.

Sana möhtac olanlardan nə hacət istiyəm hacət,
Gəda hərgiz təvəqqe eyləməz mətləb gədalərdən.

Əgər həqq yarı ilə aşinasən, umma yarluq,
Təvəkkül damənin əldən çıxaran naxudalərdən.

Cəhanı görməsən yegrək ki, bir məmnun edən görsən,
Nəzər nurindən əl çək, çəkmə minnət tutiyalərdən.

Sana sanmazsan olsun müttəfiq güzgüdə timsalın,
Əgər mən gördügüm görsəm vəfasız aşinalərdən.

Bəla məhbublər daminə düşmüş natəvan seydəm,
Bəni qurtama, yarəb, zövqlən düşmüş bəlalərdən.

İşim əldən çıxıbdur, ta çıxıbdur damənün əldən,
Təəssüf sudi olmaz, olma qafil binəvalərdən.

Nigarun kakilü zülfi xətin müşki-Xəta söylər,
İlahi, dutma Təsiri bu baş vurmuş xətalərdən.

* * *

Gül qönçəsi tək qanlı gözüm yaşa gəlibdür,
Ya cövrün əlindən ürəgim başa gəlibdür.

Ta etsə əsər könlümə hər dəm çəkərəm ah,
Bin qatla onun başı əgər daşa gəlibdür.

Acıxlı üzi, baxışı əgri, sözi acı,
Guya ki, nigarım genə pərxaşa gəlibdür.

Bidərdi-məhəbbət nə bilirsən nə cəfalar,
Dövran sitəmindən məni-qəllaşə gəlibdür.

Təsir, rəva görməz idün möhnəti-hicran,
Gər ömri bileydün yenə yüz yaşa gəlibdür.

* * *

Mənə binəva deyəllər,

Sitəm aşina deyəllər,
Qəmə mübtəla deyəllər,
Sana bivəfa deyəllər.

Bütə gər vəfa girandur,
Bu qədər sitəm ziyandur,
Eləmə ki, çox yamandur,
Sana bivəfa deyəllər.

Daxi qalmadı qərarım,
Çıxıb əldən ixtiyarım,
Qara etmə ruzigarım,
Sana bivəfa deyəllər.

Nə gül istərəm, nə susən,
Nə nişati-bağü gülşən,
Bana şadi oldu düşmən,
Sana bivəfa deyəllər.

Bəni eşqdən sovutma,
Gözi yaş ikən qurutma,
Qulunam, bəni unutma,
Sana bivəfa deyəllər.

Sana məh verüb səbahət,
Güli-qamətün qiyamət,
Sitəm etmə binəhayət,
Sana bivəfa deyəllər.

Daxi işimə girişmə,
Ürəgimlə çox ərişmə,
Quş sərçəyə kəmişmə,
Sana bivəfa deyəllər.

Səni həq yaratdı məhvəş,
Yüzün ay, lə′lün atəş,
Bana vermə çox kəşakəş,
Sana bivəfa deyəllər.

Sitəmin müdam oldı,
Dirilik həram oldı,
Ürəgim təmam oldı,
Sana bivəfa deyəllər.

* * *

Ayı görməli deyəllər,
Büti sevməli deyəllər,
Beli incəli deyəllər,
Ləbi qönçəli deyəllər,
Sana gəncəli deyəllər.

Sənəmim, bütün, nigarım,
Qara gözlü gül′üzarım,
Gözəl üzlü növbaharım,
Daxi qalmadı qərarım,
Sana gəncəli deyəllər.

Bu nə hüsni-binişandur,
Bu nə lə′li-cansitandur,
Bu nə öpməli dəhandur,
Öpüşün qəzayi-candur,
Sana gəncəli deyəllər.

Nigəhün təmam əfsun,
Baxışun vurar şəbixun,
Sana mehrü mah məftun,
Üzün ayü çöhrə gülgün,
Sana gəncəli deyəllər.

Nə qədər qılım xəyalın,
Nola gər görüm cəmalın,
Rüxün üzrə xəttü xalın,
Bana tuş gələ xəyalın,
Sana gəncəli deyəllər.
Qul olum o yaxşı qaşə,
O dodağilən suvaşə,
Bəni vurma dağə-daşə,
Ki, məhin quyaşdən aşə,
Sana gəncəli deyəllər.

Çəkəsən əgər niqabı,
Quyaş olmaz aftabı,
Fələk eylədi hesabı,
Səni bütlər intixabı,
Sana gəncəli deyəllər.

Nola gər durax ayağə,
Gedəlim səninlə bağə,
Səni bir çəkim qucağə,
Qoyalım dodaq-dodağə,
Sana gəncəli deyəllər.

Bəni ancaq etmə rüsva,
Gecələr gəl, ey dilara,
Dəxi eyləmə məhaba,
Elə dərdimi müdava,
Sana gəncəli deyəllər.

Sana məhv olur məlahət,
Sana can verür lətafət,
Sana yaraşur nəzakət,
Qədi-dilkəşün qiyamət,
Sana gəncəli deyəllər.

* * *

Yüz gizləmə, ey mahi-fələk, şah sevərsən.
Rəhm eyə əgər bəndeyi-dərgahı sevərsən,
Saxla bəni gər aşiqi cangahı sevərsən,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Ta səndən irağam, bozulubdur xurü xabım,
Birdür dili-pürxunum ilə cami-şərabım,
Hicranına Allah da bilür qalmadı tabım,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Ey qaşları dilkəş, gözi cadu, qədi rəna,
Səndən nə əcəb gər eliyəm rəhm təmənna,
Taqət nə qədərlər gətürür aşiqi-şeyda,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Saqi, səhər oldu, sana gül verdi piyalə,
Təhbəndligi dağ ilə gər eylədi lalə,
Bir sağər ilən nola gətürsən bəni halə,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Ey şuxi-cəfapişə, zəliləm sitəmindən,
Divanə olub dağlara düşmüş ələmindən,
Rəhm eylə ki, əldən çıxaram dərdü qəmindən,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Müşkin kibi mövcud degül bir qədi mövzun,
Gül qonçası tək lə′li-tənin arizi-gülgun,
Ey Leyliyi-aləm, çün edibsən bəni Məcnun,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

Hey, hey, nə gözəldir qədin, ey sərvi-xuraman.
Zülfün şəbi-məhşər kibi, yüzün məhi-taban,
Gözlər işığı nükhət ilə Yusifi-Kənan,
Sərvəqtimə gəl bir dəxi, Allahı sevərsən.

* * *

Ah, ey məhvəş, qəmindən ta olım, nalan olım,
Başuna çevrilməmiş eşqində sərgərdan olım,

Müttəsil qan ağlayım, şəmi-şəbi-hicran olım,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

Ta gedübsən, məhvəşim, səbrü qərarım qalmadı,
Gülşənim rəngi-xəzan dutdu, baharım qalmadı,
İntizarım həddən aşdı, ixtiyarım qalmadı,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

Ta qucağımdan irağ düşdin, təni-bican bənəm,
Ayru xəndan ləbləründən şəbnəmi-giryan bənəm,
Həm dəmim ahü fəğandur, atəşi-suzan bənəm,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

Ey yüzin gül, kakülün sünbül, qədün sərvi-rəvan,
Həddən artuq düşmisən bütlər ara namehriban,
Vəqtdir rəhm edəsən hicran əlindən əlaman,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

Ta dodağın ikisindən, məhvəşim, minnətkeşəm,
Əl çəküb cami-şərabi-nabdən xiclətkeşəm,
Zə′f əlindən xameyi-mu oldumü möhnətkeşəm,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

Yad ol əyyamlar, ol yaxşı-yaxşı çağlar,
Dəmbədəm öpməklərü möhkəm səni sıxmaqlar,
Bir-birə biz mehriban, həsrət çəkən oymaqlar,
Olma halimdən xəbərsiz, mən sana qurban olım.

* * *

Bütüm, sənənim, şikəstəpərəm,
Xəbər eylədüm ki, bixəbərəm,
Vəfa sifatam, cəfa çəkərəm,
Səni sevərəm, səni sevərəm.

Nə gül sevərəm, nə sərvi-çəmən,
Nə ənbəri-tər, nə mişki-Xütən,
Nə sübhi-səfər, nə şami-vətən,
Səni sevərəm, səni  sevərəm.

Cəhanı görim, sipəhrə baxım,
Səni çü görim, məhi buraxım,
Fələk pozulur çü əşkim, ahım,
Səni sevərəm, səni sevərəm.

Bahari-ruhun qərini-səfa,
Kəşidə qədün nihali-rəsa,
Girişmələrün nəvidi-vəfa,
Səni sevərəm, səni sevərəm.

Çıxar qəmindən könül nəfəsi,
Yetər boş ola quşun qəfəsi,
Gərək ki, sinə gülün həvəsi,
Səni sevərəm, səni sevərəm.

vV

## AŞIQ ABBAS TUFARQANLI

*XVII əsrin məşhur ustad aşıqlarındandır. Cənubi Azərbaycanın Tufarqan qəsəbəsində dünyaya gəlib. Həyatı haqqında məlumata əsərlərində, şerləri əsasında yaradılmış «Abbas və Gülgəz» dastanında rast gəlirik. İncə lirik şeirlər yazmaqla bərabər, əsərlərində zəmanəsindəki zülm və ədalətsizliyi kəskin tənqid edib. Yaradıcılığında Azərbaycan təbiətinin gözəlliklərinin tərənnümü mühüm yer tutur.*

### GƏRAYLILAR

Duman, gəl get bu dağlardan,
Bahar gəldi, qar əylənməz.
Bu dünya bir bivəfadı,
Gözəldə ilqar əylənməz.

Gözəlin qaşı qaradı,
Bayqunun meyli haradı?
Bu dünya karvansaradı,
Hər gələn qonar, əylənməz.

Abbas deyər hac olanda,

Kəbəyə merac olanda,
Doğru yoldan kəc olanda,
Namus gedər, ar əylənməz.

* * *

Gecə-gündüz qan ağlaram,
Göz yaşım ümmana getdi.
Şirin canım yar yolunda
Olmağa qurbana getdi.
Doymadım yarın dilindən,
Qucmadım incə belindən,
Aldılar yarı əlimdən,
Qarğana-qarğana getdi.

Hər nə oldu mənə oldu,
Qaynadı peymanəm doldu,
Desələr, Abbas necoldu?
Deyin, Tufarqana getdi.

* * *

Yenə gəlib bahar fəsli,
Süsən, sünbül, Məzə dağı,
Açılıb güllər, nərgizlər,
Bənəfşələr bəzə dağı.

Siyah zülfləri hörünsün,
Dal gərdəninə bürünsün,

Alçaq olsun yar görünsün,
Bir görünsün gözə dağı.

Bülbüllər uçdu gülümdən,
Oldum ulusu elimdən,
Abbas qara qul əlindən,
Qan ağlayıb gəzə, dağı.

* * *

Gecə-gündüz fəğandayam,
Mənəm eşqin natavanı.
Tarladaram mahalları,
Boş qoyaram bu meydanı.

Bilmirsənmi haralıyam?
Ağlı, göylü, qaralıyam.
Yüz yerimdən yaralıyam,
Sinəmdə zənbur nişanı.

Hökmünlə yazdım fərmanı,
Kim eylər ərdə dərmanı,
Pəriyəm, şahın qurbanı,
Abbassız istəməm canı.

* * *

Xəbər aldım təbrizlidən,
Məni hərcayı çağladı,

Viran bağlar xəzəl oldu,
Didələrim qan ağladı.

Bülbüləm, bağa qonaram,
Zərgərəm, gümüş yonaram,
Elə bu dərdə yanaram,
Xoryat söz məni dağladı.

Abbasam, yoxdu məkanım,
Sənə qurban şirin canım,
Ölkəmizdə Pəri xanım,
Sidqimi mövla bağladı.

* * *

Nə ağlarsan, nə sızlarsan,
Bir dərdi beş olan könlüm!
Axırda zünnar bağlarsan,
Qəmə yoldaş olan könlüm!

Bir yar gəlir obasından,
Alım dərdü-bəlasından,
Çərxi-fələk badasından
İçib sərxoş olan könlüm!

Abbas ağlar arsız-arsız,
Dünya olub etibarsız,
Deyirdin, dözərəm yarsız,
Döz, bağrı daş olan könlüm!

* * *

Oğrun yollara baxmaqdan,
Bağrım qan oldu, yar gəlmir.
Ağlamaqdan eynim yaşı,
Sel ümman oldu, yar gəlmir.

Mənim yarım boyu bəstə,
Dərdindən olmuşam xəstə,
Yəqin çıxıbdı taxt üstə,
Yoxsa xan oldu yar, gəlmir.

Dağların qarı söküldü,
Axdı, çaylara töküldü,
Abbas deyər, bel büküldü,
Qədd kaman oldu, yar gəlmir.

## QOŞMALAR

Qadir mövlam, budur səndən diləyim,
Görüm yarın ömrü yetsin yüz ilə.
Artıq ola malı, mülkü, dövləti,
Altmış nəri bir qatara düzülə.

Sədəf incə, dodaq incə, dil incə,
Canım çıxdı yar könlünü alınca.
Ölüm yeydi bu dünyada qalınca
Bir iyid ki, qatarından üzülə.

Qaşlarına çəkilibdi, bil, qələm,
Ağız davat, göz mürəkkəb, dil qələm,
Yalan desəm çək gözümə mil, qələm,
Sənəd verrəm, qulun ollam yüz ilə.

Abbas deyər: dildəki hərf neçədir;
Neçə göhər, neçə ləlü neçə dür,
Sanamadım zülfün muyu neçədir,
Qorxuram ki, şanə dəyə, üzülə.

* * *

Özündən kiçiyi işə buyurma,
Sözün yerə düşər, heç miqdar olmaz.
Hər nə ki, kar görsən, əz əlinlə gör,
İnsan öz işində cəfakar olmaz.

Özündən böyüyün saxla yolunu,
Düşən yerdə soruş ərzi-halını,
Amanat, amanat qonşu malını,
Qonşu yox istəyən özü var olmaz.

Soruşun, qul Abbas, halın necədi?
Gündüzlərin ay qaranlıq gecədi,
Sərv ağacı hər ağacdan ucadı,
Əsli qıtdı, budağında bar olmaz.

* * *

Ay həzarat, bir zamana gəlibdi,
Ala qarğa şux tərlanı bəyənməz.
Oğullar atanı, qızlar ananı,
Gəlinlər də qaynananı bəyənməz.

Adam var ki, getməyəsən işinə,
Adam var ki, dolanasan başına,
Adam var ki, ayran tapmaz aşına,
Dindirərsən, yağlı nanı bəyənməz.

Adam var, dağları gəzir sərsəri,
Adam var, geyinər pustinən dəri,
Adam var, mərfətdən yoxdu xəbəri,
Adam var, soltanı, xanı bəyənməz.

Adam var, dolanar səhranı, düzü,
Adam var, döşürər gülü, nərgizi,
Adam var, geyməyə tapammaz bezi,
Adam var, al geyər, şalı bəyənməz.

Adam var, çox işlər eylər irada,
Adam var ki, yetə bilməz murada,
Adam var ki, çörək tapmaz dünyada,
Adam var ki, yağ yeyər, balı bəyənməz.

Adam var ki, adamların naxşıdı,
Adam var ki, anlamazdı, naşıdı,
Adam var ki, heyvan ondan yaxşıdı,

Dindirərsən, heç insanı bəyənməz.

Adam var, dəstinə verəsən güllər,
Adam var, gözünə çəkəsən millər,
Tufarqanlı Abbas, başına küllər,
Nə günə qalmısan, qarı bəyənməz.

* * *

Ağlaya-ağlaya düşdüm yollara,
Yar ayrısı dərdü möhnət, yara yüz.
Dərdim oldu əvvəlkindən beşbetər,
Şan-şan oldu qara bağrım, yara yüz.

Tutdum yar əlindən bəlkə sağalam,
Saqi məstü, saqi sərxoş, saqi lam,
Çətin, çətin bu yaradan sağalam,
Dərd bir oldu, dərman doxsan, yara yüz.

Mən Abbasam, yara qurban yar üçün,
Doğra bağrım, kəs ciyərim, yar üçün,
Yar oldur ki, bu dünyada yar üçün,
Yaxa yırta, zülf dağıda, yara yüz.

* * *

Başına döndüyüm alagöz Pəri,
Gahdan ağla, gahdan yada sal məni.
Qara bağrım şan-şan oldu, dəlindi,
Gahdan ağla, gahdan yada sal məni.

Bağban idim, bağım təğayir oldu,
Gözüm gördü, ağlım təğayir oldu.
Xoryat əli dəydi, təğayir oldu,
Gahdan ağla, gahdan yada sal məni.

Mən sənə can dedim, sən də mənə can,
Alış eşq oduna, mənim kimi yan,
Adım Aşıq Abbas, yerim Tufarqan,
Gahdan ağla, gahdan yada sal məni.

* * *

Ay camaat, gəlin tərif eyləyim,
Nə əcəb düşübdü yeri Dərbəndin.
İskəndər əlilə olub bərqərar,
Çəkilibdi bürcü, barı Dərbəndin.

Mən gəlmişəm bu Dərbənddə qalmağa,
Tir tülək tərlanı ələ salmağa,
Düşmən öldürməyə, qisas almağa,
Qonaq olur igidləri Dərbəndin.

Dərbənd dedikləri bağçadı, bağdı,
Alt yanı dəryadı, üst yanı dağdı,
Abbas deyər: əcəb meyvəsi çağdı,
Xəstəyə şəfadı narı Dərbəndin.

* * *

Şikəstə könlümün məqsudu usta,
Bu Təbrizin sonaları necədi?
Tikilibdi çarşıları yanaşı,
Sarayları, binaları necədi?

Ərənlər üstümdə oldu nümayan,
Bir camal göstərdi, bəyan və bəyan,
Bir səf mələk gördüm, bir səf də qılman,
Dal gərdəndə siyahları necədi?

Müştaq oldum bir Pərinin tağına,
Canım qurban olsun xoş yanağına,
Mən Abbasam, girsəm xublar bağına,
Eyvan, otaq, xanaları necədi?

* * *

Gedər ikən bir ümmana tuş oldum,
Bəhrlər çalxanır, göl bu yandadı.
Boy gedər bir yana, buxaq min yana,
Cığa pərvaz eylər, tel bu yandadı.

Gülgəz dəli olub, yoxsa divana?
Üz çevirib gedir çöl-biyabana,
Burdan bir yol gedir ol Tufarqana,
Tamam qohum-qardaş, el bu yandadı.

Hökmün Malik Əjdər, ismindi Ədhəm,

Didələrim qan yaş tökər dəmadəm,
Lütf eylə Abbasa, qibleyi-aləm,
Qadasın aldığım, yol bu yandadı.

* * *

Başına döndüyüm alagöz Pərim,
Apardın ağlımı, ay bu yanda dur!
Ağıl başda deyil, ruh da bədəndə
Eylədin tarimar, ay bu yanda dur!

Halaldandır mayam, bulunmaz haram,
Qırxlar məclisində bil mən də varam,
Seyraqub adamla heç olmaz aram,
Şeytandı, felindən ay bu yanda dur!

Abbasam, dövranım ay belə keçdi,
Dolandı ruzigar, ay belə keçdi,
Sallandı bir Pərim, ay belə keçdi,
Ol səbəbdən dedim, ay bu yanda dur!

vV

## SARI AŞIQ

*XVII əsrdə yaşamış ustad aşıqlarımızdandır. Daha çox yüksək poetik formada yazılmış cinas qafiyəli bayatılar ilə məşhurdu.*

*XIX əsrin təzkirəçisi Qarabağinin mülahizəsinə görə şair əslən Qarabağ mahalından olub, Qarabağın Zəngəzur mahalında, Həkəri*

*çayının sahilində – Güləbürd kəndində yaşamışdır.*

*Ən məşhur ustad aşıqlardan biri kimi, Sarı Aşıq haqqında da dastan vardır.*

**QOŞMALAR**

Şikar edib tutdum bir şahi tərlan,
Sən etdin ağlımı zail, a Yaxşı!
Səni sevən keçər canü-sərindən,
Olar camalına mail, a Yaxşı!

Məhəbbəti olan istər sazını,
Mən çəkərəm hər dəm sənin nazını,
Şəmsü-Qəmər kimi görgəz üzünü,
Gün təki aləmə yayıl, a Yaxşı!

Qaşların bir oxdu, kipriyin almaz,
Haramdan oxlasan, oram sağalmaz,
Gedər bu gözəllik, sənə də qalmaz,
Əgərçi sərxoşsan, ayıl, a Yaxşı!

Məni sənə aşiq etdi yaradan,
Seyraqubu haqq götürsün aradan.
İstəyirsən xəbər tutgil Saradan,
Yollarında mənəm sail, a Yaxşı!

* * *

Bir namə yazmışdı gözəllər şahı,
Gəldi məni-mübtəlaya yetişdi.

Guşeyi-külahım fəxri-namədən,
Çərxə dəyib, Məsihaya yetişdi.

Şahbazi-aləmdən istərəm səni,
Xudanı sevərsən, unutma məni,
Guya ki, Yusifin gül pirəhəni,
Gəldi Yəqub binəvaya yetişdi.

Sən qərib aşiqin qibləgahısan,
Məlamət mülkünün padişahısan.
Aşiqi-sadiqin sən pənahısan,
Səadətin sürəyyaya yetişdi.

* * *

Gəldi qasid, dedi mən biqərara,
Şuxi-dilrübanın iztirabı var.
Şöleyi-ah Sürəyyadan keçibdi,
Gündüz nə arami, nə şəb xabı var.

Bu xəbər ki, yetdi mən dili-zara,
Xalqdan mən özümü çəkdim kənara,
Ağlayıb yalvardım pərvərdigara,
Dərdimin nə həddi, nə hesabı var.

Nə xoş çəkib səni nəqqaşi-əzəl,
Qəza şövkətinə vermisən xələl,
Gözəllikdə sənsən şəxsi-bibədəl,
Hərçəndi fələkin afitabı var.

Xəm qılıb qamətin fələk aşikar.
Ruyəti camalın çəkər intizar.
Dolanır başına hər leylü nahar.
Əlində təsəddüq mahi-tabı var.

## BAYATILAR

Mən Aşıq, yara bağlar,
Yar meylin yara bağlar.
Yaramı yar bağlasın,
Yar yaxşı yara bağlar.

Bu bulut yağın eylər,
Şam yanar, yağın eylər.
Bir çıraq haqdan yansa,
O çıraq yağı neylər?

Mən Aşığam, gündə mən,
Kölgədə sən, gündə mən.
Qurban ildə bir olar,
Sənə qurban gündə mən.

Aşıq bir buğda gördü,
Buğdanı dağda gördü.
Gözəli Çanaqlıda,
İgidi Tuğda gördü.

Mən Aşıq, ağzındayam,

Aləmin ağzındayam.
Əslim Qarabağlıdır.
Məzməzək ağzındayam.

Mən Aşıq, ay qır ağı,
Heç olmaz ay qırağı.
Açıldı bulud zülfün,
Göründü ay qırağı.
Aşıq naşı əlindən,
Ağlar naşı əlindən.
Yastıq şikayər eylər
Gözüm yaşı əlindən.

Mən Aşıq qaşı-qaşı,
Bişirər qaşıq aşı.
Aşığı yoldan eylər,
Yaxşının qaşı qaşı,

Aşığam, Yaxşı qala,
Ocağı yaxşı qala.
İstərəm bu dünyada,
Pis ölə, yaxşı qala.

Mən Aşıq Mirov səndən,
Heç getməz qırov səndən.
Yüz il ovçuluq etdim,
Vurmadım bir ov səndən.

Aşıq min ayə gələ,

Qurban Minayə gələ.
Sənsiz qərarım gəlməz,
Göydən min ayə gələ.

Mən Aşığam, lələ mən,
Qəflətdəyəm hələ mən.
Dərddən, qəmdən, hicrandan
Bağlamışam şələ mən.

Mən aşıq, zarı canım
Saralıb sarı canım.
Səndən ayrı duşəli
Qalmayıb yarı canım.
Şirvanda Qəbələ var,
Şəki var, Qəbələ var.
Hicran düşkünü Aşıq,
Əlində qəbalə var.

Aşıq ilahi neynər,
Gərdən sürahi neynər.
Sən orda dur, mən burda,
Görək ilahi neynər.

Mən Aşıq, qara baxtım,
Ağ baxtım, qara baxtım.
Sinən yadıma düşdü,
Dağlarda qara baxdım.

Mən Aşıq, göz izi var,

Kababda göz izi var.
Sənə yadlar baxıbdır,
Üzündə göz izi var.

Mən Aşığam, sarı gül,
Yarı qönçə, yarı gül.
Tez açıldın, tez soldun,
Açmayaydın barı, gül.

Mən Aşıq, öz günümə,
Kababı köz günümə.
Fələk əlimə düşsə,
Salaram öz günümə.

Mən aşıq, o gün eylər,
O quzey, o güneylər.
Yar yara qovuşanda
Bayramın o gün eylər.
Mən Aşığam, əsən gəl,
Qara bağrım kəsən gəl.
Aləm Kəbəyə getsə,
Mənim qibləmə sən gəl.

Mən Aşıq, oda salmas,
O Xoydu, o da Salmas.
Heç pərvanə mənimtək
Özünü oda salmaz.

Aşıq başına bağlar,

Zülfün başına bağlar.
Bülbül öldü, gül soldu,
Qaldı başına bağlar.

Aşığa köhnə dağı,
Gəzirəm köhnə dağı.
Təzədən bir dağ çəkdin,
Unutdum köhnə dağı.

Mən Aşığam baxtıkəm,
Taleyi kəm, baxtı kəm.
Mən fələyə neylədim,
Fələk mənə baxdı kəm.

Mən Aşıq, ay nədəndir?
Aynalı ay nədəndir?
İnsan əsli torpaqdan,
Torpaq əsli nədəndir?

Qarşımızda ya dağlar,
Ya dügünlər, ya dağlar.
Aşıq, Yaxşın ölübdür,
Qohum gülər, yad ağlar.
Aşıq Qarabağlıdı.
Xalın qara bağlıdı.
Nə gedən var nə gələn,
Yollar qara bağlıdı.

Mən Aşıq, gözəl ayaz,

Meh əsər, gözəl ayaz,
Əlinə qurban, Aşıq,
Gözəli gözələ yaz.

Aşıq qan ara yerdə,
Qəssab qan ara yerdə.
Öldürdü Yaxşı məni,
Getdi qan ara yerdə.

Aşığam, o yar mənim,
Qəm bağrım oyar mənim.
Məkkəmdi, Mədinəmdi,
Kəbəmdi o yar mənim.

Mən Aşığam, göy bağlar,
Göy otlaqlar, göy bağlar.
Gözəlin qaydasıdır,
Ağ buxağa göy bağlar.

Aşığa yaz, incə gül,
Görübdür yaz incə gül,
Bülbül yüz kitab oxur,
Bir əlif yazınca gül.

vV

**NƏŞ′Ə**

*XVII əsrin ikinci yarısı – XVIII əsrin birinci yarısında yaşayıb-yaratmış Azərbaycan şairi və alimi Əbdürrəzzaq Nəş'ə Təbrizi Saib Təbrizi məktəbinin görkəmli davamçılarındandır. Qaraqoyunlu hökmdarı Cahan şahın nəslindən olan Nəş'ə bir çox elmləri, xüsusilə də riyaziyyatı gözəl mənimsəmişdi. Mənbələr şairin hicri tarixlə 1188-ci ildə (1774-1775) vəfat etdiyini göstərir.*

vV

Degil qəm, gər tənəzzül etmişəm zahirdə rifətdən,
Yerə düşsə hüma gər, övcdən düşməz səadətdən.

Əgər ülfət görə səyyaddən, seyd eyləməz vəhşət,
Könül etməz cüdalıq, gər məhəbbət görsə möhnətdən.

Qılub qəti-nəzər məqsuddən tərki-niyaz etdüm,
Qələt sözdür ki, acizdür təbiət tərki-adətdən.

Könül, miratını qıl cilvəgahi-şahidi-məni,
Gözüm, yüz görmə, yegdür hüsni-məni hüsni-surətdən.

Cəhandə talibi-iksir olan cahil kibi, bən həm
Məşəqqət hasil etdüm aqibət təhsili-rahətdən.

Bənümlə vədei-vəsl eyləmə, etsən, vəfa eylə,
Nə hacət laləgun olsun yüzün daği-xəcalətdən.

Əqiqün, Nəşə, olmaz təşnələb sirab suyından,
Yetüşməz feyz hərgiz kimsəyə ərbabi-dövlətdən.

* * *

Nalə bicadur, gər ehsan görməsə təsirdən,
Mis təla olmaz, gər imdad olmasa iksirdən.

Baisi-hirmanümüz nöqsani-istedaddur,
Didei-əma nə görsün mehri-aləmgirdən?

Könlümi zülfindən ayrı hiç kim etməz xəyal,
Yad edən əhli-cününi yad edər zəncirdən.

Zahir aradən hüsuli-kami-surət bağlamaz,
Görməmişdür kimsə yüz ayinei-təsvirdən.

Xanə bərduş olmağün feyzindən əbruyi-kəman,
Ta göz açmış, görməmiş çini-cəbin təmirdən.

Açmadı əqdi-sürəyyanı sər əngüşti-hilal,
Üqdei-xatir açılmaz naxuni-tədbirdən.

Şəmtək yan, Nəşə, əma sözün izhar eyləmə,
Haləti-pərvanə müstəğni olur təqrirdən.

* * *

Gül etsə qönçəsin peykan, xədəngünlə qərin olmaz
Ki, xarun navəki dilduz olursa, dilnişin olmaz

Səxavətdən dəm urma mövc ilə, ey bəhri-porgövhər,

Ki, hərgiz səfhei-pişaniyi-himmətdə çin olmaz.

Vəfası olmayan məşuqə hərgiz etimad etmə
Ki, gər binası olmaya, möhkəm həsin olmaz.

Zəvali-mehrdəndür sayə aləmgir olur, ey məh,
Könüldən mehr zail olmayınca rəngi-kin olmaz.

Pərişanhalu sərgərdanluğum görsən, inanmazsan,
Sual et kakilindən kim, onuntək şanəbin olmaz.

Suxəngu gözlərindən Nəşəyə olmuş nəzər guya,
Tilismi-göftgudə böylə bir sehrafərin olmaz.

* * *

İzhari-eşq şəm kibi yaxdı canımız,
Yandurdı başımızda əcəb od lisanımız.

Sındurmuşuz sümük səri-kuyində, qəm degil,
Baş əgməsə hümayə əgər istixanımız.

Qan yaşı tökmək ilə mənü əndəlibi-zar,
Axır gül oldı xarü xəsı-aşiyanımız.

Çoxdur bu gün cəhanda səninçün bizim kibi,
Əmma bizim bir özgəyə gəlməz gümanımız.

Tiri-sitəm bilür hədəfün olduğu yeri,

Qəmzən oxuqan, istər isən, al nişanımız.

Yaxdıvü yıxdı könlümüzi əşkı-atəşin,
Bərq oldı seyli-xarü xəsi-aşiyanımız.

Dutdun bənümlə, Nəşə, əlin bir ayağlə,
Saqi, nisar ayağınadür nəqdi-canımız.

* * *

Aşiq yanub dolanmağa təqrib cu gərək,
Şəm olsa bəzm-eşqdə pərvanə xu gərək.
Bülbül cəmalə zinəti-zahir degil kəmal,
Güldən muradi-hüsn isə birəngü bu gərək.

Gəlməz ələ o dürri-giranmayə səysiz,
Bəhr içrə gövhər istəyənə cüstcu gərək.

Ceybin də sübh mehri demişdür sana qərin,
Sadiq isə, müarizəsi rubəru gərək.

Dürri-xoşabtək sədəfi-ruzgardə,
Ziqiymət olmaq istər isən, abru gərək.

Gül fəsli, Nəşə, badəni tərk etmə zöhd üçün,
Bir əldə səbhə olsa, bir əldə səbu gərək.

vV

## MÜNDƏRİCAT